# NAMAZI TƏRK EDƏNİN HÖKMÜ






## ŞÜBHƏLƏRƏ CAVAB

Əbu İbrahim

| | |
|---|---|
| Kitabın adı: | **”Hukmu Tərik əs-Saləh”** |
| Müəllif: | İbn əl-Useymin |
| Tərcüməçi və əlavələr: | Əbu İbrahim |
| Redaktə edən: | Muslim Əbu Zəkəriyya<br>Abdulməcid Əbu Tahir |



# Mündəricat

# Tərcüməçinin müqəddiməsi

Bütün təriflər Alləmlərin Rəbbi olan Allaha məxsusdur. Ona həmd edirik, yalnız ona ibadət edirik və yalnız ondan kömək diləyirik. Sonuncu peyğəmbər Muhammədə, onun ailəsinə və səhabələrinə Allahın xeyir-duası və salamı olsun!

Əziz müsəlmanlar! Sizlərə Şeyx Muhamməd bin Saleh əl-Useyminin, *rahiməhullah*, təlif etdiyi "Namazı tərk edənin hökmü" adlı risaləsini təqdim etmək şərəfinə sahibik. Bu risalə qəti dəlillər və qısa məzmuna malik olduğu üçün çox faydalı bir əsərdir və oxucu kütləsinin ehtiyac duyduğu bir kitabdır. Məmləkətimizdə bu barədə yazılmış əsərlər içində yalnız Şeyx Nəsiruddin əl-Albaninin, *rahiməhullah,* yazdığı kitab məşhurdur. Digər müəlliflər isə fərqli mövzular barədə yazdıqları kitablarında bu məsələyə səthi yanaşaraq geniş məlumat verməmişlər. Nəticədə azərbaycan dilində oxucu kütləsi bir çox elmi əsərlərdən xəbərsiz qalıblar. Onların məsələdə yalnız bir tərəfli düşündüklərini görmək mümkündür və çox təəssüf ki, onlara təqdim olunan elm çərçivəsindən kənara çıxa bilmirlər. Məlumdur ki, məsələ haqqında alimlər arasında ixtilaf mövcuddur. Lakin müsəlmanlar, bu ixtilafda yalnız bir tərəfin dəlillərini bilirlər və namazı tərk edəni kafir görənlərin dəlillərindən və müxaliflərinə verdikləri cavablardan qafildirlər.

Şeyx İbn əl-Useyminin yazdığı bu mübarək risalənin daha da faydalı olması üçün, risalənin ihtiva etdiyi hədislərin məsdərlərini də təqdim etdik və bəzən mövzunun daha da gözəl anlaşılması üçün öz qeydlərimizi də əlavə etmişik.

Bununla belə yazdığımız kitabı yalnız İbn əl-Useyminin risaləsi ilə məhdudlaşdırmadıq. Eləcədə Şeyx əl-Albaninin kitabında gördüyümüz xətalara dair məlumat verməyə çalışdıq və onları elmi əsaslara dayanaraq rədd etdik. Şeyx əl-Albani öz

kitabını əsasən şəfaət hədislərinin üzərində qurmuşdur. Bu səbəbdən kitabımızın üçüncü hissəsini şəfaət hədislərinin təxricinə həsr etdik. Bunun geniş bir çalışma olduğunu və xüsusi diqqətə ehtiyac duyduğunu nəzərə alaraq, fərqli bir bölmə olaraq kitabın sonunda təqdim etdik. Şəfaət hədisləri arasında zəif və ya səhih olanı təsbit etməyə çalışdıq. Bəzi hədislərin sihhəti barədə qəti hökm verməkdən çəkindik, çünki bu barədə gələn hədislərin çoxluğu səbəbi ilə ehtiyat etməyi uyğun gördük.

Kitabımızı tərtib edərkən Əbu əl-Həsən Mustafa bin İsmayıl əs-Suleyməninin bu mövzu barədə yazdığı və "*Səbil ən-Nəcət fi Bəyən Hukmi Tərik əs-Salət*" adını verdiyi əsərindən çox faydalandıq. Bu kitabda hər iki tərəfin dəlillərinə toxunulmuşdur və dəlillərin səhihliyi üçün gözəl bir çalışma ortaya qoyulmuşdur.

Kitabımızın xətalardan uzaq olduğunu iddia etmirik. Qurandan başqa xətadan salamat olan heç bir kitabın olmadığına etiqad edirik. Allahın razılığını arzu edərək hazırladığımız bu kitabda doğru olan hər bir söz Allahdandır, xətalı sözlər isə Allaha möhtac olan qullarının xətalarıdır. Allahı tənzih edirik! O, hər bir nöqsandan pak və uzaqdır!

Kitab barədə tənqidləri və düzəlişləri qəbul etməyə hazırıq! Bütün günahlarımızdan Allaha tövbə edirik. O, möminlərə qarşı şəfqətlidir və tövbələri qəbul edəndir. Tövfiq sahibi olan da Odur!

18 Zul-Qadə, 1428
27 noyabr, 2007
Allahın aciz qulu Əbu İbrahim
**ahlulhadis@yahoo.com**

# Müqəddimə

بِسْمِ اللَّهِ الرَّحْمَـنِ الرَّحِيمِ

الحمد لله نحمده ونستعينه، ونستغفره ونتوب إليه ، ونعوذ بالله من شرور أنفسنا، ومن سيئات أعمالنا ، من يهده الله فلا مضل له ، ومن يضلل فلا هادي له، وأشهد أن لا إله إلا الله وحده لا شريك له ، وأشهد أن محمداً عبده ورسوله صلى الله عليه وعلى آله أصحابه ومن تبعهم بإحسان إلى يوم الدين .

أما بعد : فإن كثيراً من المسلمين اليوم تعاونوا بالصلاة وأضاعوها حتى تركها بعضهم تركاً مطلقاً تهاوناً.
ولما كانت هذه المسألة من المسائل العظيمة الكبرى التي ابتلي بها الناس اليوم ، واختلف فيها علماء الأمة وأئمتها قديماً وحديثاً ، أحببت أن أكتب فيها ما تيسر.
ويتلخص الكلام في فصلين:
* الفصل الأول : في حكم تارك الصلاة .
* الفصل الثاني : فيما يترتب على الردة بترك الصلاة أو غيرها .
نسأل الله تعالى أن نكون فيها موفقين للصواب .

Mərhəmətli və Rəhimli Allahın adı ilə!

Həmd olsun Allaha! Ona həmd edirik və Ondan kömək diləyirik. Ondan istiğfar diləyir və Ona yönələrək tövbə edirik. Nəfslərimizin şərrindən və pis əməllərimizdən Allaha sığınırıq! Allah kimi doğru yola yönəldərsə, onu o yoldan heç kəs azdıra bilməz və kimi azdırarsa, heç kəs onu doğru yola yönəldə bilməz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur! Təkdir və şəriki yoxdur! Şahidlik edirəm ki, Muhamməd Onun qulu və Elçisidir. Allahın xeyir duası və salamı onun, onun ailəsinin və səhabələrinin və Qiyamət gününə qədər onlara bu yolda tabe olanların üzərinə olsun!

Əmmə bad:

Həqiqətən bu gün çox müsəlman namazlarına diqqət

yetirmir, onları ötürür və bəziləri isə məhəl qoymadan tamamilə tərk edirlər.

Buna görə də bu məsələ ən böyük və əzəmətli məsələlərdən biridir və bununla bu gün insanlar sınağa çəkilirlər, ümmətin həm əvvəlki, həm də sonrakı alimləri bunda ixtilaf etmişlər. Buna görə də asanlıq gətirmək üçün bu məsələ haqqında yazmağı xoş gördüm.

Bu barədə sözümüzü iki fəsil içində topladıq:

Birinci fəsil: Namazı tərk edənin hökmü.

İkinci fəsil: Namazın tərkinə görə və yaxud da başqa səbəbə görə mürtəd olmanın aqibəti

Allahu Təalədən bizi bu məsələdə doğruya yönəltməsini diləyirik!

## Birinci Fəsil

# Namazı tərk edənin hökmü

Bu məsələ böyük elmi məsələlərdəndir. Elm əhlindən olan sələf və xələf bu məsələdə ixtilaf etmişdir. İmam Əhməd ibn Hənbəl demişdir: “**Namazı tərk etmək millətdən çıxaran küfr ilə kafirdir, əgər tövbə edib namazını qılmazsa öldürülər.**”[1]

Əbu Hənifə, Malik və Şafi dedilər: “**Fasiqdir, təkfir olunmaz**.”

Daha sonra isə ixtilaf etdilər və Malik ilə Şafi dedilər: “**Hədd olaraq öldürülər**”, lakin İmam Əbu Hənifə dedi: “**Namaza təhrik edilər, lakin öldürülməz.**”

Bu məsələ, ixtilaflı məsələlərdən olduğu üçün, bunu Allahu Təalənin Kitabına və Rasulunun, *salləllahu aleyhi va sələm*, Sünnətinə götürmək lazımdır. Beləki, Allahu Təalə buyurur:

﴾ وَمَا اخْتَلَفْتُمْ فِيهِ مِنْ شَيْءٍ فَحُكْمُهُ إِلَى اللَّه ﴿

**﴾ İxtilafa düşdüyünüz şeylər barəsində hökm vermək ancaq Allaha aiddir. ﴿**

(əs-Şura, 10)

﴾فَإِنْ تَنَازَعْتُمْ فِي شَيْءٍ فَرُدُّوهُ إِلَى اللَّهِ وَالرَّسُولِ
إِنْ كُنْتُمْ تُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ ذَلِكَ خَيْرٌ وَأَحْسَنُ تَأْوِيلاً﴿

**﴾ Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa,**

[1] Bax: ”**Şərh əl-Mumti alə Zad əl-Mustaqni**”, 2/26

**Allaha və Onun Elçisinə müraciət edin.**
**Bu, sizin üçün daha xeyirli və nəticə etibarilə daha yaxşidır.** ﴿
(ən-Nisa, 59)

Çünki ixtilaf edənlərdən heç birinin sözü digərinin sözü üzərində hüccət sayılmaz. Beləki onlardan hər biri özünün doğru olduğunu düşünür. Onlardan birinin sözünün məqbul sayılmasında digərindən üstünlüyü yoxdur. Onların arasında hökm vermək üçün Allahu Təalənin Kitabına və Peyğəmbərinin, *salləllahu aleyhi va səlləm,* Sünnətinə müraciət etmək lazımdır.

Əgər bu ixtilafı Kitab və Sünnətə götürsək, görərik ki, Kitab və Sünnət tamamilə namazı tərk edənin küfrünə, yəni millətdən çıxaran böyük küfrünə dəlalət edir.

## Birinci

# Allahın Kitabı

﴿ فَإِنْ تَابُوا وَأَقَامُوا الصَّلاةَ وَآتَوُا الزَّكَاةَ فَإِخْوَانُكُمْ فِي الدِّينِ﴾

**﴿ Əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onlar sizin din qardaşlarınızdır. ﴾**
(ət-Tövbə, 11)

və Məryəm surəsində deyir:

﴿فَخَلَفَ مِنْ بَعْدِهِمْ خَلْفٌ أَضَاعُوا الصَّلاةَ وَاتَّبَعُوا الشَّهَوَاتِ
فَسَوْفَ يَلْقَوْنَ غَيّاً
إِلاَّ مَنْ تَابَ وَآمَنَ وَعَمِلَ صَالِحاً فَأُولَئِكَ يَدْخُلُونَ الْجَنَّةَ وَلا يُظْلَمُونَ شَيْئاً ﴾

**﴿ Onların arxasınca namazı buraxıb şəhvətə uyan bir nəsil gəldi.
Onlar ziyana uğrayacaqlar.
Ancaq Allaha tövbə edib iman gətirənlər və xeyirxahlıq edənlərdən başqa!
Onlar Cənnətə daxil olacaq və heç bir haqsızlığa məruz qalmayacaqlar. ﴾**
(Məryəm, 59-60)

İkinci ayədəki, yəni Məryəm surəsindəki ayədə bizim üçün dəlil budur ki, Allahu Təalə namazlarını tərk edənlər və şəhvətlərinə tabe olanlar haqqında deyir: **”Ancaq Allaha tövbə edib iman gətirənlər”** və bu, dəlalət edir ki, onlar namazlarını tərk edib şəhvətlərinə tabe olduqları zaman mömin deyildirlər.

Birinci ayədən isə çıxarilan dəlil isə budur ki, Allahu Təalə bizlər ilə müşriklər arasında qardaşlığın kəsinləsməsi üçün üç dənə şərt qoymuşdur:

- **Şirkdən tövbə etsinlər**

- **Namaz qılsınlar**

- **Zəkat versinlər**

Əgər şirkdən tövbə etsələr və namaz qılmasalar və zəkat verməsələr bizim qardaşlarımız deyildirlər.

Əgər namaz qılıb zəkat verməsələr, yenə qardaşlarımız olmazlar.

Dindəki qardaşlıq isə yalnız dindən tamamilə çıxdıqda pozular, fisq və ya kiçik küfr ilə pozulmaz.

Məgər qətl halında qisas barəsindəki ayəni görmürsənmi?!

﴿ فَمَنْ عُفِيَ لَهُ مِنْ أَخِيهِ شَيْءٌ فَاتِّبَاعٌ بِالْمَعْرُوفِ وَأَدَاءٌ إِلَيْهِ بِإِحْسَانٍ﴾

**﴿ Əgər qatil qardaşi tərəfindən bir şeylə əfv edilsə,**
**onda insafla davranmalı və**
**qanbahasına ona müvafiq qaydada ödənilməlidir.﴾**
(əl-Bəqara, 178)

Allahu Təalə bu ayədə qəsdən qətl edən qatili qətl edilənin qardaşı saymışdır, lakin bununla bərabər qəsdən qətl etmək böyük günahların ən böyüklərindəndir. Çünki Allahu Təalə buyurur:

﴿وَمَنْ يَقْتُلْ مُؤْمِناً مُتَعَمِّداً فَجَزَاؤُهُ جَهَنَّمُ خَالِداً فِيهَا
وَغَضِبَ اللَّهُ عَلَيْهِ وَلَعَنَهُ وَأَعَدَّ لَهُ عَذَاباً عَظِيماً﴾

**﴿ Hər kəs qəsdən bir mömini öldürərsə, onun cəzası**
**içərisində qalacağı Cəhənnəmdir.**
**Allah ona qəzəblənər, onu lənətləyər və onun üçün böyük bir**
**əzab hazırlayar.﴾**

(ən-Nisa, 93)

Daha sonra Allahın bir-biri ilə vuruşan iki mömin tayfa barədə dediyi sözə nəzər yetir:

﴿ وَإِنْ طَائِفَتَانِ مِنَ الْمُؤْمِنِينَ اقْتَتَلُوا فَأَصْلِحُوا بَيْنَهُمَا﴾

﴿ **Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşarsa, onları barışdırın!...**﴾

bu sözünə qədər

﴿ إِنَّمَا الْمُؤْمِنُونَ إِخْوَةٌ فَأَصْلِحُوا بَيْنَ أَخَوَيْكُم﴾

﴿ **Möminlər həqiqətən də qardaşdırlar. Elə isə qardaşlarınızı barışdırın!...**﴾
(əl-Hucurat, 9-10)

Allahu Təalə bu ayədə barışmaq istəyən dəstə ilə vuruşmaq istəyən tayfa arasında qardaşlığın olduğunu göstərmişdir, lakin bununla bərabər mömini qətl etmək küfrdür. Beləki Buxari və digərlərinin İbn Məsuddan, *radiyallahu anhu*, rəvayət etdikləri səhih bir hədisdə peyğəmbər, *salləllahu aleyhi va səlləm,* buyurmuşdur:

"سباب المسلم فسوق ، وقتاله كفر"

**"Müsəlmanı söymək fisqdir, öldürmək isə küfrdür."**[2]

[2] Buxari, "Kitəb əl-İman"da (1-ci cild/ hədis: 48) Vaildən rəvayət etmişdir, Muslim, (1/16/ hədis: 64) İbn Məsuddan rəvayət etmişdir. İbn Macə bu hədisləri "Kitəb əl-Fitən" də zikr etmişdir.

Lakin burdakı küfr millətdən çıxaran küfr deyildir. Əgər millətdən çıxaran küfr olsaydı, bununla bərabər iman qardaşlığı qalmazdı. Halbuki bu mübarək ayə qatil ilə qətl edilənin arasında iman qardaşlığının qaldığına dəlalət edir.

Eləcədə buradan öyrənmiş oluruq ki, namazı tərk etmək millətdən çıxaran küfrdür, əgər fisq və yaxud kiçik küfr olsaydı, qatil ilə qətl edilənin arasında din qardaşlığının pozulmadığı kimi, bununla da din qardaşlığı pozulmazdı.

Əgər belə bir sual versələr:
- "Zəkatı verməyənin də küfrünə hökm verirsinizmi? Axı tövbə surəsinin onların da küfrünə dəlalət etdiyi anlaşilır!"

Bunun cavabı belədir: "Zəkatı verməyənin təkfir olunmasına gəldikdə isə, elm əhlindən bəziləri buna hökm vermişdir və bu, İmam Əhməddən, *rahiməhullah Təalə*, gələn iki rəydən biridir.

Lakin bizə görə doğru olan rəy budur ki, buna görə kafir olmaz. Lakin böyük bir cəza ilə cəzalandırılacaqdır. Bunu Allahu Təala Kitabında və peyğəmbər, *salləllahu aleyhi va səlləm*, sünnətində zikr etmişdir. Bunlardan biri Əbu Hureyrədən, *radiyallahu anhu*, gələn hədisdədir və peyğəmbər, *salləllahu aleyhi va səlləm*, bu hədisdə zəkatı ödəməməkdə israr edənin aqibətini zikr etmişdir və daha sonra isə hədisin sonunda onun üçün çıxış yolu olduğunu da qeyd edərək deyir: **"ya Cənnətə, ya da atəşə girəcəkdir"** [3] İmam Muslim bu hədisi tam şəkildə "*Zəkat verməməkdə israr edənin günahı*" adlı babda zikr etmişdir. Bu dəlildir ki, o, kafir olmaz, əgər kafir olsaydı, o zaman onun üçün çıxış yolu olmazdı.

Beləliklə hədisdəki "məntuq" [4] tövbə surəsindəki ayədə

---

[3] Muslim, 2/470, (2161)

[4] məntuq, fiqh usulunda şəri əhkamların çıxarıldığı nəsslərə verilən adlardan biridir. Məntuq "nətaqa", yəni "söyləmək" (nitq) sözündən əmələ gəlir. Məntuq söylənilən sözdən çixan bir-başa mənadır.

olan “məfhum“dan əvvəl gəlir, çünki fiqh usulundan məlum olduğu kimi, məntuq məfhumdan daha üstündür.

---

Məsələn: Allahu Təalə deyir: **”Sizlərdən ayı görən şəxslər həmin ayı oruc tutmalıdırlar”** (əl-Bəqərə, 185) Bu sözlərin ilk mənası aydındır. Lakin, məfhum nasslarda isə hökm ümumi mətnin işarə etdiyi mənadan çıxarılır. Məs: Allahu Təalə deyir: **”Əgər onların biri və ya hər ikisi sənin yanında qocalıq yaşina dolarsa, onlara: "Uf!" belə demə…”** (əl-İsra, 23) və bu ayənin ümumi mənasından çıxarılan hökm məfhum sayılır. Bu ayədəki məntuq budur ki, ”uf” demək olmaz. Lakin bununla birlikdə anlaşılır ki, valideynə qarşi hörmətsizlik etmək, onlara əziyyət vermək qadağan olunmuşdur.

## İkinci

# Sünnət

1. Peyğəmbər, *salləllahu aleyhi va salləm,* demişdir:

"إن بين الرجل وبين الشرك والكفر ترك الصلاة "

**"İnsan ilə şirk və küfr arasında namazı tərk etmək vardır."**

Bunu Muslim "İman" kitabında Cabir ibn Abdullahdan, o da peyğəmbərdən, *salləllahu aleyhi va salləm*, rəvayət etmişdir.[5]

2. Bureydə ibn əl-Huseyb, *radiyallahu anhu*, deyir: Peyğəmbəri, *salləllahu aleyhi va salləm*, belə deyərkən eşitdim:

"العهد الذي بيننا وبينهم الصلاة ، فمن تركها فقد كفر"

---

[5] Hədis bu ləfz ilə Muslimdə, *"Bəyan əl-İtlaq İsm əl-Kufr alə mən tarakə Salə"* (82), " babında gəlmişdir. Digər ləfzlər üçün bax: Tirmizi, "əs-Sünən", *"Mə cəə fi tərk əs-Salə"* babı (2621), Əbu Davud, "**əs-Sünən**" (4-cü cild/ hədis: 4678), İbn Macə, (1-ci cild/ hədis: 1078), Darimi (1-ci cild/1233), Əhməd, "**Müsnəd**" (3/370) Əbu Yalə (1953, 2102), Əbu Avanə (1/20), əl-Acurri, "**əş-Şəriah**" (247-250); İbn Əbi Şeybə (11/33); "**Şərhus-Sunnə**" (2/179); Əbu Nuaym, "**əl-Hilyə**" (8/256); Tabari (1/307); Xatib, "**ət-Tarix**" (10/180); Tabarani, "**Mucəm əs-Sağir**" (258); İbn Hibban (1451); "**əl-Mişkat**", (569); Abdurrazzaq (5009); Daraqutni (2/53); Beyhaqi (3/366), Beyhaqi, "**Sunən əs-Sağir**" (600); "**ət-Tərğib**" (1/520); "**Camiul-Fəvaid**" (983-85); Tahavi, "**Muşkilul-Əsər**" (3175); İbn Abdilbərr, "**ət-Təmhid**" (4/299); Neysəburi, "**əl-İqna**" (235)

**“Bizimlə onlar arasındakı əhd namazdır, kim namazı tərk edərsə küfr etmişdir.”** [6]

Bunu Əhməd, Əbu Davud, Tirmizi, Nəsai və İbn Macə rəvayət etmişdir.

Bu hədislərdə qəsd olunan insanı dindən çıxaran küfrdür. Çünki peyğəmbər, *salləllahu aleyhi va salləm*, namazı möminlər ilə kafirlərin arasını ayıran bir hədd saymışdır və məlumdur ki, küfr milləti İslam milləti deyildir. Kim bu əhdi ödəməzsə o, kafirlərdəndir.

3. Muslimin “Səhih” əsərində gəldiyi kimi Umm Sələmədən, *radiyallahu anhə*, rəvayət olunur ki, peyğəmbər, *salləllahu aleyhi va salləm,* demişdir:

"ستكون أمراء ، فتعرفون وتنكرون ، فمن عرف برئ ، ومن أنكر سلم ، ولكن من رضي وتابع . قالوا : "أفلا نقاتلهم ؟ قال : "لا ما صلوا"

**“Sizin başınıza bir sıra əmirlər gələcəkdir və siz onları tanıyacaq və onları inkar edəcəksiniz. Kim etiraz edərsə bəraət etmişdir və kim inkar etmişdirsə, qurtulmuşdur. Lakin kim razı olar və tabe olarsa ...” Səhabələr soruşdular: “Onlarla vuruşmayaq?” (Peyğəmbər) dedi: “Namaz qıldıqları müddətdə olmaz.”** [7]

---

[6] İbn Macə rəvayət etmişdir, ”Kitəb İqamət əs-Salə” və ”mə cəə fi mən tərakə əs-salə” babı, Tirmizi, ”əl-İmən”, (5-ci cild/ hədis: 2621), Əhməd (5/346), ən-Nəsai (1/231), İbn Əbi Şeybə, ”**əl-İman**” (səh: 26/ hədis: 46 və Şeyx Albanin təhqiqində hədisi səhih saymışdır), İbn Hibban (3-cü cild/ hədis: 1452), eləcədə əl-Hakim, ”**əl-Mustədrək**” (1/7) əsərində hədisin səhih olduğunu dedi və İmam Zəhəbi onunla razılaşdı. Bax: Şeyx Nasiruddin əl-Albani, ”**Sahih əl-Cami**” (4143).

[7] Muslim, ”Kitəb əl-İməra”, (3/63, s. 1481), Tirmizi, ”Fitən” (4-cü cild,

4. Yenə Muslimin “Səhih” əsərində Auf bin Malikin, *radiyallahu anhu*, hədisində peyğəmbər, *salləllahu aleyhi va səlləm,* demişdir:

"خيار أئمتكم الذين تحبونهم ويحبونكم ، ويصلون عليكم وتصلون عليهم ، وشرار أئمتكم الذين تبغضونهم ويبغضونكم ، وتلعنونهم ويلعنونكم". قيل : يا رسول الله ، أفلا ننابذهم بالسيف ؟ قال : "لا ما أقاموا فيكم الصلاة"

**“Sizin ən xeyirli imamlarınız sizi sevən və sizin də onları sevdiyiniz və sizə dua edən və sizin də onlara dua etdiyiniz imamlardır. Lakin sizin ən şərli imamlarınız isə sizə nifrət edən və sizin də onlara nifrət etdiyiniz, sizi lənətləyən və sizin də onları lənətlədiyiniz imamlardır.” Səhabələr soruşdular: “Onlara qarşı qılınc qaldırmayaq?” (Peyğəmbər) dedi: “Sizin aranızda namaz qıldıqları müddətdə olmaz.”**[8]

Bu sonuncu iki hədisdə namaz qılmadıqlarına görə əmirlərə qarşı çıxmaq və onlara qarşı qılıncla vuruşmaq barədə dəlil vardır. (Biz bilirik ki,) əmirlər ilə çəkismək və onlara qarşı vuruşmaq, yalnız Allahu Təalədən əlimizdə onların aşkar küfrünə dair bir dəlil olduğu halda caizdir. Çünki Ubadə bin əs-Samit, *radiyallahu anhu,* demişdir:

"دعانا رسول الله صلى الله عليه وسلم فبايعناه ، فكان فيما أخذ علينا ، أن بايعنا على السمع والطاعة ، في منشطنا ومكرهنا ، وعسرنا ويسرنا ، وأثرةٍ علينا ، وألا ننازع الأمر أهله ". قال : " إلا أن تروا كفراً بواحاً عندكم من الله فيه برهان"

**“Allahın Elçisi, *salləllahu aleyhi va səlləm,* bizi (İslama) dəvət etdi və biz ona beyət etdik. Bizdən aldığı sözlər içində həm**

---

hədis: 2265), Əbu Davud (4-cü cild, hədis: 4760), Əhməd, ”**Müsnəd**” (6/295-302)

[8] Muslim, ”Kitəb əl-İməra”, (1855)

**həvəsli hallarımızda, həm də xoşa gəlməyən hallarda, həm çətinlikdə, həm də asanlıqda eşidib itaət etmək üzrə beyət etmək də var idi. Bizə qarşı laqeydlik edərsə, əmir sahiblərinə qarşı çıxmayacagımıza dair söz verdik. " (Peyğəmbər) dedi: "Aşkar bir küfrünə dair əlinizdə Allahdan dəlil olması müstəsnadır."** [9] (Muttəfiqun aleyh)

Buna əsasən peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, əmirlərə qarşı çıxmağı və onlara qarşı qılınc ilə vuruşmağı namazın tərki ilə əlaqələndirməsi, yəni namazın tərki ilə şərt qoyması, bu əməlin, haqqında əlimizdə Allahdan dəlil olan aşkar bir küfr olmasını göstərir.

Kitab və Sünnətdə namazı tərk edənin kafir olmayacağını və yaxud mömin olacağını söyləyən dəlil yoxdur. Tövhidin və "*lə iləhə illəllah va Muhamməddən Rasulullah*" şəhadətinin üstünlüyü barədə gələn nasların mənası doğrudur. Lakin burada ya həmin dəlilin özündə namazın tərkini imkansız qılan şərt mövcuddur, ya bu dəlillər insanın namazı tərk etməsində üzrlü olduğunu göstərən müəyyən hallar haqqında varid olmuşdur, ya da bu dəlillər ümumidir və bu ümumi dəlillər namazı tərk edənin küfrünü isbat edən dəlillərlə izah olunur. Çünki namazı tərk edənin küfrünü isbat edən dəlillər xüsusidir və xüsusi dəlillər ümumi dəlillərdən əvvəldir.

Əgər soruşsalar ki, "bəs namazın tərkinin küfr olduğunu sübut edən dəlilləri namazın vacibliyini inkar edənlərə aid etmək caizdirmi?"

Buna cavabımız belədir: Bu caiz deyilir, çünki burda iki təhlükəli nəticə vardır:

- **Birinci: Allahın verdiyi vəsfi və ona bağladığı hökmü ləğv etmək.**

[9] Buxari (7056), Muslim (1709)

Çünki Allah küfr hökmünü namazı tərk etmək ilə əlaqələndirmişdir, namazı inkar etməyə bağlamamışdır.

Dində qardaşlıq əlaqəsi sadəcə namazı təsdiq etmək deyil, bir əməl olaraq namazı qılmağın üzərində qurulmuşdur. Allahu Təalə *“Əgər tövbə etsələr, namazın vacibliyini qəbul etsələr…”* demir. Nədə peyğəmbər, *salləllahu aleyhi va səlləm*, *”insan ilə şirk və küfr arasında namazın vacibliyini inkar etmək vardır”* və ya *”bizimlə onlar arasındakı əhd namazın vacibliyini qəbul etməkdir, kim vacibliyini inkar edərsə küfr etmişdir.”* demir.

Əgər Allahu Təalənin və Onun Elçisinin qəsd etdiyi məna budursa, bunu açıq şəkildə qeyd etməməkləri Qurani Kərimdə söylənənlərə müxalif olardı. Allahu Təalə deyir:

﴿ وَنَزَّلْنَا عَلَيْكَ الْكِتَابَ تِبْيَاناً لِكُلِّ شَيْءٍ﴾

﴿ **Biz Kitabı sənə hər şey üçün bir izah olaraq nazil etdik.**﴾
(ən-Nəhl, 89)

Allahu Təalə peyğəmbərinə müraciət edərək deyir:

﴿ وَأَنْزَلْنَا إِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاس مَا نُزِّلَ إِلَيْهِم﴾

﴿ **Sənə də Zikri nazil etdik ki, insanlara, onlara nazil olanı izah edəsən** ﴾
(ən-Nəhl, 44)

- **İkinci: Hökmün səbəbini, Allahın səbəb saymadığı vəsfə dayandırmaq.**

Çünki cəhalət üzrü olmayan biri bu beş namazın

vacibliyini inkar edərsə, namazlarını qılsa da, qılmasa da kafirdir. Əgər bir şəxs namazlarının beşini də qılırsa və bu namazların bütün şərtlərinə, rükunlarına, vaciblərinə və müstəhəblərinə əməl edirsə və lakin heç bir üzrü olmadan vacibliyini inkar edirsə, namazı tərk etməsə də kafir olur.

Bununla aydın olur ki, dəlilləri namazın vacibliyini inkar edərək tərk edənlərə şamil etmək doğru deyildir. Haqq olan budur ki, namazı tərk edən dindən çıxmış bir kafirdir. Beləki bu, İbn Əbi Hatimin "Sünən" əsərində Ubadə bin əs-Samitin, *radiyallahu anhu*, hədisində açıq-aydın şəkildə bildirilmişdir. Ubadə deyir:

أوصانا رسول الله صلى الله عليه وسلم : "لا تشركوا بالله شيئاً ، ولا تتركوا الصلاة عمداً ، فمن تركها عمداً متعمداً فقد خرج من الملة ".

**"Allahın Elçisi, *salləllahu aleyhi va səlləm*, bizə öyüd-nəsihət etdi: "Allaha heç bir şeyi şərik qoşmayın! Qəsdən namazlarınızı tərk etməyin! Kim qəsdən və bilərək namazlarını tərk edərsə millətdən (dindən) çıxmısdır."**[10]

---

[10] əl-Həkim, "**əl-Mustədrak**" (4/44), Muhamməd bin Nasr, "**Kitəb əs-Salət**" (920) və Tabərani, "**Usul əs-Sunnə**" (1523), əl-Munziri, "**ət-Tərğib vat-Tərhib**" (1/379) əsərində rəvayət etmişdir. İmam əl-Munziri, *rahiməhullah*, deyir:

رواه الطبراني، ومحمد بن نصر في كتاب الصلاة بإسنادين لا بأس بهما.

**"Bunu Tabarani və Muhamməd ibn Nasr "Kitəb əs-Salət" əsərində heç bir eybi olmayan iki sənəd ilə rəvayət etmişdir."**

(Sahih ət-Tərğib, 573)

İmam əl-Heysəmi isə deyir:

رواه الطبراني وفيه سلمة بن شريح قال الذهبي: لا يعرف،وبقية رجاله رجال الصحيح

**"Bunu Tabərani rəvayət etmişdir və sənədində Sələmə bin Şureyh vardır. Zəhəbi dedi: "Mən onu tanımıram və qalan ravilər isə "əs-Səhih"in raviləridir. "**

("Mucmə əz-Zəvaid" 4/216)

Eləcədə əgər biz bunu namazı inkar edərək tərk edənə şamil etsək, o zaman dəlillər içində namazın xüsusi olaraq qeyd edilməsində heç bir fayda qalmayacaq. Çünki bu hökm (vacibliyini inkar edənlər haqqındakı hökm) ümumidir. Həm zəkatda, həm orucda və həm də həccdə bu hökm eynidir və kim bunlardan birinin vacibliyini inkar edərək tərk edərsə, cahillik üzrü olmadığı halda kafir olmuşdur.

Nəql edilmiş dəlillərin namazı tərk edənin kafir olmasını tələb etdiyi kimi, ağıl və sağlam düşüncə də bunu tələb edir. Hər bir şüurlu mömini namazlarını qılmağa və namazlarına can atmağa çağıran bu qədər təşviq edici dəlillər olduğu halda, dinin sütunu olan namazını tərk edən şəxsdə axı necə iman ola bilər? Əqil sahibi möminləri namazlarını tərk etməkdən və namazsız qalmaqdan çəkindirən bu qədər təhdid edici dəlillər gəldiyi halda, namazını tərk edən şəxsin axi necə imanı ola bilər? Bu qədər açıq-aydın dəlillər olduğu halda namazını tərk edəndə imanın qalması mümkün deyildir.

Əgər soruşsalar ki, "məgər namazı tərk edənin küfrünü millətdən çıxaran küfr deyil, nemətə olan küfr kimi (kufr bil-nimə) təvil etmək olmazmı? Və yaxud da ordakı məqsədin böyük küfrdən aşağı olan kiçik küfr olduğunu söyləmək olmazmı?"

Beləki peyğəmbər, *salləllahu aleyhi va səlləm*, deyir:

"اثنتان بالناس هما بهم كفر: الطعن في النسب ، والنياحة على الميت"

**"İnsanlarda iki hal küfrdür: insanların nəsəbinə tən etmək və ölü üzərində nalə etmək."**[11]

---

Bununla belə hədisin hökmü səhihdir. Çünki İbn Macənin Əbu əd-Darda'dan rəvayət etdiyi hədis (2/4034) bu hədisi gücləndirir. Bax: Nasiruddin əl-Albani, "**Sahih əl-Cami**" (7339)

[11] Muslim, "Kitəb əl-İmən"də "*İtlaq ismi əl-kufr alə tan fin-nəsəb*"babında

və peyğəmbər yenə deyir:

"سباب المسلم فسوق ، وقتاله كفر"

**“Müsəlmanı söymək fisq, onunla vuruşmaq isə küfrdür.”**

Buna cavabımız bu cür olar: Belə bir ehtimal və müşahidə bir çox səbəbdən səhih deyildir:

**Birinci:** Peyğəmbər, *salləllahu aleyhi va səlləm*, namazı küfr və iman arasında və möminlər ilə kafirlər arasında ayırıcı bir hədd saymışdır. Hədd isə həmişə məhdudu[12] başqalarından ayırır və başqalarından kənarda saxlayır. İki fərqli məhdud şeylər bir-birinə müdaxilə etməz.

**İkinci:** Namaz İslamın sütunlarından biridir. Onu tərk edənin küfr ilə vəsf olunması bunun dindən çıxaran küfr olmasını tələb edir…Çünki küfr əməllərindən hər hansı bir küfrü işləyənə küfr sözünün ümumi şəkildə aid edilməsindən fərqli olaraq bu, İslamın sütunlarından birini yıxmaqdır.

**Üçüncü:** Namazı tərk edənin küfrünün insanı millətdən çıxaran küfr olmasına daha başqa naslar da dəlalət edir və dəlillərin bir-birinə zidd olmaması üçün və onların bir-birinə uyğun gəlməsi üçün küfr sözünü dəlalət etdiyi mənasına görə təvil etmək lazımdır.

**Dördüncü:** Küfr sözləri müxtəlif naslarda bir-birindən fərqli olaraq gəlmişdir. Namazı tərk edən haqqında isə deyilir:

---

(1-ci cild/121/ hədis: 67) Əbu Hureyradan rəvayət etmişdir.

[12] Hədd, sərhəd qoyan, ayıran, fərqləndirən hər hansı bir şeyə deyilir. Lakin məhdud ayrılan, sərhəd içinə alınan və hədd ilə seçilən hər bir şeyə deyilir.

"***beynə ər-racul va beynə *<u>*ə*</u>***l*****-*****şirk və ə*****l*****-kufr****"* (kişi ilə küfr və şirk arasında). Burdakı ibarə ərəb dilindəki "**əl**" müəyyən artikli ilə işlənmişdir və bu, küfrün həqiqətinə (yəni, böyük küfrə) dəlalət edir. Bu isə müəyyənlik artikli olmadan işlənən "küfr" sözünün əksidir və ya feli formanın əksidir, çünki bu feli forma dəlalət edir ki, bu küfrdən bir hissədir və ya o, bu əməli ilə küfr etmişdir, millətdən çıxaran mütləq küfr deyildir.

Şeyxul-İslam İbnu Teymiyyə "*İqtida əs-Sirat əl-Mustəqim*" kitabında səh: 70-də (əs-Sunna əl-Muhamməddiyyə çapı) peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, "**insanlarda olan iki xüsusiyyət küfrdür**" sözü haqqında deyir:

"فقوله : "هما بهم كفر" أي هاتان الخصلتان هما كفر قائم بالناس ، فنفس الخصلتين كفر حيث كانتا من أعمال الكفر، وهما قائمتان بالناس ، لكن ليس كل من قام به شعبة من شعب الكفر يصير بها كافراً الكفر المطلق ، حتى تقوم به حقيقة الكفر. كما أنه ليس كل من قام به شعبة من شعب الإيمان يصير بها مؤمناً حتى يقوم به أصل الإيمان وحقيقته . وفرق بين الكفر المعرف باللام كما في قوله صلى الله عليه وسلم : "ليس بين العبد وبين الكفر أو الشرك إلا ترك الصلاة" وبين كفر منكر في الإثبات

**"Bu ikisi küfrdür" kəliməsi o deməkdir ki, bu iki xislət küfrdür, insanların arasında olan küfr əməllərdəndir. Lakin küfrün şöbələrindən bir şöbəyə sahib olan hər kəs, qəlbində küfrün həqiqəti olmadığı müddət ərzində, buna görə mütləq bir küfr ilə kafir olmur. Eləcədə qəlbində imanın əsli və həqiqəti olmadığı müddət ərzində, imanın şöbələrindən bir şöbəyə sahib olan hər kəs mömin sayılmaz. Beləliklə "əlif-ləm" ilə gələn küfr ilə, məsələn peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, "Qul ilə küfr və şirk arasında namazın tərkindən başqa heç bir şey yoxdur" hədisindəki "əlif-ləm" ilə gəlmiş küfr ilə sadəcə "əlif-ləm"siz gələn təsdiqləyici "küfr" sözü arasında fərq vardır."**

Bütün bu dəlillərin tələbinə əsasən üzr olmadan namazı

tərk edənin dindən çıxan küfr ilə kafir olacağı aydın olduqdan sonra İmam Əhməd bin Hənbəlin qəbul etdiyi rəyin doğruluğu ortaya çıxır. Bu eləcədə Şafidən nəql olunan iki rəydən biridir. Bunu İbn Kəsir, Allahu Təalənin “**Onların arxasınca namazı buraxıb şəhvətə uyan bir nəsil gəldi**”[13] sözünü təfsir edərkən zikr etmişdir. Eləcədə İbnul-Qayyim “*Kitəb əs-Salət*” əsərində bunun Şafi məzhəbində iki rəydən biri olduğunu və Tahavinin bunu Şafinin özündən nəql etdiyini zikr etmişdir.

Səhabələrin əksəriyyəti bu rəyi mənimsəmişdir, hətta bir çox alim səhabənin bunun üzərində icma etdiyini rəvayət etmişdir.

Abdullah bin Şaqiq deyir:

"كان أصحاب النبي صلى الله عليه وسلم لا يرون شيئاً من الأعمال تركه كفر غير الصلاة"

**“Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, səhabələri namazdan başqa heç bir əməlin tərkini küfr saymazdılar.”**[14]

Hədisi Tirmizi və əl-Hakim rəvayət etmişdir. Əl-Hakim

---

[13] Məryəm, 59

[14] Tirmizi (2622) və əl-Hakim (1/48/12) rəvayət etmişdir. əl-Hakim hədisin şeyxeynin şərtinə görə səhih olduğunu demişdir. Şeyx Nasiruddin əl-Albani, “**Səhih ət-Tərğib**” (562) və “**Mişkət əl-Məsabih**” (562).

Şeyx Mubarəkfuri, *rahiməhullah*, deyir:

قول عبد الله بن شقيق هذا، بظاهره يدل على أنّ أصحاب رسول الله كانوا يعتقدون أن ترك الصلاة كفر. والظاهر من الصيغة، أن هذه المقالة اجتمع عليها الصحابة، لأن قوله: "كان أصحاب رسول الله" جمع مضاف،...

**"Abdullah bin Şəqiqin bu sözü zahirən dəlildir ki, Allahın Elçisinin səhabələri namazın tərkini küfr saymışlar. Bu sözün məzmunundan, üslubundan aydın olur. Bu sözün üzərində səhabələr icma ediblər, çünki onun "Rasulullahın səhabələri" sözü izafi cəm formasıdır..."** (”Tuhfətul-Əhvazi”, 7/370)

hədisin Buxari və Muslimin şərtinə görə səhih olduğunu söyləmişdir.

Məşhur imam İshaq bin Rahaveyh dedi:

"صح عن النبي صلى الله عليه وسلم أن تارك الصلاة كافر، وكذلك كان رأي أهل العلم من لدن النبي صلى الله عليه وسلم إلى يومنا هذا ، أن تارك الصلاة عمداً من غير عذر حتى يخرج وقتها كافر"

**“Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, namazı tərk edəni kafir sayması səhihdir və bu, peyğəmbərin, *salləllahu aleyhi və səlləm*, zamanından bizim zamanımıza qədər elm əhlinin rəyidir ki, bir namazını üzr olmadan vaxtı çıxana qədər qəsdən tərk edən kafirdir.”**[15]

İbn Həzm bu rəyin Ömərdən, Abdurrahmən bin Aufdan, Muaz ibn Cəbəldən, Əbu Hureyradan və başqalarından gəldiyini zikr edərək deyir:

"ولا نعلم لهؤلاء مخالفاً من الصحابة"

**“Səhabələrdən bunlara (bu rəyə) müxalif olan heç bir şey bilmirik”**[16]

---

[15] Bunu İshaq bin Rahaveyhdən Muhamməd bin Nasr əl-Mərvazi nəql edir. O, deyir:

سمعت إسحاق بن راهويه يقول: قد صح عن رسول الله صلى الله عليه وسلم أن تارك الصلاة كافر، وكذلك كان رأي أهل العلم من لدن النبي صلى الله عليه وسلم إلى يومنا هذا، أن تارك الصلاة عمداً من غير عذر حتى يذهب وقتها كافر

**”İshaq bin Rahaveyhi belə deyərkən eşitdim: “Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, namazı tərk edəni kafir sayması səhihdir və bu, peyğəmbərin, salləllaəhu aleyhi və səlləm, zamanından bizim zamanımıza qədər elm əhlinin rəyidir ki, bir namazını üzr olmadan vaxtı çıxana qədər qəsdən tərk edən kafirdir.**”
(“Tazim Qadr əs-Salət”, 2/929)

[16] “**əl-Muhəllə bil-Əsər**”, 2/242, bax: Şəvkani, “**Neylul-Əvtar**” (2/11-12)

Bunu əl-Munziri “*ət-Tərğib vat-Tərhib*” əsərində ondan nəql edir və digər səhabələrin adlarını əlavə edir: Abdullah bin Məsud, Abdullah bin Abbas, Cabir ibn Abdullah və Əbu Darda, Allah hamısından razı olsun! Daha sonra isə deyir:

"ومن غير الصحابة أحمد بن حنبل، وإسحاق بن راهويه ، وعبد الله بن المبارك ، والنخعي ، والحكم بن عتيبة ، وأيوب السختياني، وأبو داود الطيالسي ، وأبو بكر بن أبي شيبة، وزهير بن حرب وغيرهم"

**“Səhabələrdən başqa Əhməd ibn Hənbəl, İshaq ibn Rahaveyh, Abdullah ibn əl-Mubarək, ən-Nəxai, əl-Hakəm bin Uteybə, Əyyub əs-Saxtiyani, Əbu Davud ət-Tayalisi, Əbu Bəkr ibn Əbi Şeybə və Zuheyr ibn Hərb və başqaları...”**[17]

Əgər yenə soruşsalar ki, “bəs o zaman namazı tərk edəni təkfir etməyənlərin dayandıqları dəlillərə cavab nədir?”

Deyirik: Bunun cavabı budur ki, bu dəlillərdə namazı tərk edənin kafir olmayacağına dair və ya onun mömin olmasına, atəşə girməyəcəyinə və ya Cənnətdə olacağına dair və buna bənzər heç bir şey gəlməmişdir.

Bu hədisləri araşdıran onların hamısının beş kateqoriyadan kənara çıxmadığını görəcəkdir və bunların heç biri namazı tərk edənin küfr olduğunu deyənlərin gətirdikləri dəlillərlə ziddiyət təşkil etmir.

- **Birinci kateqoriya:**

Zəif olan və mənası aydın olmayan hədislər bu kateqoriyaya aiddir. Bu hədisləri gətirənlər onlara dəlil olaraq dayanmağa çalışırlar, lakin bu, heç bir nəticə vermir.

[17] “**ət-Tərğib va ət-Tərhib**”, 1/393

- **İkinci kateqoriya:**

Məsələdə əslən dəlil olmayanlar bu kateqoriyaya daxildir. Bəzilərinin Allahu Təalənin bu sözü ilə dəlil gətirməsi kimi:

﴿ إِنَّ اللَّهَ لا يَغْفِرُ أَنْ يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَنْ يَشَاءُ ﴾

**﴾ Şübhəsiz ki, Allah Özünə şərik qoşanları əvf etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar.﴿**
(ən-Nisa, 48)

Allahu Təalənin "*mə dunə zəlik*" (bundan başqa, bundan aşağı) sözündəki məna "bundan kiçik olan" deməkdir, yoxsa şirkdən başqa bütün günahlar qəsd olunmur, çünki bunun dəlili budur ki, kim Allahın və Rasulunun verdiyi xəbəri təkzib edərsə o, kafirdir. Allah onu bağışlamayacaq və onun bu günahı (yəni təkzib etməsi) şirk deyildir.

Hətta "*mə dunə zəlik*" sözü ilə şirkdən başqa günahların qəsd olunduğunu qəbul etsək, o zaman bu ayə ümumi dəlillər növündəndir və şirkdən başqa günah olan küfrə dəlalət edən nasslar ilə xüsusiləşmişdir. İnsanı millətdən çıxaran küfr isə şirk olmasa da, Allahın bağışlamadığı günahlardandır.

- **Üçüncü kateqoriya:**

Namazı tərk edənin küfrünü isbat edən dəlillər ilə xüsusiləşmiş ümumi dəlillər bu kateqoriyaya daxildir.

Muaz ibn Cəbəlin hədisindəki peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, sözü kimi:

"ما من عبد يشهد أن لا إله إلا الله وأن محمداً عبده ورسوله إلا حرمه الله على النار"

**“Lə iləhə illəllah və Muhammədən Rasulullah” deyərək**

**şəhadət verən elə bir qul yoxdur ki, Allah ona atəşi haram qılmasın."**[18]

Bu, gələn fərqli ləfzlərdən biridir və buna bənzər hədislər Əbu Hureyradan, Ubadə bin əs-Samitdən, İtbən bin Malikdən varid olmuşdur. Allah hamısından razı olsun!

- **Dördüncü kateqoriya:**

Dəlilin özündə namazı tərk etməyi imkansız qılan bir şərtə bağlanmış ümumi dəlillər isə bu kateqoriyaya aiddir.

Peyğəmbərin, *salləllahu aleyhi va səlləm,* İtbən bin Malikin hədisindəki sözü kimi:

"فإن الله حرم على النار من قال لا إله إلا الله يبتغي بذلك وجه الله"

**"Allahın razılığını arzu edərək "lə iləhə illəllah" deyən kəsə Allah atəşi haram qılar."**[19]

Bunu Buxari rəvayət etmişdir.

Eləcədə Muazın hədisində peyğəmbərin, *salləllahu aleyhi va səlləm,*sözü kimi:

"ما من أحد يشهد أن لا إله إلا الله وأن محمداً رسول الله صدقاً من قلبه إلا حرمه الله على النار"

**"Qəlbində sidq ilə "Lə iləhə illəllah və Muhammədən Rasulullah" deyərək şəhadət verən elə bir qul yoxdur ki, Allah ona atəşi haram qılmasın."**[20]

---

[18] Buxari, "Kitəb əl-İlm" (1/128, əl-Fəth) və Muslim, "Kitəb əl-İmən" (1/240)

[19] Buxari, (415, 1130, 5086, 6539) və Muslim (33)

[20] Buxari, (1/226/ hədis: 128)

Bunu da Buxari rəvayət etmişdir.

İxlaslı niyyət və qəlbdəki sidqin şəhadət kəliməsini söyləmək üçün şərt qoşulması, bununla birlikdə namazın tərk olunmasını imkansız qılır. Çünki elə bir şəxs yoxdur ki, şəhadətində sadiq və ixlaslı olsun və öz sidqini və ixlasını namaz kimi əməldə tətbiq etməsin! Bu, mütləq olmalıdır, çünki namaz İslamın dirəyidir və qul ilə Rəbbi arasında bir bağlantıdır. Əgər Allahın razılığını arzulamaqda sadiqdirsə, buna vəsilə olan hər bir şeyi mütləq etməsi lazımdır və onu Rəbbindən ayıran hər bir şeydən çəkinməlidir. Eləcədə kim qəlbində sidq ilə "*lə iləhə illəllah va Muhammədən Rasul Allah*" deyərək şahidlik edərsə, mütləq Allaha qarşı ixlaslı olaraq və Allahın Elçisinə, *salləllahu aleyhi va səlləm*, tabe olaraq namazlarını qılmaqda da sadiq olmalıdır. Çünki namaz qılmaq sidq ilə söylənilmiş şəhadətin tələblərindəndir.

- **Beşinci kateqoriya:**

Namazını tərk edənin üzrlü olduğu hallarla şərtlənmiş olaraq gəlmiş dəlillər.

İbn Macənin Huzeyfə bin Yəməndən rəvayət etdiyi hədis kimi:

قال رسول الله صلى الله عليه و سلم : "يدرس الإسلام كما يدرس وشي الثوب"

Dedi: **"Allahın Elçisi, *salləllahu aleyhi va səlləm*, dedi: "İslam, paltarın naxışlarının söküldüyü kimi söküləcəkdir."**

və hədis davam edir və hədisdə qeyd olunur ki,

"وتبقى طوائف من الناس ، الشيخ الكبير والعجوز يقولون : "أدركنا آباءنا على هذه الكلمة لا إله إلا الله فنحن نقولها" فقال له صلة : "ما تغني عنهم لا إله إلا الله وهم لا يدرون لا صلاة ، ولا صيام ، ولا نسك ، ولا صدقة "

فأعرض عنه حذيفة ، ثم ردها عليه ثلاثاً ، كل ذلك يعرض عنه حذيفة ، ثم أقبل عليه في الثالثة فقال : " يا صلة ، تنجيهم من النار " ثلاثاً .

**“çox yaşlı və aciz insanlardan olan bəzi qruplar qalacaqlar və onlar deyəcəklər: “Biz öz atalarımızı bu kəlimə - Lə İləhə İllə Allah - üzərində gördük və biz də onu deyirik.” Sila ona dedi: “Axı namazın, orucun, qurbanın, sədəqənin nə olduğunu bilmədikləri halda, “lə iləhə illəllah” sözünün onlara nə faydası vardır?!” Huzeyfə ondan üzünü döndərdi və Sila bunu üç dəfə təkrarladı və hər dəfə də Huzeyfə üzünü döndərirdi. Üçüncü dəfə üzünü ona tərəf döndərərək dedi: “Ey Sila! Onları atəşdən xilas edəcək!”** (üç dəfə)[21]

(Lə iləhə illəllah) kəliməsi ilə atəşdən xilas olan bu kəslər, İslam Şəriətini tərk etməklərinə görə üzrlü olacaqlar. Çünki onlar İslam Şəriətindən xəbərsizdirlər. Hədisdən anlaşılan budur ki, onlar buna güc yetirə bilməyəcəklər və onların halı, Şəriət fərz olmadan əvvəl ölənin halına bənzəyir və ya şəhadət gətirəndən sonra şəriətin əhkamlarına əməl etmək imkanı tapmadan əvvəl ölən kəslər kimi şəriətə əməl etmək imkanı olmayanların halına bənzəyir və yaxud da küfr ölkəsində müsəlman olduqdan sonra şəriəti öyrənmək imkanı tapmadan ölən bir kəsin halına bənzəyir.

Xülasə olaraq qeyd edək ki, namazı tərk edənin kafir olduğunu söyləyənlərinin gətirdiyi dəlillər, kafir olmadığını söyləyənlərin gətirdikləri dəlillər ilə ziddiyət təşkil etmir. Çünki onların gətirdiyi dəlillər ya zəif olan və mənası aydın olmayan dəlillərdir, ya məsələdə əslən dəlil deyildir, ya dəlilin özündə

---

[21] İbn Macə, (4049) və əl-Hakim (4/473). əl-Hakim hədisin səhih olduğunu deyir və İmam Zəhəbi bununla razılaşmışdır. İbn Hacər də “**Fəthul-Bari**” əsərində (13/16) hədisin səhihliyini təsbit etmişdir. Bax: Şeyx Nasiruddin əl-Albani, “**Silsilə Əhadis əs-Sahihə**” (1/130-132, hədis: 87).

namazın tərkini imkansız qılan şərtə bağlıdır, ya namazın tərki halında üzrlü olan hallarla şərtlənmişdir və yaxud da kafir olduğunu isbat edən dəlillərlə təxsis olunmuş ümumi dəlillərdir.

Namazdan üz döndərənin küfrü bütün bu sabit və sağlam dəlillərlə aydın olduqdan sonra, küfr və riddət hökmlərinin həyata keçməsi vacibdir. Həm isbatda, həm də nəfydə hökmün müəyyən edilməsinin illətdən asılı olması zəruri bir qaydadır.

## İkinci Fəsil

# Namazı tərk etməklə və başqa səbəbdən meydana gələn riddətin aqibəti

İnsan mürtəd olduqda onun barəsində həm dünyəvi, həm də axirət ilə əlaqədar hökmlər vardır.

## Birinci:

## Dünyəvi hökmlər.

### 1. Vəlilik haqqı qalmaz

İslamın vəlayətdə şərt qoşduğu heç bir şeydə vəli olması caiz deyildir. Buna görə də nə az yaşlı övladları üzərində, nə də başqaları üzərində də vəliliyi yoxdur və vəlisi olduğu öz qızlarından və başqalarından heç kəsi evləndirə bilməz.

Fiqh alimlərimiz – Allahu Təalə onları bağışlasın! – özlərinin istər qısa məzmunlu, istərsə də geniş məzmunlu kitablarında açıq-aydın bildiriblər ki, müsəlman qadın evlənərkən onun vəlisinin müsəlman olması şərtdir və onlar deyirlər: “**Kafirin müsəlman üzərində vəliliyi yoxdur.**”

İbn Abbas, *radiyallahu anhumə,* demişdir: “**Yetişkin, hidayət və irşad sahibi bir vəli olmadan nigah olmaz”** və hidayətin, irşadın ən əzəmətlisi və ən alisi İslamdır, lakin ən

alçağı isə küfr və riddətdir. Allahu Təalə deyir:

﴿ وَمَنْ يَرْغَبُ عَنْ مِلَّةِ إِبْرَاهِيمَ إِلاَّ مَنْ سَفِهَ نَفْسَهُ﴾

﴾ **Səfeh olanlardan başqa kim İbrahim millətindən üz çevirər?**



(əl-Bəqara, 130)

## 2. Qohumlarına varis olmaq haqqı qalmaz.

Çünki kafir müsəlmana varis ola bilməz və eləcədə müsəlman kafirə varis olmaz. Çünki Usamə bin Zeydin, *radiyallahu anhumə*, hədisində peyğəmbər, *salləllahu aleyhi va səlləm*, deyir:

" لا يرث المسلم الكافر، ولا الكافر المسلم"

**“Müsəlman kafirə varis olmaz və kafir də müsəlmana varis ola bilməz.”**[22]

Bunu Buxari, Muslim və başqaları təxric etmişdir.

## 3. Məkkəyə və haram bölgələrinə daxil ola bilməz.

Çünki Allahu Təalə deyir:

---

[22] Buxari (6764) və Muslim (1614), hər ikisi də bu hədisi “Fəraiz” kitabında rəvayət ediblər.

﴿يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِنَّمَا الْمُشْرِكُونَ نَجَسٌ
فَلا يَقْرَبُوا الْمَسْجِدَ الْحَرَامَ بَعْدَ عَامِهِمْ هَذَا ﴾

**﴾ Ey iman gətirənlər! Həqiqətən də, müşriklər murdardırlar. Odur ki, özlərinin bu ilindən sonra Məscidulharama yaxınlaşmasınlar...﴿**
(ət-Tövbə, 28)

## 4. Mal-qaradan kəsdiyi heyvanın haram olması.

Heyvan kəsməyin şərtlərindən də biri budur ki, heyvan kəsən ya müsəlman olmalıdır, ya da yəhudi və ya nəsranilərdən olan kitab əhli olmalıdır. Lakin mürtəd, bütpərəst, məcusi və bənzərlərinin kəsdikləri halal deyildir.
Əl-Xazin öz təfsirində deyir:

أجمعوا على تحريم ذبائح المجوس وسائر أهل الشرك من مشركي العرب وعبدة الأصنام ومن لا كتاب له

**“Məcusilərin və ərəb müşriklərindən, bütə ibadət edənlərdən və kitab əhlindən olmayan bütün şirk əhlinin kəsdiklərinin haram olmasında icma vardır.”**

İmam Əhməd dedi:

لا أعلم أحداً قال بخلافه إلا أن يكون صاحب بدعة

**“Bidət əhlindən başqa buna müxalif bir söz deyən birini tanımıram.”**

5. **Öldükdən sonra üzərində namaz qılmaq haramdır və ona məğfirət və rahmət duası oxumaq da haramdır.**

Çünki Allahu Təalə deyir:

﴿ وَلاَ تُصَلِّ عَلَى أَحَدٍ مِنْهُمْ مَاتَ أَبَداً وَلاَ تَقُمْ عَلَى قَبْرِهِ إِنَّهُمْ كَفَرُوا بِاللَّهِ
وَرَسُولِهِ وَمَاتُوا وَهُمْ فَاسِقُونَ ﴾

**﴾ Heç vaxt onlardan ölmüş bir kəsin cənazə namazını qılma, qəbrinin başında da durma. Çünki onlar Allahı və Onun Elçisini inkar etdilər və günahkar olaraq öldülər. ﴿**
(ət-Tövbə, 84)

Allahu Təalə yenə buyurur:

﴿ مَا كَانَ لِلنَّبِيِّ وَالَّذِينَ آمَنُوا أَنْ يَسْتَغْفِرُوا لِلْمُشْرِكِينَ وَلَوْ كَانُوا أُولِي قُرْبَى مِنْ
بَعْدِ مَا تَبَيَّنَ لَهُمْ أَنَّهُمْ أَصْحَابُ الْجَحِيمِ وَمَا كَانَ اسْتِغْفَارُ إِبْرَاهِيمَ لِأَبِيهِ إِلاَّ عَنْ
مَوْعِدَةٍ وَعَدَهَا إِيَّاهُ فَلَمَّا تَبَيَّنَ لَهُ أَنَّهُ عَدُوٌّ لِلَّهِ تَبَرَّأَ مِنْهُ إِنَّ إِبْرَاهِيمَ لَأَوَّاهٌ حَلِيمٌ ﴾

**﴾ Müşriklərin Cəhənnəm sakinləri olduqları onlara bəlli olduqdan sonra, qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz. İbrahimin öz atası üçün bağışlanma diləməsi isə sadəcə ona verdiyi vədə görə idi. Atasının Allaha düşmən olduğu ona bəlli olduqdan sonra isə ondan uzaqlaşdı. Həqiqətən, İbrahim Allaha çox yalvaran həlim bir kimsə idi.﴿**
(ət-Tövbə, 113-114)

Küfrünün səbəbindən asılı olmayaraq istənilən küfr üzərində ölən biri üçün məğfirət və rəhmət duası oxumaq, duada həddini aşmaqdır, Allah ilə istehza etməyin

növlərindəndir və peyğəmbərin və möminlərin yolundan uzaqlaşmaqdır.

Axı Allaha və Axirət gününə iman gətirən bir kəs necə küfr üzərində ölən və Allahu Təalənin düşməni olan birinə məğfirət və rahmət duası edə bilər? Necəki Allah Azzə və Cəllə buyurur:

﴿ مَنْ كَانَ عَدُوّاً لِلَّهِ وَمَلائِكَتِهِ وَرُسُلِهِ وَجِبْرِيلَ وَمِيكَالَ فَإِنَّ اللَّهَ عَدُوٌّ لِلْكَافِرِينَ﴾

**﴿ Kim Allaha, Onun mələklərinə və elçilərinə, Cəbrailə və Mikailə düşməndirsə,**
**şübhəsiz ki, Allah da o kafirlərə düşməndir. ﴾**
(əl-Bəqara, 98)

Allahu Təalə bu mübarək ayədə bütün kafirlərə qarşı düşmən olduğunu bəyan etmişdir.

Möminə vacib olan bütün kafirlərdən uzaq durmaqdır. Çünki Allahu Təalə deyir:

﴿ وَإِذْ قَالَ إِبْرَاهِيمُ
لأَبِيهِ وَقَوْمِهِ إِنَّنِي بَرَاءٌ مِمَّا تَعْبُدُونَ إِلاَّ الَّذِي فَطَرَنِي فَإِنَّهُ سَيَهْدِينِ ﴾

**﴿ Bir zaman İbrahim öz atasına və qövmünə demişdi:**
**"Mən sizin ibadət etdiklərinizdən uzağam.**
**Yalnız məni yaradandan başqa!**
**Şübhəsiz ki, O məni doğru yola yönəldəcəkdir ﴾**
(əz-Zuxruf, 26-27)

Yenə Allahu Təalə buyurur:

﴿ قَدْ كَانَتْ لَكُمْ أُسْوَةٌ حَسَنَةٌ فِي إِبْرَاهِيمَ وَالَّذِينَ مَعَهُ إِذْ قَالُوا لِقَوْمِهِمْ
إِنَّا بُرءاؤ مِنْكُمْ وَمِمَّا تَعْبُدُونَ مِنْ دُونِ اللَّهِ كَفَرْنَا بِكُمْ وَبَدَا بَيْنَنَا وَبَيْنَكُمُ الْعَدَاوَةُ
وَالْبَغْضَاءُ أَبَداً حَتَّى تُؤْمِنُوا بِاللَّهِ وَحْدَهُ ﴾

﴿ İbrahim və **onunla birlikdə olanlarda sizin üçün gözəl bir nümunə vardır. Onlar öz qövmünə dedilər: "Həqiqətən, biz sizdən və** sizin Allahdan başqa tapındığınız şeylərdən uzağıq. Biz sizi inkar edirik. **Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda daim ədavət və nifrət olacaqdır!** ﴾
(əl-Mumtəhinə, 4)

Bununla da müsəlmana Allahın Elçisinə, *salləllahu aleyhi va səlləm,* tabe olmaq vacib olur, beləki Allahu Təalə buyurur:

﴿وَأَذَانٌ مِنَ اللَّهِ وَرَسُولِهِ إِلَى النَّاسِ يَوْمَ الْحَجِّ الْأَكْبَرِ
أَنَّ اللَّهَ بَرِيءٌ مِنَ الْمُشْرِكِينَ وَرَسُولُهُ﴾

﴿ **Bu, Allah və Onun Elçisi tərəfindən ən böyük həcc günü insanlara Allahın və** Onun Elçisinin müşriklərdən **uzaq olmasını elan edəcək** bir bildirişdir. ﴾
(ət-Tövbə, 3)

Allah üçün sevib Allah üçün nifrət edərək və Allah üçün dostluq edib Allah üçün düşmənlik edərək sevgisində, nifrətində, dostluğunda və ədavətində Allahın – Azzə və Cəllə - razılığına tabe olmaq imanın ən sağlam bağlarındandır.

## 6. Müsəlman qadın ilə nigah bağlaya bilməz.

Çünki o, kafirdir və kafirə müsəlman qadın ilə evlənmək dəlil və icma ilə halal deyildir. Allahu Təalə deyir:

﴿يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا جَاءَكُمُ الْمُؤْمِنَاتُ مُهَاجِرَاتٍ فَامْتَحِنُوهُنَّ﴾

اللَّهُ أَعْلَمُ بِإِيمَانِهِنَّ فَإِنْ عَلِمْتُمُوهُنَّ مُؤْمِنَاتٍ فَلا تَرْجِعُوهُنَّ إِلَى الْكُفَّارِ لا هُنَّ حِلٌّ لَهُمْ وَلا هُمْ يَحِلُّونَ لَهُنّ ﴾

**﴿ Ey iman gətirənlər! Mömin qadınlar hicrət edib sizin yanınıza gəldikləri zaman onları imtahana çəkin. Allah onların imanını daha yaxşı bilir. Əgər bunların mömin olduqlarını bilsəniz, onları kafirlərə qaytarmayın. Nə bunlar onlara halaldır, nə də onlar bunlara halaldırlar.﴾**
(əl-Mumtəhinə, 10)

"Əl-Muğni" əsərində (6/592) deyilir:

"وسائر الكفار غير أهل الكتاب لا خلاف بين أهل العلم في تحريم نسائهم وذبائحهم "

**"Elm əhli, kitab əhlindən başqa kafirlərin qadınlarının və kəsdiklərinin haram olmasında ixtilaf etməmişdir."**

Daha sonra deyir:

"والمرتدة يحرم نكاحها على أي دين كانت ، لأنه لم يثبت لها حكم أهل الدين الذي انتقلت إليه في إقرارها عليه ، ففي حلها أولى"

**"Mürtədin isə hansı dində olursa olsun nigahı haramdır, çünki nə özünün etirafına görə qəbul etdiyi din, nə də əvvəlki halı onun haqqında isbat olunmuş sayılmaz."**

İbn Qudamə "mürtəd" babında (8/130) deyir:

"وإن تزوج لم يصح تزوُّجه ؛ لأنه لا يقر على النكاح ، وما منع الإقرار على النكاح منع انعقاده كنكاح الكافر المسلمة"

**"Əgər evlənərsə evliliyi səhih deyildir, çünki mürtədin nigahı tanınmır. Kafir ilə müsəlmanın nigahı kimi nigahın**

**tanınmasına maneə olan şey, onların əqdinin bağlanmasına da maneədir”**[23]

Sən də görürsən ki, mürtədin nigahının haram olması və mürtədin nigahının səhih olmaması açıq-aydın görünür. Bəs evlilikdən sonra mürtəd olarsa necə?

“Əl-Muğni” əsərində (6/298) deyilir:

"إذا ارتد أحد الزوجين قبل الدخول انفسخ النكاح في الحال ، ولم يرث أحدهما الآخر، وإن كانت ردته بعد الدخول ففيه روايتان : إحداهما : تتعجل الفرقة. والثانى : تقف على انقضاء العدة".

**“Ər-arvaddan biri zifafdan əvvəl mürtəd olarsa nigahları həmin anda ləğv olunar, onlardan biri digərinə varis olmaz. Lakin əgər irtida zifafdan sonra baş verərsə, yenə də nigahı həmən ləğv olar və biri digərinə varis olmaz. İrtidanın zifafdan sonra baş verməsi haqqında iki görüş vardır: Birinci görüşə görə onların ayrılması tezləşdirilməlidir və ikinci görüşə görə isə iddət vaxtının sonunu gözləməlidirlər.”**

Yenə “əl-Muğni”də (6/639) deyir:

" أن انفساخ النكاح بالردة قبل الدخول قول عامة أهل العلم ، واستدل له . وفيه أيضاً أن انفساخه في الحال إذا كان بعد الدخول قول مالك وأبي حنيفة ، وتوقفه على انقضاء العدة قول الشافعي .

---

[23] Hənəfilərin “*Məcməi əl-Ənhur*” əsərində “kafirlərin nigahı” babının sonunda (1/202) deyilir:

(ولا يصح تزوج المرتد ولا المرتدة أحداً) لإجماع الصحابة رضوان الله عليهم أجمعين .

**“Səhabələrin, *ridvanullah aleyhim acməin*, icmasına görə hər hansı bir mürtəd kişinin və ya mürtəd qadının nigahı səhih deyildir.”**

**“Zifafdan əvvəl mürtəd olmaq ilə nigahın batil olması görüşü elm əhlinin hamısına aiddir və bunu dəlilləndirmişlər. Lakin irtidanın zifafdan sonra ortaya çıxması ilə həmən nigahın batil olduğunu dəstəkləyən görüş Malikin və Əbu Hənifənin görüşüdür. İddət vaxtının çıxmasını gözləməyi dəstəkləyən görüş isə Şafiyə aiddir.”**

Bu o deməkdir ki, dörd imamın hamısı, ər-arvaddan birinin mürtəd olması ilə nigah əqdinin pozulmasında ittifaq etmişdir. İrtidanın zifafdan əvvəl baş verməsi ilə nigah həmin anda batil olacaqdır, lakin irtida zifafdan sonra baş verərsə, Malikin və Əbu Hənifənin rəyinə görə həmin anda batil olar, Şafiyə görə isə iddət müddətinin sonuna qədər gözləməlidirlər. İmam Əhməddən isə hər iki rəyə uyğun iki fərqli rəvayət vardır.

Eyni babda səhifə 640-da deyir:

"وإن ارتد الزوجان معاً ، فحكمهما حكم ما لو ارتد أحدهما ، إن كان قبل الدخول تعجلت الفرقة ، وإن كان بعده فهل تتعجل أو تقف على انقضاء العدة على روايتين . وهذا مذهب الشافعي"

**“Əgər ər-arvadın hər ikisi də mürtəd olarsa, bunun hökmü sanki onlardan birinin mürtəd olması halındakı kimidir. Əgər zifafdan əvvəl olarsa onların ayrılığı tezləşdirilməlidir, lakin zifafdan sonra baş verdikdə isə bu iki görüşə görə ayrılığın tezləşdirilməsi yoxsa iddət vaxtının sonuna qədər gözlənilməsi lazımdırmı? Bu (iddətin sonuna qədər gözləmək), Şafinin məzhəbidir”**

Daha sonra Əbu Hənifədən nəql etmişdir ki, nigah istihsan[24] üçün ləğv olunmur, çünki onların dinləri fərqlənmir

[24] “İstihsan” barədə çoxlu rəylər vardır və bu məzhəblərə görə fərqlidir. Ümumi anlamda “istihsan” müctəhidin bir rəyi gözəl görməsidir. Çünki “istihsan” sözünün lüğəvi mənası “bir şeyi gözəl görmək” deməkdir. Hənəfilərdə “istihsana” gəldikdə isə bu barədə İmam Şatibi,

və bunu sanki islamı qəbul edən ər-arvada bənzətmişdir. Sonra "əl-Muğni"nin sahibi bunu rədd edib əksini isbat edərək (Əbu Hənifənin) qiyasını etibarsız saymışdır.

Mürtədin istər müsəlman kişi, istərsə də müsəlman qadın ilə nigahının səhih olmadığı və buna Kitab və Sünnətin dəlalət etdiyi aydın olduqdan sonra anlaşılmalıdır ki, Kitab və Sünnətdəki dəlillərin tələbinə görə və səhabələrin hamısının rəyinə əsasən namazı tərk edən də kafirdir. Eləcədə anlaşılmalıdır ki, əgər bir kişi namaz qılmırsa və müsəlman qadın ilə evlənirsə, onun evliliyi səhih deyildir və bu əqd ilə həmin qadın ona halal deyildir. Əgər Allahu Təaləyə tövbə edərsə və İslama geri dönərsə evlilik əqdini yeniləmək onun üzərinə vacibdir. Bu hökm eləcədə namaz qılmayan qadına da aiddir.

Kafirlərin küfrdə olduqları zaman bağladıqları nigahın hökmü isə bunun əksinədir. Məsələn: əgər bir kafir kişi digər kafir bir qadın ilə evlənərsə və sonra qadın müsəlman olarsa. Əgər qadın zifafdan əvvəl müsəlman olarsa, onların nigahı ləğv olunur. Lakin zifafdan sonra müsəlman olarsa, nigah ləğv olunmaz, lakin gözləmək lazımdır. Əgər iddət vaxtı çıxmadan

---

*rahiməhullah*, deyir:

وقال بعض الحنفية : إنه القياس الذي يجب العمل به ، لأن العلة كانت علة بأثرها : سموا الضعيف الأثر قياساً والقوي الأثر استحساناً ، أي قياساً مستحسناً ، وكأنه نوع من العمل بأقوى القياسين ، وهو يظهر من استقراء مسائلهم في الاستحسان بحسب النوازل الفقهية

**"Bəzi hənəfilər dedilər: "Bu (yəni, istihsan), əməl edilməsi vacib olan bir qiyasdır. Çünki illət təsiri ilə illət sayılır. Onlar illəti zəif olanı qiyas, illəti güclü olanı isə istihsan adlandırdılar. Yəni bir növ daha uyğun görülən qiyasdır. Sanki istihsan bir növ güclü olan qiyas ilə əməl etməkdir. Hənəfi məzhəbindəki məsələlərin incələnməsində fiqhi problemlərin halına görə bu məna ortaya çıxır."**
("əl-İtisam", 3/63-64, Məktəbə ət-Təvhid, Məşhur bin Həsən Al Salmanın təhqiqi ilə)

əvvəl kişi də İslamı qəbul edərsə qadın onun zövcəsi sayılar. Lakin kişi İslamı qəbul etdikdən əvvəl iddət vaxtı çıxarsa, onun qadın üzərində heç bir haqqı qalmaz. Çünki izah olunduğu kimi nigah artıq İslamı qəbul etdikdən əvvəl ləğv olunmuşdu.

Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, zamanında kafirlər zövcələri ilə birlikdə İslamı qəbul edərdilər və peyğəmbər, *salləllahu aleyhi va səlləm*, onların nigahlarını qəbul edərdi. Yalnız nigahlarını haram qılan qəti səbəblər olduğu halda qəbul etməzdi. Məsələn, ər-arvadın bir-birilərinə məhrəm olan məcusilər olması buna misaldır. Onlar İslamı qəbul etdikləri zaman, bunun haramlığına qəti bir səbəb olduğu üçün onları ayırardı.

Bu məsələ, namazı tərk etməklə kafir olan və sonra müsəlman qadınla evlənən müsəlmanın məsələsi kimi deyildir. Nas və icmaya görə müsəlman qadın kafirə halal deyildir, istər kafir mürtəd deyil, əslən kafir olsun və bunu əvvəldə qeyd etmişdik. Buna görə də əgər kafir müsəlman qadınla evlənərsə, nigahı batildir və ayrılmaqları vacibdir. Hətta əgər kafir İslamı qəbul edərsə və müsəlman qadına geri dönmək istərsə, yalnız yeni bir nigah əqdindən sonra bu, ona caizdir.[25]

## 7. Namazı tərk edənin evləndiyi müsəlman qadından olan uşaqlarının hökmü:

[25] Zamanımızda müsəlman bacılarımız belə bir fitnə ilə sınaq qarşısındadırlar. Onları bəzən ailələri dini, imanı bəlli olmayan kəslərə məcburi ərə verir, bəziləri də “cahillərə ərə getmək caizdir” deyənlərin sözlərinə aldanaraq və ehtiyac duyduqları üçün bunu edirlər. Lakin bəyan etmək lazımdır ki, bu, heç bir şəkildə halal deyildir. Bacılarımız bundan çəkinməlidirlər və bununla dinlərini və etiqadlarını təhlükəyə atmaq qorxusu ilə qorunmalıdırlar. Haqqı bilənlərə də əmanətin haqqını verərək tam şəkildə çatdırmaq vacibdir.

Anaya gəldikdə, uşaqlar hər bir halda anaya aiddir.

Amma qadının evləndiyi kişiyə gəldikdə isə, namazı tərk edəni kafir görməyənlərin rəyinə görə uşaqlar kişinindir və hər bir halda ona aid edilər, çünki nigahları səhihdir.

Lakin namazı tərk edəni kafir görənlərə gəldikdə isə - birinci fəsildə qeyd etdiklərimizə əsasən doğru olan bu rəydir – bu zaman biz kişinin halına baxırıq:

- Əgər qadının əri nigahın batil olduğunu bilmirsə və ya buna etiqad etmirsə, uşaqlar onun uşaqlarıdır və ona aid edilər. Çünki onun etiqadına görə bu halda onların əlaqəsi mübahdır və "vat əş-şubhə" [26] sayılır, "vat əş-şubhə" halında isə övlad nəsəbə aid edilir.

- Lakin əgər əri nigahının batil olduğunu bilirsə və buna etiqad edirsə, uşaqları ona aid edilməz. Çünki uşaqlar, qadının kişiyə halal olmaması səbəbi ilə cimanın haram olduğunu bilən kəsin mənisindən yaranmışdır.

---

[26] "Vat şubhə" fiqhi anlamda kişinin evləndiyi qadın ilə nigahının batil olduğunu bilmədiyi hala deyilir və yaxud da şübhələndiyi hala deyilir. Məs: Əgər qadın evlənərkən hər hansı bir şeyi gizlədirsə və yaxud da başqa səbəbdən nigah batildirsə və kişi bunu bilmirsə, buna "vat şubhə" deyilir. Fiqhdə buna əsasən doğulan uşağın hər halda nəsəbə, yəni ataya aid edilə biləcəyinə hökm verilir.

## İkinci:

## İrtidaya görə Axirətdəki hökmlər.

### 1. Mələklər onu azarlayacaqlar və vuracaqlar.

Onların üzlərinə və arxalarına zərbə vuracaqlar.
Allahu Təalə deyir:

﴿ وَلَوْ تَرَى إِذْ يَتَوَفَّى الَّذِينَ كَفَرُوا الْمَلائِكَةُ يَضْرِبُونَ وُجُوهَهُمْ وَأَدْبَارَهُمْ وَذُوقُوا عَذَابَ الْحَرِيقِ ذَلِكَ بِمَا قَدَّمَتْ أَيْدِيكُمْ وَأَنَّ اللَّهَ لَيْسَ بِظَلامٍ لِلْعَبِيدِ﴾

**﴿ Kaş sən kafirləri mələklər onların canını alarkən görəydin. Mələklər onların üzünə və yanlarına vura-vura deyirdilər: "Dadın yandırıcı odun əzabını! Bu, öz əllərinizlə etdiyiniz əməllərə görədir. Yoxsa Allah qullarına zülm edən deyildir ﴾**
(əl-Ənfal, 50-51)

### 2. Küfr və şirk əhli ilə birlikdə həşr olunacaqdır, çünki onlardandır.

Allahu Təalə deyir:

﴿ احْشُرُوا الَّذِينَ ظَلَمُوا وَأَزْوَاجَهُمْ وَمَا كَانُوا يَعْبُدُونَ مِنْ دُونِ اللَّهِ فَاهْدُوهُمْ إِلَى صِرَاطِ الْجَحِيمِ ﴾

**﴿ Mələklərə belə əmr olunacaq:**

**"Toplayın bir yerə zalımları, onların yoldaşlarını və Allahdan başqa ibadət etdiklərini.**
**Onları Cəhənnəm yoluna yönəldin.** ﴾
(əs-Saffat, 22-23)

“Əzvac” (yoldaşlar) isə “zəvcə” sözünün cəmidir və eyni sinif deməkdir. Ayənin mənası budur ki, zülm edənləri və onlarla eyni sinifdən olan küfr və zülm əhlini həşr edəcəkdir.

## 3. Əbədi olaraq atəşdə qalacaqlar.

Çünki Allahu Təalə deyir:

﴿ إِنَّ اللَّهَ لَعَنَ الْكَافِرِينَ وَأَعَدَّ لَهُمْ سَعِيراً خَالِدِينَ فِيهَا أَبَداً لا يَجِدُونَ وَلِيّاً وَلا
يَوْمَ تُقَلَّبُ وُجُوهُهُمْ فِي النَّارِ يَقُولُونَ يَا لَيْتَنَا أَطَعْنَا اللَّهَ وَأَطَعْنَا نَصِيراً
الرَّسُولا ﴾

﴿ **Həqiqətən, Allah kafirləri lənətləmiş və onlar üçün yaxıb-yandıran Od hazırlamışdır.**
**Onlar orada əbədi qalacaq, özlərinə nə bir himayəçi, nə də bir yardımçı tapa bilməyəcəklər.**
**Üzləri odda o yan-bu yana döndəriləcəyi gün onlar deyəcəklər:**
**"Kaş biz Allaha ibadət edəydik, Onun Elçisinə müti olaydıq!**

(əl-Əhzab, 64-66)

İnsanlardan çoxunun sınağa çəkildiyi bu əhəmiyyətli məsələdə demək istədiyimiz söz burda sona çatır.

Tövbə edənlər üçün tövbə qapısı həmişə açıqdır. Ey

müsəlman qardaşım! Allahu Təaləyə ixlas ilə, keçmişdəki əməllərindən peşmanlıq duyaraq və bu əməllərinə bir də qayıtmayacağına qərarlı olaraq və itaətlərini artıraraq Allaha –Azzə və Cəllə - tərəf üzünü tut və tövbə et!

﴿ مَنْ تَابَ وَآمَنَ وَعَمِلَ عَمَلاً صَالِحاً فَأُولَئِكَ يُبَدِّلُ اللَّهُ سَيِّئَاتِهِمْ حَسَنَاتٍ وَكَانَ
اللَّهُ غَفُوراً رَحِيماً وَمَنْ تَابَ وَعَمِلَ صَالِحاً فَإِنَّهُ يَتُوبُ إِلَى اللَّهِ مَتَاباً ﴾

**﴿ Ancaq tövbə edib iman gətirən və saleh əməllər edənlərdən başqa.**
**Allah onların pis əməllərini yaxşı əməllərlə əvəz edər. Allah Bağışlayandır, Rəhmlidir! Kim tövbə edib yaxşı iş görərsə, o, doğrudan da Allaha tərəf qayıtmış olar. ﴾**

(əl-Furqan, 70-71)

Allahdan bizim işlərimizi ədalətli qılmasını və bizim hamımızı doğru yola, qəzəbə uğramışların və yolunu azmışların deyil, nemət verdiyi peyğəmbərlərin, sıddıqların, şəhidlərin və salehlərin yoluna yönəltməsini diləyirəm!

Allahu Təaləyə möhtac qulu
**Muhamməd əs-Saleh əl-Useymin**in qələmi ilə,
Tarix: hicri 1407/2/23

Şeyx İbn Useyminin, *rahiməhullah*, bu mübarək risaləsini həm də onun özündən dinləmək mümkündür. Aşağıdakı internet linkindən istifadə edərək onun bu barədə xütbəsinə dinləmək olar.
h p://www.binothaimeen.com/sound/snd/a0182/a0182-53.rm

Kitabı proqram şəklində endirmək üçün:
http://www.binothaimeen.com/soft/HokomTarikAlsalat.exe

Kitabı online şəkildə oxumaq üçün:
http://www.ibnothaimeen.com/all/books/cat_index_316.shtml

# Müxaliflərin şübhələrinə cavab

Zamanımızda bu məsələ barədə bir çox kitablar təlif olunmuşdur. Bunların içində bəziləri namazı tərk edənin küfrünü isbat etdiyi halda, digərləri bunun əksinə onların İslamını isbat etməyə çalışmışdır. Bu kitablardan Azərbaycanda oxucu kütləsi içində Şeyx Nasiruddin əl-Albaninin, *rahiməhullah*, "Hukmu Tərik əs-Saləh" əsəri ən məşhurudur. Lakin çox təəssüf ki, oxuyucular qarşı tərəfin bu şübhələrə verdiyi cavablardan xəbərsizdir. Əks tərəf isə çox zaman məsələdə mucməl hökmlər ilə, mufəssəl hökmlər arasında və ya muhkəm ilə mutəşabih arasında fərq gözləmədən öz məzhəblərinə uyğun olan dəlillərə diqqət çəkiblər. Bu xətaları – Allahın izni ilə - qısa bir şəkildə göstərəcəyik və mövcud şübhələrə cavab verməyə çalışacağıq.

Formalaşan əqidənin nəticəsində insanlar namazlarına qarşı səhlənkarlıq göstərirlər. Sanki onlar namazı tərk etməyin küfr olmadığını zənn edərək, belə bir işi öz gözlərində xəfifləşdirirlər. Nə üçün Azərbaycanda namazı tərk edənin kafir olmayacağını isbat etməyə çalışırlar?! Onlara dəvətlərinin səbəbini soruşduqda deyərlər ki, azərbaycan cəmiyyətinə uyğun olan dəvət budur. Amma onlar iki tərəfdən yanılırlar. Hər şeydən əvvəl bilmək lazımdır ki, müsəlman dəvətin tələbinə görə deyil, dəlillərə əsasən etiqadını qurmalıdır. Ona görə də belə bir bəhanə gətirmək çox əsassızdır. Daha sonra isə bilmək lazımdır ki, namazsız bir cəmiyyətdə belə bir əqidəni yaymaq təhlükəlidir. Bunun nəticəsində insanlar işin ciddiliyindən xəbərsiz qalırlar və bu əməlin əslində küfr olduğunu bilmirlər. Namaz qılmayan kəsə, onun etdiyi əməlin küfr olduğunu söyləmək daha uyğundur! Müvəffəqiyyət Allahdandır!

Sözümüzün əvvəlində demək istəyirik ki, biz yalnız

namazlarını tamamilə tərk edən kəsləri kafir görürük. Hər hansı bir namazı tərk etməyi dindən çıxaran küfr olduğunu demirik. Kitabımızın gedişində bu mövqeyimizi isbat edən dəlilləri – inşə Allah - qeyd edəcəyik.

Hamıya məlumdur ki, İmam Əhməddən məşhur olan görüşə görə namazı tərk edən kafirdir. Alimlər əsrlər boyu bunu bu şəkildə qəbul ediblər. Zamanımızda isə bəziləri bunun əksini sübut etməyə çalışırlar və İmam Əhmədin bəzi sözlərini götürərək, digər sözlərini kənara atırlar.

Əli Həsən əl-Hələbi, Şeyx əl-Albaninin məzkur kitabının müqəddiməsində[27] deyir:

قال الإمام المبجل أحمد بن حنبل في وصيته لتلميذه الإمام الحافظ مسدد بن مسرهد:
" . . . ولا يخرج الرجل من الإسلام شيء إلا الشرك بالله العظيم أو يرد فريضة من فرائض الله عز وجل جاحدا بها فإن تركها كسلا أو تهاونا : كان في مشيئة الله إن شاء عذبه وإن شاء عفا عنه . . . "

**Ehtiram sahibi imam Əhməd bin Hənbəl öz tələbəsi imam əl-Hafiz Musəddəd bin Musərhəd yolu ilə demişdir: "...Əzəmət sahibi Allaha şərik qoşmaqdan və ya Allahın – fərz buyurduqlarından bir fərzi inkar edərək rədd etməkdən başqa heç bir şey insanı İslam dinindən çıxarmaz, əgər bunları tənbəllik və ya səhlənkarlıq səbəbi ilə tərk edərsə, Allahın məşiyyəti altındadır, dilərsə əzab edər, dilərsə onu bağışlayar..."**[28]

Əli əl-Hələbinin bunu mövzu ilə əlaqədar nəql etməsi çox qəribə bir haldır. Mövzu barədə bunun dəlil gətirilməsi iki səbəbdən əsassızdır:

1. Məzkur nəqldə fərzlərin tənbəllik üzündən tərk

[27] "**Hukmu Tərik əs-Saləh**", səh: 10-11
[28] "**Tabaqat əl-Hənəbilə**", 1/343

olunmasından söhbət gedir. Lakin bu, ömrü boyu fərzlərdən heç birinə əməl etməyən kəslərə aid edilməz. Çünki tənbəllik və səhlənkarlıq ömürlük bir huy deyildir, bu hal insanda bəzən özünü büruzə verir, bəzən də heç olmaz.

İbn Teymiyyə, *rahiməhullah*, deyir:

فأما من كان مصرا على تركها لا يصلي قط، ويموت على هذا الإصرار والترك فهذا لا يكون مسلما؛ لكن أكثر الناس يصلون تارة، ويتركونها تارة، فهؤلاء ليسوا يحافظون عليها، وهؤلاء تحت الوعيد، وهم الذين جاء فيهم الحديث الذي في السنن حديث عبادة عن النبي صلى الله عليه وسلم أنه قال: ((خمس صلوات كتبهن الله على العباد في اليوم والليلة من حافظ عليهن كان له عهد عند الله أن يدخله الجنة، ومن لم يحافظ عليهن لم يكن له عهد عند الله، إن شاء عذبه وإن شاء غفر له))

**“Lakin kim tərki üzərində israr edərsə və qətiyyən namaz qımazsa və bu israr və bu tərk üzərində ölərsə, bu insan müsəlman olmaz. Lakin insanların çoxu bəzən qılır, bəzən də namazlarını tərk edirlər və bu kəslər namazlarını davamlı qılmayanlardır. Bu kəslər Allahın vaidi altındadır. Bunlar o kəslərdirlər ki, haqlarında sünən kitablarında Ubadə bin Samitdən gələn hədisdə[29] peyğəmbər, *salləllahu aleyhi va səlləm*, deyir: "Allah bir gün və bir gecədə bəndələrinə beş vaxt namazı fərz qıldı. Kim bu namazları davamlı şəkildə qılarsa Allah yanında onu Cənnətə daxil edəcəyinə dair əhd vardır. Kim onları davamlı qılmazsa onun üçün Allah yanında heç bir əhd yoxdur. Diləsə əzab edər, diləsə onu bağışlayar!"[30]**

Şeyxul-İslamın da sözlərindən anlaşıldığına görə

[29] İmam Malik, "**Muvatta**" (1/254-255), Əbu Davud (2/62), Nəsai (1/186), İbn Macə (1/448) və Əhməd (5/315, 317, 319)
[30] "**Məcmu əl-Fətava**", 22/48

namazlarını ömrü boyu qılmayan insana tənbəllik və ya səhlənkarlıq sifətlərini aid etməzlər. Lakin insanların çoxunda zahir olan bu tənbəlliyə görə namazlarını bəzən qılarlar və bəzən qılmazlar.

2. İmam Əhmədin burdakı fərzlər ilə namazdan başqa digər fərzləri qəsd etdiyi aydındır, çünki ondan gələn rəvayətlərə əsasən namazı bu məsələdə istisna etmişdir. İmam Əhməddən gələn məşhur rəyə görə hətta tənbəllik səbəbi ilə namazını tərk edəni kafir görmüşdür. Hənbəli alimlərindən İbn Teymiyyə, fərzlərin tərk olunması barədə İmam Əhməddən altı rəy nəql etmişdir[31] və onlardan yalnız birində namazı tərk edəni kafir görməmişdir.

İmam Laləkay, *rahiməhullah*, (ö. hicri 418) məsələdə İmam Əhmədin sözlərini nəql edərək deyir:

ومن ترك الصلاة فقد كفر وليس من الأعمال شيء تركه كفر إلا الصلاة من تركها فهو كافر وقد أحل الله قتله

**“Kim namazı tərk edərsə kafir olmuşdur, namazdan başqa digər əməllərdən heç birini tərk etməklə insan kafir olmaz və kim namazı tərk edərsə kafirdir və Allah onu öldürməyi halal saymışdır.”**[32]

İmam Əbu Bəkr əl-Acurri, *rahiməhullah*, (ö. hicri 360) deyir:

حدثنا ابن مخلد قال: حدثنا أبو داود قال: سمعت أحمد يقول: إذا قال: لا أصلي، فهو كافر.

---

31 “**Məcmu əl-Fətava**”, 7/302

32 ”**Şərh Usul İtiqad Əhli-Sunnə val-Cəmaə**”, 1/179

**“İbn Muxalləd bizə rəvayət etdi və dedi: Əbu Davud bizə rəvayət etdi və dedi: Əhmədi belə deyərkən eşitdim: Əgər kimsə “Mən namaz qılmayacam!” deyərsə, o, kafirdir!”**[33]

İmam Əhməd bin Hənbəlin görüşlərini toplayan əl-Xallal, *rahiməhullah*, nəql edir:

أنبانا محمد بن أبى هارون أن إسحاق بن إبراهيم حدثهم قال: حضرت رجلا سأل أبا عبد الله - أي أحمد بن حنبل - فقال: يا أبا عبد الله، إجماع المسلمين على الإيمان بالقدر خيره وشره؟، قال أبو عبد الله: نعم. قال: ولا نكفر أحدا بذنب؟ فقال أبو عبد الله: اسكت، من ترك الصلاة فقد كفر، ومن قال "القرآن مخلوق" فقد كفر

**“Bizə Muhamməd ibn Əbi Harun xəbər verdi ki, İshaq ibn İbrahim onlara rəvayət etmişdir. Dedi: “Mən, Əbu Abdullaha – yəni Əhməd bin Hənbələ - sual verən bir nəfərin yanında oldum. Həmin adam soruşdu: “Ey Əbu Abdullah! Qədərə xeyri və şərri ilə iman etməkdə müsəlmanlar icma ediblərmi?” Əbu Abdullah dedi: “Bəli!” Həmin adam dedi: “O halda heç kəsi günahı səbəbi ilə təkfir etmirik?” Əbu Abdullah dedi: “Sus! Namazı tərk edən kafir olur, “Quran məxluqdur” deyən kafir olur.”**[34]

---

[33] əl-Acurri, “**əş-Şəriah**”, 136

[34] “**Musnəd Əhməd**” (1/79), Əhməd Şakirin təhqiqi ilə. Hədisin isnadı səhihdir. Mətbuda xətalı olaraq Muhamməd bin Harun olaraq yazılıdır, lakin doğru olan Muhamməd ibn Əbi Harundur.
İmam Əhməddən bu rəy öz zamanında da məşhur olmuşdur. Buna görə də müasirlərindən bəziləri onu buna görə tənqid etmişdir.
əl-Xallal “**əs-Sunnə**” əsərində nəql edir:

قال أبو عبد الله - أحمد بن حنبل -: بلغني أن أبا خالد وموسى بن منصور وغيرهما يجلسون في ذلك الجانب فيعيبون قولنا، ويدعون أن هذا القول: أنه لا يقال (أي القرآن) مخلوق وغير مخلوق، ويعيبون من يكفر، ويقولون: إنا نقول بقول الخوارج. ثم تبسم أبو عبد الله كالمغتاظ

Eləcədə İmam əl-Munziri və digər bir çox alim mövzu ilə əlaqədər görüşləri qeyd edərkən, bu görüşü İmam Əhmədə aid etmişdir. Hənbəli fiqhini oxuyan hər bir insana məlumdur ki, Əhməddən, *rahiməhullah*, gələn məşhur və sabit rəy budur ki, namazı tərk edən kafirdir.[35] Bu barədə kitabın sonunda daha

---

**"Əbu Abdullah – Əhməd bin Hənbəl – dedi: "Bizə çatmışdır ki, Əbu Xalid, Musa bin Mənsur və başqaları müxaliflərimizin yanında oturaraq bizim sözümüzü tənqid edirlər. Belə deyirlər: "Quran nə məxluqdur, nə də məxluq deyildir." Təkfir etdiklərimizə görə də bizi tənqid edirlər və deyirlər ki, biz xəvaricin görüşünü söyləyirik." Daha sonra Əbu Abdullah qəzəbli biri kimi gülümsədi."**

"Məcmu əl-Fətava", 6/479, Dar əl-Kutub əl-İlmiyyə nəşri.

[35] Bir çoxları yanılaraq elə zənn edirlər ki, bu, yalnız İmam Əhmədə aid bir rəydir. Lakin bu, xətadır. Bəlkə də son zamanlarda aparılmış dəvətin nəticəsi olaraq ortaya çıxmış bir təəssüratdır. Əslində isə namazı tərk edənin kafir olduğuna səhabələrin icması dəlalət edir. Tabiinin cumhuru və hədis əhlinin cumhuru bu rəydə olmuşdur. İmam əl-Mərvazi, *rahiməhullah*, kitabında məşhur imam İshaq ibn Rahaveyhin, *rahiməhullah*, sözlərini bu şəkildə nəql edir:

سمعت إسحاق يقول صح عن النبي أن تارك الصلاة كافر وكذلك كان رأي أهل العلم من لدن النبي أن تارك الصلاة عمداً من غير عذر حتى يذهب وقتها كافر

**"İshaqı belə deyərkən eşitdim: Peyğəmbərdən səhih olaraq rəvayət olunmuşdur ki, namazı tərk edən kafirdir və eləcədə bu peyğəmbərin vaxtından elm əhlinin rəyidir ki, namazını üzr olmadan vaxtı çıxana qədər qəsdən tərk edən biri kafirdir."**

"Tazim Qadr əs-Salət", 2/990

Yenə Əyyub əs-Saxtəyaninin belə dediyini nəql edir:

ثنا محمد بن يحيى، ثنا أبو النعمان، ثنا حماد بن زيد عن أيوب قال: "ترك الصلاة كفر، لا يختلف فيه".

**"Bizə Muhamməd bin Yəhya rəvayət etdi, bizə Əbu əl-Numən rəvayət etdi, Haməd bin Zeyd bizə Əyyubun belə dediyini rəvayət etdi: "Namazı tərk etmək küfrdür və bunda ixtilaf yoxdur."**

geniş məlumat veriləcək – inşə Allah – və İmam Əhmədin məsələ haqqındakı görüşü izah olunacaq.

Əli Həsən əl-Hələbi sözünün davamında Muhamməd ibn Abdulvahhabın, *rahiməhullah*, sözlərini nəql etmişdir:

أركان الإسلام الخمسة أولها الشهادتان ثم الأركان الأربعة إذا أقر بها وتركها تهاونا فنحن وإن قاتلناه على فعلها فلا نكفره بتركها والعلماء اختلفوا في كفر التارك لها كسلا من غير جحود ولا نكفر إلا ما أجمع عليه العلماء كلهم وهو الشهادتان

**"İslamın rükunları beşdir, bunların ilki Şəhadət kəlməsi, daha sonra isə İslamın digər dörd əsasıdır. Əgər kimsə digər dörd əsası qəbul etməklə birlikdə səhlənkarlıq üzündən onları tərk edərsə biz onun bu dörd əsası icra etməsi üçün ona qarşı döyüşsək də, onun bu əməlləri tərk etməsindən dolayı onu kafir saymırıq. Alimlər bu dörd ərkanı inkar etmədən tənbəllik üzündən tərk edənin hökmündə ixtilaf etmişlər. Biz yalnız alimlərin ittifaq etdikləri məsələlərə görə kiməsə kafir deyirik. Bu da şəhadət kəlməsidir."**[36]

Əl-Hələbi ümumiyyətlə məsələləri qarışdırmaqla məşhurdur. Digər kitablarında olduğu kimi, burda da nəqlləri münasib olmayan şəkildə tətbiq edir. Deyirik: Şeyx ət-Təmimi bu sözü ilə bu dörd əməldən hər hansı birini tərk edənlər haqqında danışır. Bu sözündə əslən ömrü boyu Allah üçün namaz qılmayanın müsəlman olması barədə bir işarə yoxdur. Beləki Şeyx Muhamməd ibn Abdulvahhab, *rahiməhullah*, bu məsələlər içində öz sərtliyinə görə seçilmişdir. Məzh buna görə

---

"Tazim Qadr əs-Salət", 2/925 (978)
Bununla da aydın olur ki, bunun üzərində səhabə icma etmişdir, tabiinin və hədis əhlinin cumhuru bu rəy üzərində olmuşdur.

[36] "**əd-Durər əs-Səniyyə**", 1/70

də bir çoxları onu “təkfirçi” olaraq tanıyiblar. Şeyxin kitablarını oxuyan bunun şahidi ola bilər. O, “Kəşf əş-Şubuhət” əsərinin sonunda deyir:

ولنختم الكلام - إن شاء الله تعالى - بمسألة عظيمة مهمَّة جدًا تفهم مما تقدم، ولكن نفرد لها الكلام لعظم شأنها، ولكثرة الغلط فيها فنقول:

لا خلاف على التوحيد لا بد أن يكون بالقلب واللسان والعمل، فإن اختلَّ شيء من هذا لم يكن الرجل مسلمًا، فإن عرف التوحيد ولم يعمل به فهو كافر معاند كفرعون وإبليس وأمثالهما،

**"Sözümü əvvəldə qeyd olunanlardan anlaşılan çox əzəmətli və əhəmiyyətli bir məsələ ilə bitirək. Bu məsələnin əhəmiyyətinin böyük olması və çoxlarının bunda xəta etməsi səbəbi ilə bu məsələni ayrılıqda qeyd edirik və deyirik:**
**Tövhidin həm qəlb, həm dil və həm də əməl ilə olmasının vacib olması üzərində ixtilaf yoxdur. Bunlardan hərhansı biri yerinə yetirilməzsə, həmin kəs müsəlman olmaz. Kim tövhidi bilərsə və onunla əməl etməzsə o, kafirdir, lap Firon, İblis və bənzərləri kimi inadkar kafirdir."**[37]

Muhamməd ibn Abdulvahhabın əsl etiqadını açığa vuran nəql etdiyimiz bu sözlərdir. Bununla da aydın olur ki, əl-Hələbi sözləri öz yerinə aid etməmişdir. Bunun kimi misallar ilə əl-Hələbi və onunla eyni məzhəbi bölüşənlər deyirlər: “*Şəhadət kəlimələrini söylədiyi halda və fərzləri inkar etmədikcə, əməlləri necə və hansı şəkildə tərk etməyindən asılı olmayaraq insana kafir hökmü verilməz.*” Bu söz, iman və küfrün həqiqətindən qafil olanların sözüdür. Onlar, “*biz, halal görmədiyi müddətdə əhli-qiblədən heç kəsi etdiyi günaha görə təkfir etmərik*” sözünü kitablarında çox-çox zikr edərlər. Halbuki sözün məqsədini və fiqhini anlamazlar. Bu ləfzin doğru anlaşılmadığına diqqət çəkən hər kəsi “xaricilik” və

---

[37] “**Kəşf əş-Şubuhət**”, 51-52 (Dar əl-İman nəşri)

ya “təkfirçilik” ilə ittiham edərlər. Əslində belə bir ittihamı yalnız cahillər edərlər. Çünki cahil, yeni bir şey eşitdiyi zaman dərhal onu inkar etməyə və pisləməyə çalışır. Avam kütlə müsəlmanlar arasında riddətin ola biləcəyini qəbul etmirlər və bunun ola biləcəyini və ya müsəlman haqqında mürtəd hökmü verilə biləcəyini imkansız sayırlar. Halbuki fiqh alimləri riddət məsələsini fiqh kitablarının bir çox bölümlərində izah ediblər. Məsələn, dəstəmaz bölümündə irtidadan danışaraq, mürtəd olması səbəbi ilə dəstəmazın pozulacağını zikr edirlər. Onlar ilk anda ağla gəlməz hallarda insanın mürtəd ola biləcəyini qeyd ediblər və bununla da əslində insanları bu hallardan çəkindirmək məqsədini güdüblər. İbn Qudamə əl-Maqdisi, *rahiməhullah*, deyir:

والردة تبطل الأذان إن وجدت في أثنائه

**“Riddət azan əsnasında ortaya çıxarsa, azanı batil edər.”**[38]

Görəsən mürciə heç azan əsnasında dindən dönmək barədə düşündümü? Məhz bu səbəblə Həmid əl-Faqi, *rahiməhullah*, “Fəthul-Məcid” kitabının təliqində deyir:

كثير من أدعياء العلم يجهلون: لا إله إلا الله، فيحكمون على كل من تلفظ بها بالإسلام، ولو كان مجاهرا بالكفر الصراح، كعبادة القبور والموتى والأوثان، واستحلال الحرمات المعلوم تحريمها من الدين ضرورة، والحكم بغير ما أنزل الله، واتخاذ أحبارهم ورهبانهم أربابا من دون الله.

**“Alimlik iddiasında olan bir çox kəs “lə iləhə illəllah” kəliməsinin mənası barədə cahildirlər və buna görə də qəbirlərə, ölülərə və bütlərə ibadət etmək, dində zəruri olaraq bilinən haramları halal saymaq, Allahın endirdiklərindən başqası ilə hökm vermək və hahamlarını, rahiblərini**

[38] “**əl-Muğni məa Şərh əl-Kəbir**”, 1/438

**Allahdan başqa rəbblər etmək kimi açıq küfrləri etsələr belə, bu sözü tələffüz edən hər kəs haqqında müsəlman hökmü verirlər."**[39]

Bununla da aydın olmalıdır ki, insanı dindən yalnız təkzib və cuhud çıxarmaz. İnad və təkəbbürlük küfrün ən geniş yayılmış növlərindən bəziləridir. Bu barədə İbn Teymiyyə və İbnul-Qayyim, *rahiməhuməllah,* kitablarında geniş məlumat veriblər.

## Huzeyfənin "Onları atəşdən qurtaracaq"

[39] "**Fəthul-Məcid**", səh: 216 (həmiş 2)

## sözündəki şübhələr

Daha sonra Əli əl-Hələbi kitabın müqəddiməsində Huzeyfənin hədisini zikr edir və Huzeyfə ilə Silanın söhbətinə işarə etdikdən sonra deyir:

وقال شيخنا الألباني في كتابه المعطار " سلسلة الأحاديث الصحيحة " ( 1 / 130 - 132 ) تعليقا على هذا الحديث الصحيح :
" هذا وفي الحديث فائدة فقهية هامة وهي أن شهادة أن لا إله إلا الله تنجي قائلها من الخلود في النار يوم القيامة ولو كان لا يقوم بشيء من أركان الإسلام الخمسة الأخرى كالصلاة وغيرها .
ومن المعلوم أن العلماء اختلفوا في حكم تارك الصلاة خاصة مع إيمانه بمشروعيتها فالجمهور على أن لا يكفر بذلك بل يفسق وذهب أحمد [ فيما يذكر عنه ] إلى أنه يكفر وأنه يقتل ردة لا حدا .
وقد صح عن الصحابة أنهم لا يرون شيئا من الأعمال تركه كفر غير الصلاة وأنا أرى أن الصواب رأي الجمهور وأن ما ورد . رواه الترمذي والحاكم عن الصحابة ليس نصا على أنهم كانوا يريدون ب ( الكفر ) هنا الكفر الذي يخلد صاحبه في النار ولا يحتمل أن يغفره الله له كيف ذلك وحذيفة بن اليمان - وهو من كبار أولئك الصحابة - يرد على صلة ابن زفر وهو يكاد يفهم الأمر على نحو فهم أحمد له فيقول : " ما تغني عنهم لا إله إلا الله وهم لا يدرون ما صلاة . . . " فيجيبه حذيفة بعد إعراضه عنه : " يا صلة تنجيهم من النار " ثلاثا .
فهذا نص من حذيفة رضي الله عنه على أن تارك الصلاة - ومنها بقية الأركان - ليس بكافر بل هو مسلم ناج من الخلود في النار يوم القيامة .
فاحفظ هذا فإنك قد لا تجده في غير هذا المكان

**"Şeyximiz əl-Albani "Silsilə əl-Əhadis əs-Sahihə" adlı dəyərli kitabında (1/131-130) bu səhih hədisin təliqini verərək deyir: "Bu hədisdə çox mühüm fiqhi faydalar vardır. O, da "lə iləhə illəllah" kəliməsi, namaz və digər rükunlər kimi beş islam**

ərkanından heç birini yerinə yetirməsə də, sahibini Qiyamət günü atəşdə əbədi qalmaqdan xilas edəcəkdir.

Məlumdur ki, alimlər fərz olduğuna inanmaqla bərabər namazını tərk edən kəs haqqında ixtilaf ediblər. Cumhura görə buna görə təkfir olunmaz, lakin fasiq olar. Əhməd isə (ondan rəvayət olunduğuna görə) kafir olduğunu deyir və həddə görə yox, riddətə görə öldürülməsi lazım olduğunu deyir.

Səhabədən səhih olaraq rəvayət olunmuşdur ki, "onlar namazdan başqa heç bir əməlin tərkini küfr saymazdılar."

Mənə görə cumhurun rəyi doğrudur. Lakin ət-Tirmizi və əl-Hakimin səhabədən rəvayət etdiyi icmaya gəldikdə isə, burda onların bu küfrlə sahibini atəşdə əbədi saxlayan küfrü qəsd etdiklərinə heç bir dəlil yoxdur və nə də Allahın onları bağışlamayacağına bir ehtimalı yoxdur. Axı bu necə ola bilər? Huzeyfə bin əl-Yəmən – o, ən üstün səhabələrdən biridir – məsələni Əhmədin fəhmi ilə başa düşən Sila bin Zufəri rədd edir. Sila ona belə deyir: "Onlar namazın və ....nə olduğunu bilmədikləri halda, "*lə iləhə illəllah*" onlara nə fayda verə bilər?!" Huzeyfə isə hər dəfə ondan üz döndərdikdən sonra ona belə cavab vermişdir: "Ey Sila! Onları atəşdən qurtaracaq" və bu sözünü üç dəfə təkrarlamışdır. Bu isə Huzeyfədən, *radiyallahu anhu*, namazını və bununla digər rükunları tərk edənin kafir olmadığına, əksinə müsəlman olduğuna və onun Qiyamət günü atəşdə əbədi qalmaqdan qurtulacağına dair bir dəlildir.

Bunu yaxşıca yadda saxla, bunu bundan başqa yerdə tapmaya bilərsən!"[40]

**Deyirik:** Allah Şeyx əl-Albanini bağışlasın! Onun bu hədisi dəlil olaraq gətirməsi mənasızdır. Çünki bu hədis heç bir vəch ilə namazı tərk edən haqqında bir dəlil ola bilməz. Onun tələbəsi sayılan Əli Həsən əl-Hələbinin də buna bu qədər diqqət

---

[40] **"Hukmu Tərik əs-Saləh"**, səh: 15-16

yetirməsi onun təəssübkeşliyindən başqa bir şey deyildir. Buna cavabımız belədir:

1. Huzeyfədən, *radiyallahu anhu*, gələn bu hədisi əl-Həkim və İbn Macə rəvayət etmişdir. Lakin bu rəvayətlərin ləfzlərində fərqlər vardır. Bəzi rəvayətlərdə namaz sözü zikr olunduğu halda, digər rəvayətlərdə namaz sözü zikr olunmamışdır. Bu isə bizim məsələmizdə çox əhəmiyyətli bir fərqdir.

İbn Macənin şeyxi Əli bin Muhamməd, hədisi yuxarıdakı ləfz ilə rəvayət etmişdir və Əli bin Muhamməd siqadır. Əbu Kureyb isə namaz sözünü zikr etmədən rəvayət edib və Əl-Hakimin başqa rəvayətində Əhməd bin Abdulcabbar ət-Təmimi əl-Ataradi əl-Kufi, bunda Əbu Kureybə tabe olaraq hədisi namaz sözünü zikr etmədən rəvayət etmişdir. Lakin əl-Ataradi zəifdir.

Əl-Bəzzar bunu Əbu Kureybdən müxtəsər şəkildə **"İslam paltarın naxışları söküldüyü kimi söküləcəkdir"** ləfzi ilə rəvayət edir və deyir:

وهذا الحديث رواه جماعة عن أبي مالك عن ربعي عن حذيفة، ولا نعلم أحدًا أسنده إلا أبو كريب عن أبي معاوية.

**"Bu hədisi bir qrup Əbu Malikdən, o isə Rabiidən, o da Huzeyfədən rəvayət etmişdir. Əbu Kureybdən başqa bu sənədlə Əbu Muaviyyədən rəvayət edəni tanımırıq."**[41]

Eləcədə Nueym bin Haməd əl-Xazai də bunu namaz sozünü zikr etmədən rəvayət etmişdir.[42] Eləcədə İmam Suyuti, *rahiməhullah*, namaz sözünü zikr etmədən bunu əl-Beyhəqiyə

---

[41] **"əl-Bəhr əz-Zəxxar"**, 7/2838

[42] Bax: **"əl-Fitən"**, 2/598/1665

istinad etmişdir[43] Bunların əksinə Muhammməd bin Fudeyl namaz sözünü zikr edərək Əbu Malikdən, Rabiidən, o da Huzeyfədən rəvayət etmişdir. Bunu əl-Hakim (4/505) təxric etmişdir, Muhammməd ibn Fudeylin adı isə İbn Ğazvandır və saduqdur. Bundan başqa Musəddəd bunu Əbu Avanədən, o isə Əbu Malik əl-Əşcaidən təxric etmişdir.[44] Eləcədə əs-Salihi bunu "əs-Səbil əl-Hədi va ər-Rəşad fi Sira Xayr əl-İbəd" əsərində (10/161) Musəddədə istinad etmişdir. Əbu Kamil əl-Həcdəri isə bunu Əbu Avanədən namaz sözünü zikr etmədən rəvayət etmişdir. Musəddəd və Əbu Kəmilin hər ikisi də siqa hafizdir. Əbu Avanə isə hədisi kitabından rəvayət edirsə siqa olan sabit bir ravidir, lakin hafizəsindən rəvayətində isə xətalar edir. Bu rəvayətin Əbu Avanənin kitabından yoxsa hafizəsindən olması barədə əlimizdə bir dəlil yoxdur və bu barədə bir söz söyləməkdən çəkinirik.

Əbu Muaviyyənin əsl adı, Muhammməd bin Xazim əd-Darir əl-Kufidir. Bu ravi murciə olmuşdur və Əhməd və digər alimlərin söylədiyi kimi, onun əl-Aməşdən başqa kəslərdən etdiyi rəvayətlərində vəhm və iztirab vardır və bu rəvayət də bunlardandır, çünki Əbu Muaviyyə bunu Əbu Malik əl-Əşcaidən rəvayət etmişdir. Sözü gedən ravi eləcədə tədlisi ilə də seçilmişdir və xüsusilə bunu "ananə"[45] ilə rəvayət etməsi burda tədlis etməyinə güclü bir işarədir.[46] Əbu Muaviyyənin mürciə məzhəbindən olmasına diqqət yetirmək lazımdır. Məlumdur ki, mürciələrə görə sadəcə şəhadət kəlimələrini

---

[43] Bax: **"əd-Durr əl-Mənsur"**, 5/335

[44] Bax: əl-Busiri, **"Misbəh əz-Zucəcə"**, 3/254 (1429)

[45] "ananə" hədisi "an" (dan, dən) şəklində zikr edərək rəvayət etməkdir. Ravilərin "səmi'tu an fulən" (fılankəsdən eşitdim) və ya "qalə fulən" (fılankəs dedi) sözü yerinə, sadəcə olaraq "va an fulən" (fılankəsdən) deməsinə "ananə" rəvayəti deyilir. Bu şəkildə rəvayət edən müdəllislərin rəvayəti qəbul deyildir.

[46] Bax: **"Fətava li Raisə İdarə əl-Buhus əl-İlmiyyə va əl-İftə"** fətva: 7649, tarix: 1404/11/1

söyləməklə insanın İslamı sabit olur. Beləliklə Əbu Muaviyyədən gələn iki rəvayətin birində namaz sözü zikr olunduğu halda, digərində bu söz zikr olunmur.

Yenə əs-Suyuti ”əd-Durr əl-Mənsur” əsərində (5/335) hədisi əl-Xatibin ”Tarix” əsərinə istinad etmişdir və bunun mətnində fərqli ləfz gəlmişdir:

"فلا يعرفون وقت صلاة ولا صيام ولانسك...."

**”Namazın vaxtlarını bilməyəcəklər və orucun, qurbanın nə olduğunu bilməyəcəklər...”**

Əl-Hakimin hədisinin nə mətnində, nə də Silanın verdiyi sualda namaz sözü zikr olunmamışdır. Bu isə digər rəvayətdəki ziyadə sözlərin sihhətini şübhə altına qoyur. Əl-Hakimin rəvayəti bu şəkildədir:

قال رسول الله صلى الله عليه وسلم يدرس الإسلام كما يدرس وشي الثوب حتى لا يدري ما صيام ولا صدقة ولا نسك ويسري على كتاب الله في ليلة فلا يبقى في الأرض منه آية ويبقى طوائف من الناس الشيخ الكبير والعجوز الكبيرة يقولون أدركنا آباءنا على هذه الكلمة لا إله إلا الله فنحن نقولها قال صلة بن زفر لحذيفة فما تغني عنهم لا إله إلا الله وهم لا يدرون ما صيام ولا صدقة ولا نسك فأعرض عنه حذيفة فرددها عليه ثلاثا كل ذلك يعرض عنه حذيفة ثم أقبل عليه في الثالثة فقال يا صلة تنجيهم من النار

**“Allahın Elçisi, *salləllahu aleyhi va səlləm,* dedi: “İslam paltarın naxışları söküldüyü kimi söküləcəkdir. Beləki nə orucun, nə sədəqənin nə də qurbanın nə olduğu bilinməyəcəkdir. Allah Kitabı bir gecədə götürəcək və Yer üzündə ondan bir ayə belə qalmayacaq. Lakin insanlardan yaşlı və aciz qruplar qalacaq və onlar deyəcəklər: “Bizə atalarımız “*lə iləhə illəllah*” kəliməsini zikr etdirərdilər və biz də bu kəliməni səyləyirik” Sila bin Zufər, Huzeyfəyə dedi: “Orucun, sədəqənin, qurbanın nə olduğunu bilmədikləri**

**halda, “*lə iləhə illəllah*” onlara nə fayda verə bilər?!” Huzeyfə ondan üz döndərdi və Sila sualını üç dəfə təkrarladı. Huzeyfə hər dəfə üzünü döndərirdi və üçüncü dəfə üzünü ona tutaraq dedi: “Ey Sila! Onları atəşdən qurtaracaq!”**[47]

Gördüyümüz kimi hədisdə namaz sözü zikr olunmamışdır. Şeyx əl-Albani hədisin sihhətindən danışarkən əl-Hakimin bunu səhih saydığını deyir. Lakin Şeyxin iki hədisin ləfzləri arasındakı fərqə diqqət çəkməsi daha doğru olardı. Çox təəssüf ki, bunu etməmişdir.

Gördüyünüz kimi hədisin ləzflərində namaz sözünün sihhəti sabit deyildir, lakin bunun sabit olduğunu qəbul etsək belə deyirik:

1. Hər şeydən əvvəl bu hədisin namazı tərk edənlər üçün üzr olaraq gətirilməsi çox qəribədir. Çünki hədisdə bunun üçün yaxından – uzaqdan heç bir dəlil yoxdur. Bu hədis cahilliyin üzr olduğuna dəlildir. Çünki hədisdə deyilir. **“Beləki, nə orucun, nə namazın, nə həccin, nə də zəkatın nə olduğu bilinməyəcəkdir...”** Bu isə onların tam şəkildə cahil olduqlarına və elm tələb etmək üçün heç bir imkanlarının olmadığına dəlildir, çünki Allahu Təalə Quranı onlardan götürəcəkdir.

İcma ilə sabitdir ki, fərziyyətini bilmədiyi halda bir fərzi tərk edənə təhdid yoxdur. Beləki, Şəriətin üzərində durduğu üsul qaydalarından biri də belədir:

المشقة تجلب التيسير

**“Çətinlik özü ilə asanlıq gətirir”**

---

47 “**əl-Mustədrək**” 4/473, həd: 8460

Bu üsul qaydasına əsasən çətinlik zamanında bir çox əhkam asanlaşdırılır. Allahu Təalə deyir:

﴿ يُرِيدُ اللّهُ بِكُمُ الْيُسْرَ وَلاَ يُرِيدُ بِكُمُ الْعُسْرَ ﴾

﴾ **Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir.** ﴿[48]

Allah Azzə və Cəllə yenə buyurur:

﴿ لاَ يُكَلِّفُ اللّهُ نَفْساً إِلاَّ وُسْعَهَا ﴾

﴾**Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər yükləyər.** ﴿[49]

İmam İbn Əbil-İzz, *rahiməhullah*, kitabında Şafinin bu sözlərini nəql edir:

فإن الله يعلم أن هذا مستطيع يفعل ما استطاعه فيثيبه، وهذا مستطيع لا يفعل ما استطاعه فيعذبه، فإنما يعذبه لأنه لا يفعل مع القدرة، وقد علم الله ذلك منه، ومن لا يستطيع لا يأمره ولا يعذبه على ما لم يستطعه

**“Həqiqətən Allah bilir ki, güc sahibi olan bu bəndəsi gücü çatdığına əməl edir və ona əl dəymir. Güc sahibi olan digər bəndəsi isə gücü çatdığına əməl etmir və Allah ona əzab edir. Allahın ona əzab etməsinin səbəbi isə, bəndəsinin qüdrəti olduğu halda əməl etməməsidir. Qüdrəti olmayana gəldikdə isə, Allah ona heç bir şeyi əmr etməz və bacarmadığı şeyə görə əzab etməz.”**[50]

İbn Teymiyyə isə, *rahiməhullah,* deyir:

---

[48] əl-Bəqara, 185

[49] əl-Bəqara, 286

[50] “**Şərhu Aqidəh ət-Tahaviyyə**”, səh: 271 (Məktəbə əl-İsləmiyyə)

إن العذر لا يكون عذراً إلا مع العجز عن إزالته، وإلا متى أمكن الإنسان معرفة الحق فقصر فيه، لم يكن معذوراً

**”Üzr, yalnız bu üzrü aradan qaldırmaqdan aciz olduqda üzr sayılar. Əgər insanın haqqı öyrənmək imkanı varsa, lakin bunun üçün bir şey etmirsə, üzrlü sayılmaz.”**[51]

Burda təməkkün qaydası izah olunur. Əhli-Sünnətin qəbul etdiyinə görə məzur sayılan cahil, elm öyrənməyə imkanı olmayan cahildir. Elmsiz olan və haqqdan xəbərsiz olan, lakin elmi tələb etmək imkanı olduğu halda bunu etməyən isə cəhalətinə görə üzrlü sayılmaz.

Bundan əlavə İbn Teymiyyə, *rahiməhullah*, bu hədisi ”*Buğyət əl-Murtəd*” kitabında cəhalət üzrü üçün dəlil gətirmişdir:

وبيَّنّا أن المؤمن الذي لا ريب في إيمانه، قد يخطئ في الأمور العلمية الإعتقادية، فيغفر له، كما يغفر له ما يخطئ فيه من الأمور العملية، وأن حكم الوعيد على الكفر، لا يثبت في حق الشخص المعين، حتى تقوم عليه حجة الله التي بعث بها رسله، كما قال تعالى:

﴿ وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّى نَبْعَثَ رَسُولاً ﴾

وأن الأمكنة والأزمنة التي تفتر فيها النبوة، لا يكون حكم من خفيت عليه آثار النبوة -حتى أنكر ما جاءت به خطأ- كما يكون حكمه في الأمكنة والأزمنة التي ظهرت فيها آثار النبوة، وذكرنا حديث حذيفة الذي فيه...

**“İzah etdiyimiz kimi, imanında heç bir şübhə olmayan bir mömin, əməllə əlaqəli elmi məsələlərdə xəta etdikdə bağışlandığı kimi, etiqadla bağlı elmi məsələlərdə də xəta etdikdə, bağışlanır. Müəyyən bir şəxs haqqında vaid məsələsində küfr hökmü, yalnız Allahın elçiləri ilə göndərdiyi hüccət ona çatdıqdan sonra isbat olunar. Beləki, Allahu Təalə deyir:**

---

51 “**Raful Mələm an Aimmətil Aləm**”, səh: 114

**﴿Biz öz tərəfimizdən bir elçi göndərmədikcə, əzab edici deyilik.﴾**

**Peyğəmbərliyin zəif olduğu məkanlarda və zamanlarda peyğəmbərlik əsərindən xəbərsiz qalan kəslərin hökmü – hətta xəta edərək gələn bir şeyi inkar etsə belə - peyğəmbərlik əsərinin yayıldığı zamanlar və məkanlardakı şəxslərin hökmü kimi deyildir. Biz bu barədə Huzeyfənin hədisini zikr etmişik..."**[52]

Ümmətin alimləri bu məsələni çox aydın şəkildə izah edərək, insanın acizliyi üzündən əməlləri tərk etməsinə görə əzab verilmədiyini qeyd ediblər. Bu barədə Quran və Sünnət dəlillər ilə boldur və bunu burda daha geniş izah etməyə ehtiyac yoxdur. Heç şübhə yoxdur ki, axır zamanlarda elmin qalmadığı bir vaxtda insanların İslam hökmlərinə əməl etmək imkanları olmayacaqdır, çünki onlar islam hökmlərindən xəbərsiz olacaqlar və üstəlik bu hökmləri öyrənməkdən aciz olacaqlar. Bütün bunlara əsasən demək olar ki, Huzeyfənin hədisi namazın vacibliyini bildiyi halda, onu qəsdən tərk edənlərə aid edilə bilməz.

Kitabın əvvəlində təqdim etdiyimiz risalədə İbn Useyminin, *rahiməhullah*, bu hədis barədəki sözləri mövzu ilə əlaqədar zikr olunmuşdu:

**"(*Lə iləhə illəllah*) kəliməsi ilə atəşdən xilas olan bu kəslər, İslam Şəriətini tərk etməklərinə görə üzrlü olacaqlar. Çünki onlar İslam Şəriətindən xəbərsizdirlər. Hədisdən anlaşılan budur ki, onlar buna güc yetirə bilməyəcəklər və onların halı, Şəriət fərz olmadan əvvəl ölənin halına bənzəyir və ya şəhadət gətirəndən sonra şəriətin əhkamlarına əməl etmək imkanı tapmadan əvvəl ölən kəslər kimi şəriətə əməl etmək**

[52] "**Buğyət əl-Murtəd fi ər-Radd alə əl-Mutəfəlsifə va əl-Qaramitə**", səh: 311, "Mətbəə əl-Ulum val-Əhkəm", üçüncü nəşr, Musa Duveyşin təhqiqi ilə

**imkanı olmayanların halına bənzəyir və yaxud da küfr ölkəsində müsəlman olduqdan sonra şəriəti öyrənmək imkanı tapmadan ölən bir kəsin halına bənzəyir."**

Şeyx İbn Useyminin də sözlərindən aydın olur ki, bu hədis heç bir vəch ilə namazı qəsdən tərk edən üçün bir üzr ola bilməz. Namazın vacibliyini bildiyi halda namazını tərk edənlər haqqında küfrünə dəlalət edən hədislər varid olmuşdur. Şeyx əl-Albaninin, *rahiməhullah*, dəlil adı ilə təqdim etdiyi bu hədis, namazın vacibliyindən cahil olanlar haqqında dəlil ola bilər. İbnul-Qayyim, *rahiməhullah*, namazı tərk edəni təkfir etməyənlərin dəlillərini zikr edərkən, yuxarıdakı hədisi qeyd etməmişdir. Halbuki kitabında hər iki tərəfin ən çox zikr olunan dəlillərini gətirmişdir. Çox ehtimal ki, hədisi dəlillər içində zikr etməməsinin səbəbi hədisdə namazı tərk edənin müsəlman olmasına heç bir dəlilin olmamasıdır.

Əziz müsəlman! Allah sənə rəhm etsin! Elm, peyğəmbərlərdən gəlmiş mirasdır. Diqqətli ol! Əhli-sünnət alimləri bu hədisi cahillik üzrü üçün dəlil gətiriblər. Hədisdə namazı qəsdən tərk edən üçün heç bir dəlil yoxdur.

## Səhabənin icmasına görə namazı tərk edən

# kafirdir

Məlumdur ki, peyğəmbərin, *səllallahu aleyhi va səlləm*, əshabı namazı tərk edənin küfrü üzərində icma etmişdir. Bəziləri bu icmanı ya inkar etməyə, ya da öz havasına uyğun şəkildə təvil etməyə çalışırlar və elə zənn edirlər ki, onlar bununla nasların arasını cəm edirlər. Halbuki, onlar bununla təvil olunmayan nasları dəlilsiz təvil etməklə onları inkar edirlər.

Bu icma bir çox kəs tərəfindən nəql olunmuşdur. Bunlardan:

- **Cabir ibn Abdullahın rəvayəti:**

عن طريق يعقوب بن إبراهيم قال: ثنا أبي عن محمد بن إسحاق قال: ثنا أبان بن صالح عن مجاهد أبي الحجاج عن جابر بن عبدالله عنه قال: قلت له: ما كان يفرق بين الكفر والإيمان عندكم من الأعمال في عهد رسول الله صلى الله عليه وسلم؟ قال: الصلاة

**"Yaqub bin İbrahim yolu ilə, dedi: atam (İbrahim bin Said) bizə Muhamməd bin İshaqdan rəvayət etdi və dedi: Əbən bin Saleh bizə Mucahid Əbul-Həccacdan, o da Cabir bin Abdullahdan rəvayət etdi və dedi: Ondan (Cabirdən) soruşdum: Allahın Elçisinin, *səlləllahu aleyhi va səlləm*, zamanında sizə görə iman və küfrü hansı əməl ayırardı? Dedi: "Namaz"**[53]

[53] "**Tazim Qadr əs-Salət**", (2/877), əl-Laləkay, "**Şərh Usul İtiqad Əhl əs-Sunnə**", 4/829 (hədis: 1538), İbn Batta, "**əl-İbanə**" (876), əl-Xallal, "**əs-Sunnə**" 4-cü cild (hədis: 1379)

Hədis, həsən biz-zatihi hökmündədir. Muhammməd bin İshaqdan başqa bütün raviləri siqadır. Muhammməd bin İshaq isə saduqdur. Onun tədlis etdiyi söylənilmişdir. İmam Əhməd deyir:

كان يدلس إلا أن كتاب إبراهيم بن سعد إذا كان سماعاً قال "حدثني" وإذا لم يكن قال "قال"

**"Tədlis edərdi, lakin İbrahim bin Saidin kitabı isə istisnadır, əgər eşidərək rəvayət olunubsa "həddəsəni" (bizə bildirdi) deyir, əgər elə olmayıbsa "qalə" (dedi) deyir."**[54]

Bu əsər də İbrahim bin Said tariqi ilə rəvayət olunmuşdur. Bu isnadı İbn Hibban və İbn Xuzeymə dəlil olaraq qibləyə tərəf bövl etməyin nəhy olunması babında gətirmişlər.[55] Eləcədə Əbu Davud eyni isnad ilə rəvayət edərək üzərində sükut etmişdir, yenə ət-Tirmizi, İbn Macə və əl-Hakim eyni sənəd ilə rəvayət etmişdir.[56] Əl-Hakim bu isnad ilə rəvayət etdikdən sonra bunun Muslimin şərtinə görə səhih olduğunu qeyd etmişdir.[57] Yenə ibn Hibban öz "Səhih"ində Suleyk əl-Ğatafaninin qıssasını eyni isnad ilə dəlil gətirmişdir.[58]

İbn Abdilbərr, *rahiməhullah*, danışmamağı və kölgədə durmamağı nəzir etmiş şəxs haqqındakı Malikin mürsəl olaraq rəvayət etdiyi hədis haqqında danışarkən sənədin ittisalına[59]

---

[54] "**Təhzib ət-Təhzib**", 1/121-122; əl-Hafiz Əbul-Fəth ibn Seyyid ən-Nəs, "**Uyun əl-Əsər fi Funun əl-Məğazi va əş-Şəməil va əs-Siyər**", 1/61, daha geniş məlumat üçün sonuncu kitabın müqəddiməsinə bax!
[55] "**Sahih İbn Hibban**", 4/268 (1420); İbn Xuzeymə, 1/24 (58)
[56] Əbu Davud, (18); ət-Tirmizi, (9); İbn Macə, (325); əl-Hakim, "**əl-Mustədrək**", (1/157)
[57] Bax: "**Tənfih Əhadis ət-Taliq**", 1/19
[58] İbn Hibban, 6/49 (2504)
[59] İttisal, heç bir kəsinti olmadan sənədin peyğəmbərə qədər bağlı olmasına deyilir. Belə hədislərə muttasil hədislər deyilir. Bunun əksinə

hökm edir və deyir:

هذا الحديث يتصل عن النبي من وجوه ، من حديث جابر ومن حديث
ابن عباس .. وأظن والله أعلم أن حديث جابر هو هذا ، لأن مجاهدا رواه عن
جابر ، وحميد بن قيس صاحب مجاهد
قال: حدثنا أبو عمر أحمد بن محمد... عن محمد بن إسحاق عن أبان بن
صالح عن مجاهد عن جابر قال : كان أبو إسرائيل رجلا من
بني فهر ، فنذر ليقومن في الشمس...

**“Bu hədis peyğəmbərdən bir çox yol ilə, Cabirin hədisindən və İbn Abbasın hədisindən kəsintisiz gəlmişdir...və zənn edirəm ki, - doğrusunu Allah bilir – Cabirin hədisi bu hədisdir, çünki Mucahid bunu Cabirdən rəvayət etmişdir və Humeyd bin Qeys, Mucahidin dostudur.**
**Dedi: Bizə Əbu Ömər Əhməd bin Muhamməd...Muhamməd bin İshaqdan, o da Əbən bin Salehdən, o da Mucahiddən, o isə Cabirdən rəvayət etdi: Əbu İsrail, Bənu Fəhrdən bir kişi idi və günəş altında durmağı nəzir etmişdi...”**[60]

Bu sənədin muttasil olduğunu eləcədə əl-Hafiz ibn Hacər “Fəthul-Bari”də qeyd etmişdir və Sufyanın bunun Mücahid vasitəsilə Cabirə çatan sənəd ilə rəvayət etdiyini deyir.[61] Yenə əl-Beyhəqi bunu Sufyan yolu ilə tam bir sənəd şəklində zikr etmişdir.[62] İmam Yəhya bin Said əl-Qattan rəvayət elminin məharəti barədə yazarkən Mucahidin Cabirdən rəvayət etmə şəklini bəyan etmişdir, beləki onlar Mucahidin Cabirin səhifəsindən rəvayət etdiyini görürdülər.[63] Cabirin səhifəsi isə

---

isə mualləq, munqati və mursəl hədislər vardır. Mualləq, adətən sənədində birdən çox ravi olmayan sənədə deyilir, munqati isə sənədində kəsiklik olan hədisdir.

[60] İbn Abdilbərr, “**əl-İstizkar**”, 5/183

[61] “**Fəthul-Bari**”, 5/353; “**Təğliq ət-Taliq**”, 3/314-315

[62] əl-Beyhəqi, “**əs-Sünən**”, 10/331

[63] əl-Alai, “**Cami ət-Təhsil**”, 1/273

mərufdur və İmam əş-Şabi və Qatadənin də bu səhifədən rəvayət etdikləri məlumdur.[64] Əhli-Sünnət imamları Mucahidin Cabirdən rəvayət etdiyi bu isnadın muttasil olduğuna hökm ediblər.

İmam ət-Tirmizi öz şeyxi İmam əl-Buxaridən, *rahiməhuməllah,* İbn İshaqın, Əbən bin Salehdən, onun Mucahid bin Cabirdən və onun da Cabirdən rəvayət etdiyi "qibləyə tərəf bövl etməyin nəhy edilməsi" hədisi haqqında soruşmuşdur:

سألت محمدا عن هذا الحديث فقال: هذا الحديث صحيح، رواه غير واحد عن محمد بن إسحاق.

**"Muhamməddən (yəni, əl-Buxaridən) bu hədis barədə soruşdum və dedi: "Bu hədis səhihdir və bunu Muhamməd bin İshaqdan birdən çox ravi rəvayət etmişdir."**[65]

Bu sənədi eləcədə əl-Hafiz Əbu Bəkr əl-Bəzzar həsən saymışdır.[66] İbn əs-Sakin isə bu isnadı səhih saymışdır və əd-Daraqutni "əl-İləl" əsərində deyir:

بلها.سئل عن حديث جابر بن عبد الله عن أبي قتادة أنه رأى النبي صلى الله عليه وسلم يبول مستقبل القبلة ، فقال: كذلك ابن لهيعة عن أبي الزبير عن جابر عن أبي قتادة ، وليس بمحفوظ ، والحديث مشهور عن جابر بن عبد الله عن النبي ، يرويه محمد بن إسحاق عن أبان بن صالح عن مجاهد عن جابر : نهى رسول الله صلى الله عليه وسلم أن نستقبل القبلة ببول ، فرأيته قبل أن يقبض بعام يستق

**"Cabir ibn Abdullahın, Əbu Qatadadan, onun peyğəmbəri, salləllahu aleyhi va səlləm, qiblə istiqamətində bövl edərkən görməsi barədə rəvayət etdiyi hədis barədə**

---

[64] "**əl-İləl əl-Kubra**", səh: 163

[65] ət-Tirmizi, "**əl-İləl əl-Kubra**", səh: 23; hədis həsən səhihdir, bax: əz-Zeylai, "**Nisb ər-Rayə**", 2/105 və "**Tənfih Əhadis ət-Taliq**", 1/91

[66] Bax: "**Təlxis əl-Habir**", 1/104

**soruşdular. Dedi: "Bu şəkildə İbn Lueyhə, Əbu Zubeyrdən, o da Cabirdən, o isə Əbu Qatadədən rəvayət etmişdir və bu, dəlil deyildir. Məşhur olan hədis isə Cabir ibn Abdullahın peyğəmbərdən rəvayət etdiyi hədisdir, Muhamməd bin İshaq bunu Əbən bin Salehdən, o da Mucahiddən, o isə Cabirdən rəvayət edir: "Allahın Elçisi, *salləllahu aleyhi va səlləm*, qiblə istiqamətində bövl etməyimizi nəy etdi, ölümündən bir il əvvəl isə onu qibləyə tərəf yönələrkən gördüm."**[67]

Beləliklə Muhamməd bin İshaqın, Əbən bin Salehdən - Mucahiddən - Cabirdən rəvayət etdiyi isnad, hədis imamlarına görə muttasil bir isnaddır və dəlildir. İmam Buxari və onun tələbəsi İmam ət-Tirmizi bunu dəlil olaraq qəbul ediblər, Əbu Davud onlara tabe olaraq sükut etmişdir. İmam əd-Daraqutni, İbn Hibban, əl-Bəzzar, əl-Hakim və İbn əs-Sakin kimi imamlar bu sənədin səhih olduğunu deyirlər. İmam Nasiruddin əl-Albani də bunun həsən olduğuna hökm etmişdir.[68]

Mucahidin isə Cabirdən rəvayəti muttasildir və əvvəl təqdim etdiklərimizdən aydın olur ki, İmam Əbu Bəkr əl-Bərdicinin, Mucahidin Cabirdən etdiyi rəvayətləri qəbul etməməsi bu məsələdə dəlil ola bilməz, çünki ilk dövr hədis alimləri bunu dəlil olaraq qəbul ediblər. Bu alimlər hədisin və sənədin illətləri üzrə mütəxəssisdirlər. İbn Hacər və İbn Abdilbərr kimi iki böyük hafiz də bunu qəbul etmişdir.

- **Məşhur tabii Abdullah bin Şaqiqin rəvayəti:**

[67] "**əl-İləl**", 6/166 (1047)

[68] Bax: "**Sahih ət-Tərğib**", (367)

Məşhur tabii Abdullah bin Şaqiq əl-Uqeyli, *rahiməhullah*, deyir:

"كان أصحاب محمد لا يرون شيئًا من الأعمال تركه كفر؛ إلا الصلاة"

**"Muhammədin səhabələri namazdan başqa əməllərdən heç birinin tərkini küfr saymazdı."**[69]

Bir başqa rəvayətdə isə gəlir:

ما كانوا يقولون لعمل تركه رجل كفر غير الصلاة ، قال : كانوا يقولون تركها كفر

**"Bir nəfərin tərk etməsinə görə namazdan başqa heç bir əmələ küfr deməzdilər, dedi: "(namazın) tərkinə küfr deyərdilər."**[70]

Hər iki rəvayəti Said bin İyas əl-Cureyri, Abdullah bin Şaqiqdən rəvayət etmişdir. Əl-Cureyridən isə bu üç nəfər rəvayət etmişdir:

(1) Bişr bin Mufaddal,
(2) İsmail bin Aliyyə,
(3) Abdulalə ibn Abdulalə

Bişr bin Mufaddaldan, yuxarıdakı iki ləfzdən birincisini Muhamməd bin Ubeyd, Humeyd bin Məsudə və Quteybə bin Said rəvayət etmişdir. Əl-Hakim bu rəvayəti Qeys ibn Ənifdən, o isə Quteybə bin Saiddən, o isə Bişrdən, o da əl-Cureyridən, o isə Abdullah bin Şaqiqdən və Abdullah isə bunu Əbu Hureyrədən mərfu olaraq rəvayət etmişdir. Lakin doğru olan ət-Tirmizinin yuxarıda gələn ləfz ilə məvquf olaraq rəvayət etməsidir.

---

69 Tirmizi (2622); əl-Hakim (1/48/12); əl-Mərvazi, "**Tazim Qadr əs-Salət**" (2/hədis: 904, 905, 948); "**Riyad əs-Salihin**" (1080);

70 İbn Əbi Şeybə, 6/172

Said ibn İyas əl-Cureyrinin ixtilata düşdüyünü (hafizəsinin korlandığı) söylənilmişdir. Lakin İbn Hibbanın dediyinə görə onun hafizə zəifliyi çox ciddi olmamışdır.[71] Buna görə də İbn Hibbanın tələbələrindən İbn Aliyyə və Yezid ibn Harun adı keçən ravinin hafizəsinin zəif olduğunu inkar etmişdir.[72] Lakin ravinin hafizəsinin zəiflədiyi sabitdir.

Bişr bin Mufaddal, əl-Cureyridən birinci ləfz ilə rəvayət etmişdir və məlumdur ki, Bişr ondan hafizəsi zəifləməmişdən əvvəl rəvayət etmişdir. Bunu bir neçə tərəfdən isbat etmək olar:

1. **Hafiz imamlar bunu təsdiq edirlər.**

Zamanının məşhur imamı əl-Hafiz ibn Rəcəb əl-Hənbəli, *rahiməhullah*, Tirmizinin "əl-İləl" əsərinin şərhində deyir:

وممن سمع منه قبل أن يختلط : الثوري وابن علية وبشر بن المفضل ، وكان ابن علية ينكر أن يكون الجريري اختلط

**"Hafizəsinin zəifləməsindən əvvəl ondan hədis eşidənlər içində əs-Səvri, İbn Aliyyə və Bişr bin Mufaddal vardır. Hətta İbn Aliyyə, əl-Cureyrinin hafizəsinin zəiflədiyini inkar etmişdir."**[73]

Digər hədis imamı əl-Hafiz İbn Hacər əl-Asqalani, *rahiməhullah*, bu barədə deyir:

وما أخرج البخاري من حديثه إلا عن عبد الأعلى وعبد الوارث وبشر بن المفضل ، وهؤلاء سمعوا منه قبل الاختلاط ، نعم وأخرج له البخاري أيضا من رواية خالد الواسطي عنه ، ولم يتحرر لي أمره إلى الآن ، هل سمع منه قبل الاختلاط أو بعده ؟ لكن حديثه عنه بمتابعة بشر بن المفضل كلاهما عنه.

---

[71] "**əs-Siqat**", 6/351

[72] "**əl-Cərh va ət-Tadil**", 1/4

[73] "**Şərh əl-İləl ət-Tirmizi**", səh: 313

**“Buxarinin onun hədislərindən təxric etdikləri yalnız Abdulalədən, Abdulvarisdən və Bişr bin Mufaddaldandır və bu ravilər onun hafizəsi zəifləməmişdən əvvəl hədis eşitmişlər. Doğrusu Buxari eləcədə Xalid əl-Vasitinin ondan rəvayətini də təxric etmişdir və mənə bu ana qədər onun halı aydın deyildir, yəni ondan hafizəsinin zəifləməsindən əvvəl, yoxsa sonra hədis eşidib? Lakin onun hədisinə Bişr bin Mufaddal şahidlik edir və hər ikisi də ondan rəvayət etmişdir.”**[74]

Nəticə olaraq deyirik ki, Bişrin, əl-Cureyrinin ixtilatından əvvəl hədis eşitməsi, sənəddəki illətlər barədə mütəxəssis sayılan alimlər tərəfindən təsdiq olunduğuna görə bunda heç bir şübhəyə yol yoxdur.

2. **Əyyubla qarşılaşanların əl-Cureyridən eşitdikləri hədislər yaxşıdır.**

Əbu Ubeydə əl-Əciri deyir:

سمعت أبا داود يقول : " أرواهم عن الجريري إسماعيل بن علية ، وكل من أدرك أيوب فسماعه من الجريري جيد

**“Əbu Davudu belə deyərkən eşitdim: “əl-Cureyridən bu hədisləri İsmail bin Aliyyə rəvayət etmişdir və Əyyub ilə görüşmüş hər kəsin əl-Cureyridən eşitdiyi hədislər yaxşıdır.”**[75]

Bişr bin Mufaddalın isə Əyyubdan eşitməsi sabitdir. İbn Əbi Hatim “əl-Cərh va ət-Tadil” əsərində gətirdiyi rəvayətlər

[74] “**əl-Hadi əs-Sari**”, səh: 425
[75] ”**Sualət əl-Əciri**”, səh: 339

buna şahidlik edir.[76] Onların hər ikisi də Basra əhlindəndir.

**3. Bişr bin Mufaddalın şahidləri vardır.**

Üstəlik Bişr bin Mufaddaldan başqa Abdulalə ibn Abdulalə eyni rəvayəti yuxarıda təqdim etdiyimiz ikinci ləfz ilə əl-Cureyridən rəvayət etmişdir və bunu İbn Əbi Şeybə təxric etmişdir.

Bütün bunlarla aydın olur ki, Bişrin əl-Cureyridən rəvayətləri səhihdir və Buxari ilə Muslim hər ikisi öz kitablarında Bişrin əl-Cureyridən etdiyi rəvayətləri qəbul ediblər. İbn Kiyəl deyir:

وقد روى الشيخان للجريري من رواية بشر بن المفضّل...

**"Hər iki şeyx (Buxari və Muslim) əl-Cureyridən, Bişr bin Mufaddalın rəvayət yolu ilə rəvayət ediblər..."**[77]

Hədisi əl-Mərvazi mövzu ilə əlaqədar dəlil gətirmişdir, əl-Hakim Əbu Abdullah bunun iki şeyxin şərtlərinə görə səhih olduğunu demişdir.[78] İmam əl-Munziri "Tərğib ət-Tərhib" əsərində[79] hədisi zikr edir və üzərində sükut edir. İmam Munzirinin kitabın müqəddiməsində özünün də qeyd etdiyi kimi üzərində sükut etdiyi hədislərin sihhəti sabitdir. İmam İbn Qudamə hədisi namazı tərk edəni təkfir edənlərin dəlilləri arasında zikr etmişdir.[80] Eləcədə İmam ən-Nəvəvi demişdir: "**İsnadı səhihdir**."[81] Şeyxul-İslam İbn Teymiyyə hədisi bir çox

---

76 "**əl-Cərh va ət-Tədil**", 6/181 (992)
77 "**əl-Kəvakib ən-Neyrat**", səh: 184
78 "**əl-Mustədrək**", 1/48
79 "**Tərğib ət-Tərhib**", 6/214 (810)
80 "**əl-Muğni**", 2/157
81 "**əl-Məcmu Şərh əl-Muhəzzəb**", 3/18; "**Riyad əs-Salihin**" (263)

yerdə zikr edərək sihhətinə şahidlik etmişdir. İmam əz-Zeylai də hədisi zikr edərək deyir: “**Bunun raviləri “əs-Səhih”in raviləridir.**”[82] Sonra İmam əz-Zəhəbi, Əbu Zara əl-İraqi, İmam əs-Saxavi, əs-Suyuti və əl-Albani bu rəvayəti səhih sayıblar.[83]

Abdullah bin Şaqiq əl-Uqeyli isə, *rahiməhullah*, tabiin nəslinin ən böyüklərindəndir. İbn Said onu ilk təbəqədən olan tabiinlər arasında zikr etmişdir və o, Basra əhlindəndir. Şeyxlərinin əksəriyyəti səhabələr olmuşdur. İbn Said onun on üçə yaxın və ya bundan da çox səhabədən hədis eşitdiyini qeyd edir. O, iki yüzdən çox səhabə ilə görüşmüşdür və bunların içində Ömər, Osman, Əli və Əbu Zərr kimi böyük səhabələr olmuşdur.

Bu hədisin dəlil olaraq hökmü qətidir. Bu şəkildə səhabələrin cəm olaraq zikr edilməsi, izafi cəm şəklidir. Abdullah ibn Şaqiq əl-Uqeyli isə tabii nəslinin böyüklərindəndir və görkəmli səhabələr ilə rastlaşmışdır. Bu barədə izah daha sonra gələcəkdir.

## • Xəlifə Ömər ibn əl-Xattabın sözləri

İbnul-Qayyim əl-Cəvziyyə, *rahiməhullah*, mövzu ilə əlaqədar yazdığı kitabında səhabənin icmasına dəlil olaraq deyir:

إجماع الصحابة فقال ابن زنجويه:
حدثنا عمر بن الربيع حدثنا يحيى بن أيوب عن يونس عن ابن شهاب قال

---

[82] ”**Təxric əl-Əhadis va əl-Əsər**”, 1/204

[83] Bax: əz-Zəhəbi, ”**əl-Kəbəir**”, səh: 10; əl-İraqi, ”**Tarh ət-Təsrib**”, 2/141; əs-Saxavi, ”**əl-Əcvibə əl-Mərdiyyə**” (819); əs-Suyuti, ”**Şərh İbn Macə**”, 1/175; əl-Albani, “**Sahih ət-Tərğib**” səh: 367 (564) və “**Sahih ət-Tirmizi**”, (2114)

حدثني عبيدالله بن عبدالله بن عتبة ان عبدالله بن عباس اخبره انه جاء عمر بن الخطاب حين طعن في المسجد قال فاحتملته انا ورهط كانوا معي في المسجد حتى ادخلناه بيته قال فأمر عبدالرحمن بن عوف ان يصلي بالناس قال فلما دخلنا على عمر بيته غشي عليه من الموت فلم يزل في غشيته حتى اسفر ثم افاق فقال هل صلى الناس قال فقلنا نعم فقال لا إسلام لمن ترك الصلاة وفي سياق آخر لا حظ في الاسلام لمن ترك الصلاة ثم دعا بوضوء فتوضأ وصلى وذكر القصة

فقال هذا بمحضر من الصحابة ولم ينكروه عليه وقد تقدم مثل ذلك عن معاذ بن جبل وعبدالرحمن بن عوف وابي هريرة ولا يعلم عن صحابي خلافهم .

وقال الحافظ عبدالحق الاشبيلي رحمه الله في كتابه في الصلاة ذهب جملة من الصحابة رضي الله عنهم ومن بعدهم إلى تكفير تارك الصلاة متعمدا لتركها حتى يخرج جميع وقتها منهم عمر بن الخطاب ومعاذ بن جبل وعبدالله بن مسعود وابن عباس وجابر وابو الدرداء وكذلك روي عن علي ابن ابي طالب كرم الله وجهه هؤلاء من الصحابة ومن غيرهم أحمد بن حنبل وإسحاق بن راهوية وعبدالله بن المبارك وإبراهيم النخعي والحكم بن عيينة وأيوب السختياني وأبو داود الطيالسي وابو بكر ابن أبي شيبة وابو خيثمة زهير بن حرب .

**“Səhabənin icmasına gəldikdə isə İbn Zəncəveyh deyir:**

**Bizə Ömər bin Rabii rəvayət etdi: Yəhya ibn Əyyub bizə Yunusdan, o da İbn Şihabdan rəvayət etdi və dedi: Ubeydullah ibn Abdullah bin Utbə bizə rəvayət etdi ki, Abdullah ibn Abbas ona xəbər verdi: Ömər ibn əl-Xattab məsciddə vurulduğu zaman İbn Abbas onun yanına gəldi. (İbn Abbas) dedi: Mən və mənimlə məsciddə olan bir qrup adam evinə girənə qədər onu daşıdıq. Dedi: (Ömər) Abdurrahmən bin Aufa insanlara namaz qıldırmağı əmr etdi. Dedi: Ömərin evində onun yanına girdiyimizdə o, ölüm huşsuzluğunda idi. Üzünün rəngi açılana qədər ölüm huşsuzluq halı keçmədi və sonra özünə gəldikdən sonra soruşdu: “İnsanlar namazlarını qıldılarmı?” Dedi: Biz dedik: “Bəli!” (Ömər) dedi: “Namazı tərk edənin İslamı yoxdur.” Başqa bir rəvayətdə isə deyir: “Namazı tərk edənin İslamdan**

**nəsibi yoxdur."**[84] **Sonra Ömər dəstəmaz üçün su istədi və dəstəmaz aldı və namaz qıldı. (Ravi) daha sonra qıssanı zikr edir...**

(İbn Zəncəveyh) **dedi: "Bütün bunlar səhabələrin hüzurunda oldu və heç biri onun bu sözünə etiraz etmədi. Bunun bir bənzəri Muaz bin Cəbəl, Abdurrahmən bin Auf və** Əbu Hureyrə**dən gə**lmişdir. Sə**habələrdən bunun əksinə bir rəy bildirən bilinmir.**

Əl-**Hafiz Abdulhaqq əl-İ**şbili, ***rahiməhullah,*** **namaz** haqqında yazdığı bir kitabında deyir: "Sə**habələrin hamısı,** ***radiyallahu anhum*****, və onlardan sonra gələnlər, vaxtı tamamən çıxana qədər qəsdən namazı tərk edə**nin kafir olduğuna hökm **ediblər. Ömər ibn əl-Xattab, Muaz bin Cəbəl, Abdullah bin M**əsud, İbn Abbas, Cabir və Əbud**-Darda bunlardandır. Eynilə bu səhabələrdən eləcədə** Əli ibn Ə**bu Talibdən də, kərramallahu vachəhu, rəvayə**t olunub. Bunlardan başqa **Əhməd bin Hənbə**l, İshaq ibn Rahaveyh, Abdullah ibn **Mubar**ək, İbrahim ə**n-Nəxai, əl-Hakəm bin Uyeynə,** Əyyub **əs-Saxtiyani,** Əbu Davud Tayalisi, Əbu Bə**kr bin** Əbi Şeybə **və** Əbu Heysə**mə Zuheyr bin Hərb də** bu görüşdə**dirlər."**[85]

Hz. Ömərin "*lə həz fil-İsləm limən tərakəs-Saləh*" sözündə "*həz*" kəliməsi "nəsib", "pay" anlamına gəlir. Allahu Təalə deyir:

---

[84] Malik, "**əl-Muvatta**", səh: 45 (84); Daraqutni, "**əs-Sunən**", 2/35 (1732); Abdurrazzaq, (579, 580, 5010); İbn Sad, "**ət-Tabaqat**", 3/350-351; İbn Əbi Şeybə, "**İmən**", səh: 40 (103); Abdullah bin Əhməd, "**Məsail İmam Əhməd**", səh: 55 (193); əl-Mərvazi, "**əs-Salət**", 2/892 (923-931); əl-Xalləl, "**əs-Sunnə**", (1371, 1381, 1388) və "**əl-Cami**", 2/543 (1394); İbn Batta, "**əl-İbənə**", (871, 872, 873); əl-Acurri, "**əş-Şəriah**", (294); əl-Laləkay, "**Şərh Usuli İtiqad Əhl əs-Sunnə**", (1528, 1529); Hz. Ömərin bu sözünə səhabələrin etiraz etməməsi səhabələrin icmasına dəlalət edir, bax: İbn Teymiyyə, "**Şərh əl-Umdə**", 2/75

[85] **"əs-Salət və Hukmu Tərikihə"**, səh: 67-68

" للذكر مثل حظ الأنثيين "

, yəni "**Kişiyə, iki qadının payı qədər**"[86]

İmam İbn Abdilbərr deyir:

وأما قول عمر : لا حظ في الإسلام لمن ترك الصلاة ، فالحظ : النصيب ، يقول : لا نصيب في الإسلام

**"Ömərin sözünə gəldikdə isə: "Namazı tərk edən üçün İslamda heç bir "*həz*" yoxdur" və "*həz*" lüğətdə "nəsib" deməkdir, yəni deyir: "İslamdan nəsibi yoxdur..."**[87]

Hz. Ömərin sözləri namazını tərk edənin dindən çıxması barədə söylədiyi qəti bir ifadədir və bunu dəlilsiz təvil etmək caiz deyildir. İbn Teymiyyə deyir:

إن قول عمر : لا حظ في الإسلام لمن ترك الصلاة ، أصرح شيء في خروجه عن الملة

**"Həqiqətən Ömərin "Namazını tərk edənin İslamdan nəsibi yoxdur" sözü, namazı tərk edənin millətdən çıxması barədə (söylənə biləcək) ən aydın bir ifadədir."**[88]

Eləcədə Alləmə əs-Suyuti, *rahiməhullah*, Ömərin sözlərinin ən aydın şəkildə insanın İslamdan çıxmağına dəlalət etdiyini bildirir:

لا حظ في الإسلام لمن ترك الصلاة ، أخذ بظاهره من كفر بترك الصلاة تكاسلا ، وهو مذهب جمع من الصحابة ، وبه قال أحمد وإسحاق ، ومال إليه الحافظ المنذري في ترغيبه

---

[86] ən-Nisa, 11

[87] "**əl-İstizkar**", 1/235

[88] "**Şərh əl-Umdəh**", 4/83

**“Namazı tərk edənin İslamdan nəsibi yoxdur” sözünün zahirindən namazını tənbəlliklə tərk edənin küfrü mənası çıxır və bu səhabələrin hamısının məzhəbidir, bu, eləcədə Əhməd və İshaqın da rəyidir, əl-Hafiz əl-Munziri “Tərğib” əsərində bu rəyə meyl etmişdir.”**[89]

İmam Əhməd, İshaq bin Rahaveyh və İmam əl-Munziri namazı tənbəllik üzündən tərk edəni təkfir etmişdir. Şübhəsiz ki, Hz. Ömərin yuxarıdakı sözləri, onun namazı tərk edəni müsəlman saymadığına dəlalət edir.

Bu Ömərin öz rəyi olmaqla bərabər səhabələrin icmasına da dəlalət edir, çünki o, bu sözləri səhabələrin hüzurunda demişdir və Allahın dinində səhabələr qədər hökmlərində isabətli olan başqa heç bir qövm yoxdur. Səhabələr isə Ömərin sözünə heç bir etiraz etməmişdir. Hz. Ömərin bu sözləri minbərdə də söylədiyi səhih olaraq rəvayət olunmuşdur. Şeyxul-İslam İbn Teymiyyə deyir:

ولأن هذا إجماع الصحابة ، قال عمر رضي الله عنه : " لا حظ في الإسلام لمن ترك الصلاة " وقصته في الصحيح ، وفي رواية عنه قال : لا إسلام لمن لم يصل ، رواه النجاد. وهذا قاله بمحضر من الصحابة

**“Çünki bu səhabələrin icmasıdır, Ömər, radiyallahu anhu, dedi: “Namazı tərk edənin İslamdan nəsibi yoxdur” və onun qıssası “əs-Sahih”dədir və ondan gələn başqa rəvayətdə deyir: “Namaz qılmayanın İslamı yoxdur”, bunu ən-Nəccad rəvayət etdi. Ömər bunu səhabələrin hüzurunda dedi.”**[90]

Səhabələrin Ömərin bu sözü üzərinə susmaları onların bu məsələdə eyni görüşə sahib olduqlarına dəlildir, yoxsa buna etiraz edərdilər.

---

89 “**Tənvir əl-Havalik bi Şərh Muvatta Malik**”, 1/48

90 “Şərh əl-Umdə”, 4/75

- **Xəlifə Əbu Bəkr əs-Sıddıqın, *radiyallahu anhu*, sözləri**.

Əbu Bəkr zəkatdan böyun qaçıranlar haqqında Ömərə dedi:

والله لأقاتلن من فرق بين الصلاة والزكاة

**“Allaha and olsun ki, namaz ilə zəkatın arasını ayıranlarla vuruşacam.”**[91]

Əbu Bəkrin zəkatı ödəməyənlərə qarşı başlatdığı savaş mürtədlərə qarşı edilmiş savaş olaraq məşhurdur. Alimlər Əbu Bəkrin xəlifəliyi dövründə zəkatı ödəmədiyinə görə öldürülənlərin mürtəd olaraq öldürüldüyünü zikr edirlər. Əbu Bəkrin yuxarıdakı sözləri alimlərin nəzdində güclü bir dəlildir ki, zəkat verməyənlər ona görə mürtəd olmuşdur. Lakin onun sözümüzün mövzumuz ilə əlaqədar tərəfi budur:
Əbu Bəkrin sözləri dəlalət edir ki, zəkatdan fərqli olaraq namazın tərk edilməsi səhabələrə görə təbii olaraq irtida idi. Çünki onun zəkatı məhz namaz ilə qiyas etməsi bunun ən açıq ifadəsidir. əl-Xattabi, *rahiməhullah*, deyir:

قايسه بالصلاة ، ورد الزكاة إليها ، وكان في ذلك من قوله دليل على أن قتال الممتنع من الصلاة كان إجماعاً من الصحابة

**“Onu namazla müqayisə etdi və zəkatı ona götürdü. Onun bu sözü dəlalət edir ki, namazlarını qılmaqdan imtina edənlərə**

[91] əl-Buxari, 2/135 (1399); Muslim, 1/51 (32)

**qarşı vuruşmaq barədə səhabələr icma etmişdilər."**[92]

- **əl-Həsən əl-Basrinin sözləri.**

əl-Həsən əl-Basri, *rahiməhullah*, deyir:

بلغني أن أصحاب محمد كانوا يقولون : " بين العبد وبين أن يشرك فيكفر أن يترك الصلاة من غير عذر"

**"Mənə çatmışdır ki, Muhammədin səhabələri deyərdilər: "Qul ilə onun şikr etməsi və ya küfr etməsi arasında üzr olmadan namazı tərk etmək vardır."**[93]

Əl-Laləkay bunu Ubeydullahdan, o, Əhməddən, o da Əhməd bin əl-Huseyndən, o isə Abdullah bin Əhməddən, o, öz atasından, o da Muhamməd bin Cafərdən, o isə Cafər bin Aufdan, sonuncusu isə əl-Həsəndən rəvayət etmişdir. Yenə Əhməd tariqi ilə bunu İbn Batta rəvayət etmişdir. Əl-Xallal isə bunu Əbu Abdullahdan, o, Muhamməd bin Cafərdən, o da Aufdan, o isə əl-Həsəndən rəvayət etmişdir. Bu əsərin əl-Həsənə qədər isnadı səhihdir.

Əl-Həsən əl-Basri isə tabii nəslinin böyüklərindəndir. Əl-Həsən bu sözləri ilə yuxarıda rəvayət etdiyimiz kimi Abdullah ibn Şaqiqin, Cabir ibn Abdullahın və Ömərin sözlərini təsdiq edir. Onun bu sözləri səhabənin icmasına işarədir. Əl-Həsən əl-Basrinin özünün də şahidlik etdiyi kimi Xorasana tərəf bir ğazvədə onlarla birlikdə üç yüzə yaxın səhabə də var idi. Əgər qarşılaşdığı bu səhabələrdən hər hansı birindən bunun

---

[92] ən-Nəvəvi, "**Şərhu Sahih Muslim**", 2/152

[93] əl-Xalləl, "**əs-Sunnə**", 4/142, (1372); İbn Batta, "**əl-İbanə**", (877); əl-Laləkay, "**Usul İtiqad Əhl əs-Sunnə**", 4/829 (1539)

əleyhinə bir fikir eşitsəydi, təbii ki, bunun icma olduğunu iddia etməzdi.

## • İshaq bin Rahaveyhin sözləri:

İmam əl-Mərvazi, *rahiməhullah,* İshaq ibn Rahaveyhin belə dediyini nəql edir:

سمعت إسحاق يقول صح عن النبي أن تارك الصلاة كافر وكذلك كان رأي أهل العلم من لدن النبي أن تارك الصلاة عمداً من غير عذر حتى يذهب وقتها كافر

**"İshaqı belə deyərkən eşitdim: Peyğəmbərdən səhih olaraq rəvayət olunmuşdur ki, namazı tərk edən kafirdir və eləcədə bu peyğəmbərin vaxtından elm əhlinin rəyidir ki, namazını üzr olmadan vaxtı çıxana qədər qəsdən tərk edən biri kafirdir."**[94]

Bu da səhabənin bu məsələ üzərində icma etdiyinə dəlalət edir. İshaq bunu öz fəhmi üzərinə nəql edərək, hətta namazın bir vaxtının belə vaxtını çıxaranın kafir olduğuna hökm etmişdir. İmam İbn Abdilbərr deyir:

قال إسحاق:
وقد أجمع العلماء أن من سب الله عز وجل ، أو سب رسوله صلى الله عليه وسلم ، أو دفع شيئا مما أنزل الله ، أو قتل نبيا من أنبياء الله ، وهو مع ذلك مقر بما أنزل الله أنه كافر ، فكذلك تارك الصلاة حتى يخرج وقتها عامدا

**"İshaq dedi:**
**"Kim Allahı – Azzə və Cəllə - söyərsə və ya Elçisini, *salləllahu aleyhi va səlləm*, söyərsə və ya Allahın endirdiyindən bir şeyi**

94 "**Tazim Qadr əs-Saləh**", (990)

**inkar edərsə və ya Allahın peyğəmbərlərindən birini öldürərsə və bununla belə Allahın endirdiyini təsdiq etsə belə onun kafir olmasında alimlər icma ediblər və eləcədə namazını vaxtı çıxana qədər qəsdən tərk edən də belədir.”**[95]

Allahı, peyğəmbərini söymək, Allahın endirdiklərini inkar etmək və peyğəmbərləri öldürmək şübhəsiz ki, böyük küfrdür. Namazın da bunların yanında zikr olunması ona görə namazın da qəti şəkildə böyük küfr olduğunu göstərir.

## • İmam Mərvazinin sözləri.

İmam Mərvazi, *rahiməhullah*, deyir:

ذكرنا الأخبار المروية عن النبي صلى الله عليه وسلم في إكفار تاركها، وإخراجه إياه من الملة، وإباحة قتال من امتنع من إقامتها. ثم جاءنا عن الصحابة رضي الله عنهم مثل ذلك، ولم يجئنا عن أحد منهم خلاف ذلك. ثم اختلف أهل العلم بعد ذلك تأويل ما رُوى عن النبي صلى الله عليه وسلم، ثم عن الصحابة رضي الله عنهم في إكفار تاركها...

**“Peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, namazı tərk edənin küfrü, onun millətdən çıxması, namazı qılmaqdan boyun qaçıranın öldürməyin mübah olması barədə rəvayət olunmuş xəbərləri zikr etdik. Daha sonra eləcədə səhabələrdən, *radiyallahu anhum*, eyni hökmü nəql etdik və onlardan heç birindən buna müxalif bir şey gəlməmişdir. Bundan sonra isə elm əhli peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, və daha sonra isə səhabələrdən, *radiyallahu anhum*,**

---

95 “**ət-Təmhid**”, 4/226

**rəvayət etdiklərimizin təvilində ixtilaf etdilər..."**[96]

İmam Muhamməd bin Nasr əl-Mərvazi, *rahiməhullah*, icma haqqında ümmətin ən elmli alimlərindən sayılmışdır. Bunu bir çox alim kitabında qeyd etmişdir. Əl-Xatib əl-Bağdadi onun haqqında deyir:

كان من أعلم الناس باختلاف الصحابة ومن بعدهم في الأحكام

**"Səhabələrin və onlardan sonrakıların hökmlərdə etdiyi ixtilaflar barədə insanlar içində ən elmlisi idi."**[97]

Eləcədə İmam əz-Zəhəbi onun tərcümeyi-halında deyir:

يقال: إنه كان أعلم الأئمة باختلاف العلماء على الإطلاق

**"Deyilir: Həqiqətən o, imamlar içində alimlərin ümumi şəkildə ixtilaflarını ən yaxşı bilən idi."**[98]

İmam Marvəzinin sözlərindən anlaşılır ki, səhabə dönəmində bu barədə heç bir ixtilaf mövcud deyildi, çünki səhabələrin namazı tərk edənin küfrü üzərində icma etmişdilər. Bu məsələdə ixtilaf daha sonra meydana çıxmışdır və daha sonra gələn alimlər səhabənin sözlərinin təvilində ixtilaf etdilər. Lakin bu ixtilaf alimlərin öz ictihadlarına əsasən etdikləri hökmlərin nəticəsidir və yaxud da bəzilərindən bu icma gilzi qalmışdır. Bu səbəbdən əsas olan səhabənin icmasına arxalanmaqdır və bunda alimlərin ixtilafına etimad edilməz. Bu sözlərimizi eləcədə İbn Teymiyyə, *rahiməhullah*, təsdiq edərək deyir:

---

96 "**Tazim Qadr əs-Salət**", 2/925

97 "**Tarix Bağdad**", 3/315

98 "**Siyər Aləm ən-Nubələ**", 14/34

وأما من اعتقد وجوبها مع إصراره على ترك: فقد ذكر عليه المفرعون من الفقهاء فروعا أحدها هذا، فقيل عند جمهورهم: مالك والشافعي وأحمد. وإذا صبر حتى يقتل فهل يقتل كافرا مرتدا، أو فاسقا كفساق المسلمين؟ على قولين مشهورين. حكيا روايتين عن أحمد، وهذه الفروع لم تنقل عن الصحابة، وهي فروع فاسدة

**“Vacibliyinə etiqad edib (namazın) tərki üzərində israr edənə gəldikdə isə: Fiqh alimlərindən məsələni bölərək daha dərindən ələ alanlar məsələdə bəzi xırdalıqları zikr etmişlər və onlardan biri budur: Onların cumhuru – Malik, Şafi və Əhməd – deyir: “Öldürülənə qədər namazı qılmazsa, mürtəd bir kafir kimi öldürülər, yoxsa müsəlmanlardan olan fasiq kimi öldürülər? Bu barədə iki məşhur rəy vardır. Əhmədin özündən hər iki rəy rəvayət olunmuşdur. Lakin məsələdə belə bir bölgü səhabədən nəql olunmamışdır və bu bölgü fasiddir.”**[99]

Belə bir bölgünün fasid olması onun sonradan ortaya çıxması səbəbi ilə deyildir, çünki məlumdur ki, hökmlərdəki bölgülərin çoxu səhabə zamanından sonra ortaya çıxmışdır və əsasən Şəriətin külli qaydaları üzərində qurulmuşdur. Lakin İbn Teymiyyənin bu bölgünü fasid adlandırması, bunun sonradan icad olunmasına görə deyil, səhabələrin icmasına müxalif olmasına görədir.

Yenə İbn Teymiyyə, *rahiməhullah*, buyurur:

وإذا ذكروا نزاع المتأخرين لم يكن بمجرد ذلك أن يجعل هذه من مسائل الاجتهاد التي يكون كل قول من تلك الأقوال سائغا لم يخالف إجماعا ؛ لأن كثيرا من أصول المتأخرين محدث مبتدع في الإسلام مسبوق بإجماع السلف على خلافه والنزاع الحادث بعد إجماع السلف خطأ قطعا

**“Əgər son dövr alimlər bir məsələdə ixtilafın** olduğunu zikr

---

99 “**Məcmu əl-Fətava**”, 22/46-47

**etsələr, bunu hər bir sözünün sələfin icmasına müxalif olmadığından əmin olduğumuz ictihadi məsələlərdən saymaq üçün sadəcə bu ixtilaf kifayət deyildir. Çünki son dövr alimlərin üsulunun çoxu İslamda sonradan icad olunmuş və özündən əvvəlki sələfin icmasına müxalif olan bidət hökmündədir və sələfin icmasından sonra ixtilaf ortaya çıxarmaq tamamilə xətadır.”**[100]

Səhabənin məsələ üzərindəki icması günəşin aydınlığı kimi aydındır və onların sözünü kiçik küfr şəklində təvil etmək, əslində onların üzərində icma etdikləri məsələni inkar etməkdir. Əgər bunun səbəbini soruşsalar cavabımız belə olacaqdır:

Peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, və onun şərəfli səhabələrindən gələn rəvayətlərə əsasən bir çox əməlin tərkinin küfr və ya şirk olduğu və yaxud nifaq olduğu qəbul olunmuş bir məsələdir. Buna görə də alimlər küfrü kiçik və böyük olmaqla iki növə ayırıblar. Səhabələrə görə zəkatı da və digər İslam rükunlarını tərk etmək küfrün bir növüdür. Onlardan gələn rəvayətlər bunu isbat edir. Lakin onların namazı digər islam rükunlarının içindən xüsusi olaraq ayırmaqları bunun böyük küfr olduğuna dəlalət edir.

Əziz müsəlman! Allah sənə rəhm etsin! Bil ki, əgər buna etiraz edərək bunun kiçik küfr olduğunu deyərlərsə, onlardan soruşarıq: Məgər zəkatı tərk etmək kiçik küfr deyilmi?! Bəs orucu və imkanı olduğu halda həcci tərk etmək kiçik küfr deyilmi?! Təbii ki, səhabələr bu əməllərin tərkini küfrün növlərindən görmüşlər. O zaman namazı bu əməllərin içindən ayırmaqları, bu əməli tərk etməyin böyük küfr olduğunu isbat etməzmi? Əlbəttə ki, bu istisna buna dəlalət edir. İbn Teymiyyə deyir:

الرابع: أن قوله : " ليس بين العبد وبين الكفر إلا ترك الصلاة " ،
وقوله : " كان أصحاب محمد صلى الله عليه وسلم لا يرون شيئا من الأعمال

[100] “**Məcmu əl-Fətava**”, 13/26

تركه كفر إلا الصلاة " لا يجوز أن يراد به إلا الكفر الأعظم ، لأن بينه وبين غير ذلك مما يسمى كفرا أشياء كثيرة ولا يقال فقد يخرج عن الملة بأشياء غير الصلاة لأنا نقول : هذا ذكر في سياق ما كان من الأعمال المفروضة وعلى العموم يوجب تركه الكفر ، وما سوى ذلك من الاعتقادات فإنه ليس من الأعمال الظاهرة

**"Dördüncü: (Peyğəmbərin) "Qul ilə küfr arasında namazın tərkindən başqa bir şey yoxdur" sözü və eləcədə (Abdullah bin Şaqiqin) "Muhamməddin, *salləllahu aleyhi va səlləm*, səhabələri namazdan başqa heç bir əməlin tərkini küfr saymazdılar" sözü ilə böyük küfrdən başqa küfrün qəsd olunması mümkün deyildir, çünki bununla və küfr adı verilmiş digərləri arasında bir çox şey vardır və namazdan başqa şeylər üçün "millətdən çıxmışdır" hökmü deyilmir. Beləliklə biz deyirik: Bu, fərz olan və tərk edilməsi ümumi mənada küfr olan əməlləri və zahiri əməllər olmayan etiqadları əhatə edən kontekstdə zikr olunmuşdur."**[101]

Şeyxin sözlərindən aydın olduğu kimi burda namaz kimi əməlin istisna edilməsi, bütün növ əməllərdən ayıraraq edilmiş istisna deyildir. Burdakı istisna fərz olan və tərk olunması ümumi mənada küfr adlandırılmış əməllər içindən istisnadır. Zəkat, Oruc və Həcc kimi və yaxud Cümə namazları kimi əməllər bu növ əməllərdəndir, beləki bu əməllərin tərk edilməsinin küfr olması barədə naslar mövcuddur. Lakin namazın bunların içindən istisna edilməsi, bu əməlin tərkinin böyük küfr olduğuna dəlalət edir.

Əziz müsəlman! Allah sənə rəhm etsin! Bil ki, bu əsərləri təvil edənlər öz görüşlərinə əsasən təvilə baş vurublar. Səhabədən gələn bütün bu əsərləri təvil edənlərdən tələb et ki, səhabələrdən hər hansı birindən bu icmanın əleyhinə hər hansı bir dəlil gətirsin! Əlbəttə ki, o, bunu edə bilməz! O, nəinki

---

[101] "**Şərh əl-Umdəh**", 2/82

səhabədən, heç tabii nəslindən belə bu görüşün əksinə bir dəlil gətirə bilməz. Yalnız Zuhridən fərqli görüş nəql olunmuşdur və Zuhri tabiinin kiçiklərindəndir. Allah onlara rahmət etsin!

## Huzeyfənin başqa sözləri

İmam əl-Acurri, *rahiməhullah*, namazı tərk edənin kafir olması haqqında gətirdiyi dəlillər içində deyir:

قال محمد بن الحسين رضي الله عنه : هذه السنن والأثار في ترك الصلاة وتضييعها، مع ما لم نذكره مما يطول به الكتاب ، مثل حديث حذيفة وقوله لرجل لم يتم صلاته : لو مات هذا ، لمات على غير فطرة محمد صلى الله عليه وسلم. ومثله عن بلال وغيره ما يدل على أن الصلاة من الإيمان ، ومن لم يصل فلا إيمان له ولا إسلام

**"Muhamməd ibn əl-Huseyn, *radiyallahu anh*, dedi: Bunlar namazın tərki barədə sünnət və əsərlərdir və bunlar o qədər boldur ki, bunları zikr etmədiklərimiz ilə kitab sonsuz uzanar. Huzeyfənin hədisi buna misaldır. O, namazlarını tamamlamayan biri haqqında dedi: "Əgər o, ölərsə, Muhammədin, *salləllahu aleyhi va səlləm*, fitrətindən başqa fitrət üzərinə öləcəkdir."**
**Buna bənzər Bilaldan və digərlərindən gələn hədislər dəlalət edir ki, namaz imandandır, kim namaz qılmırsa onun nə imanı vardır, nə də İslamı."**[102]

Buradakı rəvayəti Huzeyfədən Zeyd ibn Vəhb rəvayət etmişdir.[103] Vasil Əbu Vailin isə Huzeyfədən rəvayətindəki ləfz fərqlidir və burada "fitrət" sözü yerinə "sünnət" sözü işlənmişdir.[104] İmam əl-Acurri, *rahiməhullah*, Huzeyfənin bu sözünü namazı tərk edənin küfrü üçün dəlil gətirmişdir. Hafiz ibn Hacər isə deyir:

واستُدِل به علی وجوب الطمأنينة في الركوع والسجود وعلى أن الإخلال بها مبطل للصلاة، وعلى تكفير تارك الصلاة، لأن ظاهره أن حذيفة نفى

102 "**əş-Şəriah**", 1/296
103 əl-Buxari, 1/215 (791); İbn Əbi Dunyə, "**Təhəccud va Qiyam əl-Leyl**", (465); əl-Mərvazi, "**əs-Salət**", (940-942); əl-Xalləl, "**əs-Sunnə**", (1389)
104 əl-Buxari, (389, 808); İbn Batta, "**əl-İbanə**", (892)

الإسلام عمن أخل ببعض أركانها، فيكون نفيه عمن أخل بها كلها أولى، وهذا بناء على أن المراد بالفطرة الدين، قال الخطابي: الفطرة: الملة، أو الدين، قال: ويحتمل أن يكون المراد بها هنا السُّنة، كما جاء: "خمس من الفطرة....." الحديث، ويكون حذيفة قد أراد توبيخ الرجل...

**"Bunu rükuda və səcdədə olarkən mutmain olmağın vacibliyi üçün və bunu tərk etdiyi zaman namazının batil olması üçün dəlil gətirirlər. Eləcədə namazı tərk edənin kafir olmasına da dəlil gətirirlər, çünki hədisin zahirindən görünür ki, Huzeyfə, namazın bəzi rükunlarını pozanın İslamını rədd etmişdir. Bu halda namazını tamamilə tərk edənin İslamının nəfy edilməsi daha doğrudur. Bu hökm, "fitrət" sözü ilə dinin qəsd olunması fikri üzərinə qurulmuşdur. əl-Xattabi deyir: "Fitrət" millət və ya din deməkdir. Dedi: Burada mənanın "sünnət" olması ehtimalı da vardır. Hədisdə gəldiyi kimi: "Beş şey fitrətdəndir..." (əl-hədis). Bu zaman belə çıxır ki, Huzeyfə bununla həmin kəsi azarlamaq istəmişdir..."**[105]

Əziz müsəlman! Görmürsənmi Huzeyfə necə namazlarını tamamlamayan haqqında hökm verir?! Bəs o zaman Huzeyfəyə görə namazlarını heç qılmayanların hökmü nə olmalıdır?! Huzeyfənin Silaya dedikləri sözü dəlil gətirmələri həm mənasızdır, həm də ədalətli deyildir. Səhabə icmasına qarşı Huzeyfənin Silaya dediyi sözləri dəlil olaraq göstərmək çox qəribədir. Halbuki Huzeyfənin sözləri səhabə icmasına zidd deyildir və nə də Huzeyfə bununla namazlarını tərk edənin müsəlman olduğuna hökm etməmişdir. İnsaf sahibləri üçün bütün bu dəlillər kifayət etməlidir.

## Əməlsiz İman yoxdur

---

[105] "**Fəthul-Bari**", 2/275

Şeyx əl-Albani məzkur kitabını sahib olduğu etiqadı üzərində qurmuşdur və ona görə əməllər imanın həqiqətinə daxil deyildir. Başqa cür desək, əməllər iman adlansa da həqiqi imana daxil deyildir. Həqiqi iman dedikdə isə biz, imanın əslini nəzərdə tuturuq və Şeyxə görə əməllər olmasa da həqiqi iman mövcudluğunu sürür. Şeyx əl-Albanidən nəql etdiyimiz sözlərində, *rahiməhullah*, deyir:

**"Bu hədisdə çox mühüm fiqhi faydalar vardır. O, da "lə iləhə illəllah" kəliməsi, namaz və digər rükunlər kimi beş islam ərkanından heç birini yerinə yetirməsə də, sahibini Qiyamət günü atəşdə əbədi qalmaqdan xilas edəcəkdir."**

Bu söz əhli-sünnətin və sələfin əqidəsinə ziddir. Buna görə də qəti şəkildə tənqid olunmalıdır. Beləki, əhli-sünnət imanın səhih olması üçün əməlləri mütləq şəkildə imandan ayrılmaz bir cüz olaraq görmüşdür. Lakin Şeyx əl-Albani bir çox yerdə bunun əksini söyləyərək bu məsələdə əhli-sünnət məzhəbini təsbit etməkdə yanılmışdır. Çünki Şeyxə görə əməllər sadəcə olaraq imanın kamilliyinin şərtidir. Bu isə əhli-sünnətin əqidəsi deyildir. İlk dövr sələf alimlərinin əqidəsinə görə iman qəlb ilə etiqad, dil ilə təsdiq və əzalar ilə əməl etməkdir. Bu üçündən biri olmazsa, insanın da imanı olmaz. Bu barədə Şeyx Saleh əl-Fövzan ilə sual-cavab zamanı belə bir sual verirlər:

**Sual:**

ما حكم من ترك جميع العمل الظاهر بالكلية لكنه نطق بالشهادتين ويقر بالفرائض لكنه لا يعمل شيئاً البتة، فهل هذا مسلم أم لا ؟ علماً بأن ليس له عذر شرعي يمنعه من القيام بتلك الفرائض؟

**"Bütün zahiri əməllərin hamısını tərk edən və şəhadət kəlimələrini söyləyib fərzlərin vacibliyini qəbul edən, lakin onlardan kəsinliklə heç bir şeyə əməl etməyənin hökmü**

**nədir? Bu adam müsəlmandır yoxsa yox? Biz bunu da bilirik ki, onun bu fərzləri yerinə yetirməyə maneə olan heç bir şəri üzrü yoxdur!”**

**Cavab:**

هذا لا يكون مؤمناً، من كان يعتقد بقلبه ويقر بلسانه ولكنه لا يعمل بجوارحه، عطل الأعمال كلها من غير عزر هذا ليس بمؤمن، لأن الإيمان كما ذكرنا وكما عرفه أهل السنة والجماعة أنه قول باللسان واعتقاد بالقلب وعمل بالجوارح، لا يحصل الإيمان إلا بمجموع هذه الأمور، فمن ترك واحداً منها فإنه لا يكون مؤمناً.

**“Bu insan iman gətirmiş sayılmaz. Kim qəlbi ilə inanarsa, dili ilə təsdiq edərsə, lakin əzalar ilə əməl etməzsə, heç bir üzrü olmadan əməllərin hamısını tərk edərsə, bu insan iman gətirmiş sayılmaz. Çünki dediyimiz kimi və əhli-sünnətin qəbul etdiyi kimi iman dil ilə demək, qəlb ilə etiqad etmək və əzalar ilə əməl etməkdir. İman yalnız bunların hamısı bir yerdə olduqda əmələ gələr və kim bunlardan birini tərk edərsə, o insan iman gətirmiş sayılmaz.”**[106]

İmam əş-Şavkani, *rahiməhullah*, deyir:

وسئل عمن في البادية من الأعراب لا يفعلون شيئاً من الشرعيات إلا مجرد التكلم بالشهادة ـ :"وأقول من كان تاركاً لأركان الإسلام وجميع فرائضه ، ورافضاً لما يجب عليه من ذلك من الأقوال والأفعـال ، ولم يكن لديه إلا مجرد التكلم بالشهادتين ، فلا شك ولا ريب أن هذا كافرٌ شديد الكفر حلال الدم

**"Şəriətdən heç bir şeyə əməl etməyən, yalnız şəhadət gətirən ərəb qəbilələrindən olan kəndli bədəvilər haqqında soruşurlar- "Deyirəm: kim İslamın ərkanlarını və bütün fərzləri tərk edərsə və bunların içindən onun üzərinə vacib olan söz və əməllərdən üz döndərərsə və yalnız iki şəhadət**

106 ”**əl-İcabət əl-Muhimmə fi əl-Məşəkil əl-Mudləhəmə**”, səh: 108

**kəliməsi ilə kifayətlənərsə, heç bir şəkk-şübhə yoxdur ki, o, küfrü şiddətli olan kafirdir və qanı halaldır."**[107]

İbnul-Qayyim, *rahiməhullah*, deyir:

مجرد الإقرار والإخبار بصحة رسالته لا يوجب الإسلام إلا أن يلتزم طاعته ومتابعته، وإلا فلو قال: أنا أعلم أنه نبي ولكن لا أتبعه ولا أدين بدينه كان من أكفر الكفار كحال هؤلاء المذكورين وغيرهم، وهذا متفق عليه بين الصحابة والتابعين وأئمة السنة أن الإيمان لا يكفي فيه قول اللسان بمجرده، ولا بمعرفة القلب مع ذلك، بل لا بد فيه من عمل القلب وهو حبه لله ورسولـه وانقياده لدينه، والتزامه طاعته ومتابعة رسوله

**”Sadəcə olaraq xəbərləri və peyğəmbərin risalətinin doğruluğunu təsdiq etmək insanın vacibən müsəlman olduğunu göstərmir, lakin insanın itaətini və tabeçiliyini tələb edir. Əgər bir kəs ”Mən onun peyğəmbər olduğunu bilirəm, lakin ona tabe olmuram və onun dininə riayət etmirəm” deyərsə, adlarını çəkdiyimiz kəslərin və başqalarının halında olduğu kimi kafirlərin ən kafiridir. Bunun üzərinə səhabələr, tabiinlər və sünnət imamları ittifaq etmişdir ki, sadəcə dilin söyləməsi və qəlbin bilməsi iman üçün kifayət etməz. Əksinə qəlbin əməllərinin də olması vacibdir və qəlbin əməlləri isə Allahı və Elçisini sevmək, dininə bağlanmaq və Elçisinə tabe olmaq və itaət etmək mənasına gəlir.”**[108]

Bu sözlər aydın bir məna ifadə edir: **əməlsiz iman yoxdur**. Lakin Şeyx əl-Albani isə bunun əksini söyləyir, yəni ona görə əməlsiz iman vardır və bu, əhli-sünnət etiqadına müvafiq deyildir. Məhz “Hukmu Tərik əs-Saləh” adlı risaləsini də bu etiqadı üzərində qurmuşdur.

---

107 "**Rasail əs-Sələfiyyə-İrşad əs-Səil ilə Dəlil əl-Məsəil**", səh: 43

108 ”**Miftəh Dar əs-Səadə**”, 1/93-94

İmam əş-Şavkani, *rahiməhullah*, deyir:

وذهب جماعة من السلف إلى أنه يكفر ، وهو مروي عن علي بن أبي طالب، عليه السلام، وهو إحدى الروايتين عن أحمد بن حنبل وبه قال عبدالله بن المبارك وإسحاق بن راهويه وهو وجه لبعض أصحاب الشافعي.

وذهب أبو حنيفة وجماعة من أهل الكوفة والمزني صاحب الشافعيي إلى أنه لا يكفر ولا يقتل بل يعزر ويحبس حتى يصلي .

احتج الأولون على عدم الكفر بقول الله عز وجل: { إن الله لا يغفر أن يشرك به ويغفر ما دون ذلك لمن يشاء } وبما سيأتي في الباب الذي بعد هذا من الأدلة ، واحتجوا على قتله بقوله تعالى: { فإن تابوا وأقاموا الصلاة وآتوا الزكاة فخلوا سبيلهم } وبقوله صلى الله عليه وسلم { أمرت أن أقاتل الناس حتى يقولوا لا إله إلا الله ، ويقيموا الصلاة ، ويؤتوا الزكاة ، فإذا فعلوا ذلك عصموا مني دماءهم وأموالهم إلا بحقها } الحديث متفق عليه . وتأولوا قوله صلى الله عليه وسلم: { بين العبد وبين الكفر ترك الصلاة } وسائر أحاديث الباب على أنه مستحق بترك الصلاة عقوبة الكافر وهي القتل ، أو أنه محمول على المستحل ، أو على أنه قد يئول به إلى الكفر أو على أن فعله فعل الكفار.

واحتج أهل القول الثاني بأحاديث الباب . واحتج أهل القول الثالث على عدم

الكفر بما احتج به أهل القول الأول ، وعلى عدم القتل بحديث: { لا يحل دم امرئ مسلم إلا بإحدى ثلاث} وليس فيه الصلاة

**”Sələfdən bir qrup alim kafir olacağı görüşündədir və bu, Əli ibn Əbi Talibdən, *aleyhi əs-saləm*, rəvayət olunmuşdur və Əhməd ibn Hənbəldən gələn iki rəvayətdən biridir. Bu, eləcədə Abdullah ibn Mubarəkin və İshaq bin Rahaveyhin rəyidir. Şafinin əshabından bəziləri də bu görüşdədir.**
**Əbu Hənifə, Kufə əhlindən bir qrup alim və Şafinin dostu əl-Müzəni isə namazı tərk edənin kafir olmadığını və öldürülməyəcəyini söylədi, lakin bununla belə namaz qılana**

qədər onun təzir edilərək həbsdə saxlanılmasını uyğun gördülər.
İlk qrup kafir olmadığına Allah Azzə və Cəllənin bu ayətini dəlil gətirirlər: "Şübhəsiz ki, Allah ona şirk qoşulmasını bağışlamaz və bundan kiçik günahları isə dilədiyinə bağışlayar" və bu bölmədən sonrakı bölmədə gələcək nasları da dəlil olaraq gətirirlər. Öldürülməsinin vacib olması barədə isə Allahu Təalənin bu sözünü dəlil gətirirlər: "Əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onları sərbəst buraxın" və eləcədə peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, bu sözünü dəlil gətirirlər: "İnsanlarla "lə iləhə illə Allah" deyib, namaz qılıb, zəkat verənə qədər vuruşmaqla əmr olundum. Kim bunu edərsə, qanını və malını məndən qorumuşdur, yalnız haqqı müstəsnadır." [109] Hədisin sihhəti üzərində ittifaq olunmuşdur. Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, "qul ilə küfr arasında namazı tərk etmək durur" hədisini və bu mövzudakı digər hədisləri təvil edərək, namazı tərk edənin kafirlərin aqibətinə layiq olduğunu, yəni öldürülməyə haqq qazandığını deyirlər və yaxud da hədisin namazın tərkini halal sayanlara aid olduğunu və yaxud bununla küfrə düşəcəyi kimi və ya bununla məqsədin, bu əməlin kafirlərin əməllərindən olması kimi təvil edirlər.
İkinci görüşün sahibləri isə mövzu barədə gələn hədisləri dəlil gətirirlər. Üçüncü görüşün sahibləri isə kafir olmamağı barədə birinci görüş sahiblərinin gətirdikləri dəlilləri eynilə dəlil gətirirlər. Öldürülməyəcəyinə dair isə bu hədisi dəlil gətirirlər: "Müsəlmanın qanı yalnız bu üç haldan birində halaldır."[110] və burda namazın tərki zikr olunmamışdır."[111]

Bura qədər əş-Şavkani, *rahiməhullah,* görüşləri zikr edir və daha sonra isə deyir:

---

[109] Əbu Davud, (1556)
[110] Əbu Davud, (4502)
[111] "Neylul-Əvtar", 1/341

والحق أنه كافر يقتل ، أما كفره فلأن الأحاديث قد صحت أن الشارع سمى تارك الصلاة بذلك الاسم وجعل الحائل بين الرجل وبين جواز إطلاق هذا الاسم عليه هو الصلاة ، فتركها مقتض لجواز الإطلاق ، ولا يلزمنا شيء من المعارضات التي أوردها الأولون ؛ لأنا نقول : لا يمنع أن يكون بعض أنواع الكفر غير مانع من المغفرة واستحقاق الشفاعة ، ككفر أهل القبلة ببعض الذنوب التي سماها الشارع كفرا ، فلا ملجئ إلى التأويلات التي وقع الناس في مضيقها

**"Doğru olan budur ki, o, kafirdir və öldürülməlidir. Onun kafir olmasının səbəbi budur ki, Allahın namazı tərk edənə bu adı verməsi barədə gələn hədislər səhihdir və Allahın, insan ilə ona bu adın tətbiq olunması arasındakı maneəni namaz sayması barədə gələn hədislər səhihdir. Namazı tərk etmək bu adı ona tətbiq etməyi caiz qılır. Əvvəlkilərin irəli sürdüyü etirazların heç biri bizi bağlamaz. Çünki biz deyirik: Bəzi küfr növlərinin məğfirətə və şəfaətə haqq qazanmağa maneə olmaması mümkündür. Allahın qiblə əhlinə mənsub olan bəzi günahlarına verdiyi küfr adı kimi. İnsanların çətinliklərdə düşdükləri təvillərə yönəlməyimizə heç bir ehtiyac yoxdur."**[112]

İmam əş-Şavkani bu sözlərindən sonra namazı tərk edəni öldürməyin vacib olması üçün dəlilləri zikr edir. Bu, mövzu ilə əlaqədar əş-Şavkaninin görüşüdür. Qeyd etmək lazımdır ki, onun sözlərində qarışıqlıq vardır. Namazı tərk edənin kafir olacağını qeyd edən görüşü tərcih etdikdən sonra, bəzi küfr növlərinin bağışlanıla biləcəyini söyləmişdir. Şeyx əl-Albani ikinci sözünü qəbul edərək, namazı tərk edənə kafir sözünü mütləq şəkildə aid etməsini tənqid etmişdir. İmam əş-Şavkani kitablarında öz etiqadını açıq şəkildə bəyan etmişdir. Ona görə zahirdə əməl olmadan qəlbdə iman ola bilməz. Onun bu barədə

---

112 "**Neylul-Əvtar**", 1/341-342

dediyi sözləri yuxarıda nəql etdik. O zaman belə bir nəticəyə gəlmək olar ki, əş-Şavkani namazı tərk etmək kimi mücərrəd bir əmələ görə təkfir etmir, lakin imkanı olduğu halda ömründə namaz qılmamış və bu hal üzərində ölmüş kəsin küfrünə hökm vermişdir. Bəzi küfr növlərinin bağışlana biləcəyini söyləməsi isə, insanların sahib ola biləcəyi üzrlərə işarədir. Yoxsa, namazı tərk edənin kafir olduğunu söylədikdən sonra, onun küfrünün bağışlanacağını ehtimal etmək ziddiyətdir.

əş-Şavkani digər kitablarında namazı tərk edəni təkfir etmədiyinə işarə edən sözlər işlətmişdir. Beləliklə ona görə mücərrəd bir əməl olaraq namazı tərk etmək küfr deyildir, lakin namazı tamamilə tərk etmək küfrdür. Onun yuxarıda nəql etdiyimiz sözlərindən anlaşılan məna da budur, çünki o, əməlsiz imanın olmadığını açıq şəkildə bildirir.

## Böyük küfr sahibləri Allahın məşiyyəti altında deyildir.

Əhli-Sünnət alimləri icma edərək bildirmişlər ki, böyük küfr üzərində ölən kəslərə məğfirət yoxdur və bu məsələ üzərində ümmətin alimlərindən heç biri tənəzzu etməmişdir. Əl-Hələbi yenə məzkur kitabın müqəddiməsində deyir:

كما هو معروف من قاعدة الوعد والوعيد عند أهل السنة فيما قرره شيخ الإسلام ابن تيمية رحمه الله في مواضع عدة من كتبه ك " مجموع الفتاوى " وغيره .
وخلاصة القول في هذه القاعدة :
أن نصوص الوعيد داخلة تحت مشيئة الله سبحانه إما عفوا وإما تنفيذا .
وأما نصوص الوعد فإن الله منفذها كما كتب - سبحانه - على نفسه .
وفي ذلك يقول من يقول من أهل العلم مستدلا على أصل هذه القاعدة :
وإني وإن أوعدته أو وعدته
لمخلف إيعادي ومنجز موعدي

**"...əhli-sünnətə görə vad və vaid [113] qaydasından məlum olduğu kimi və Şeyxul-İslam İbn Teymiyyə, *rahiməhullah*, bir çox yerdə, "Məcmu əl-Fətava" kimi və başqa kitablarda bunu istifadə etmişdir:**
**Bu qaydanın xülasəsi belədir:**
**Vaid ilə əlaqədar naslar Allahın – Subhənəhu – məşiyyəti altındadır, ya bağışlayar, ya da vaidini yerinə yetirər.**
**Vad ilə əlaqədar naslara gəldikdə isə, Allahın – Subhənəhu – öz üzərinə vacib etməsi səbəbi ilə bunu yerinə yetirəcəkdir. Bu səbəblə elm əhlindən bu qaydanı üsulda dəlil gətirənlər deyirlər:**
**"Mən vaid və ya vad ilə əlaqədar söz desəm, vaiddən**

[113] "Vad": Quran və sünnətdə Allah qullarını mükafatlandırcağına dair söz vermişdir, yəni vəd vermişdir. Buna Allahın "vad"ı deyilir. "Vaid": Quran və Sünnətdə Allahın qullarına etdikləri günahlar qarşığında əzab edəcəyini deyərək təhdid etmişdir. Buna da Allahın "vaid"i deyilir. "Vad və vaid" deyildikdə bu, nəzərdə tutulur.

**dönərəm, lakin vadın üzərində qalaram.”**[114]

Əl-Hələbinin yuxarıdakı sözləri ilə nəyi qəsd etdiyini anlamaq olmur. Çünki onun gətirdiyi qayda böyük günah sahiblərinə aiddir, yoxsa küfr və ya şirk dərəcəsinə çatmış günahlara şamil edilməz. Axı Allahı söyən, din ilə lağ edən və ya bütlərə ibadət edənlərə yuxarıdakı qaydanı necə aid etmək olar?! Hər şeydən əvvəl namazlarını üzrsüz olaraq tamamilə tərk edənin müsəlman olduğunu isbat etmək lazımdır və daha sonra bu qaydanın mövzumuza aidiyyatı üzə çıxmış olar.

## Şəfaət hədisindəki şübhə

[114] “**Hukm Tərik əs-Saləh**”, səh: 18-19

Şeyx əl-Albani, *rahiməhullah,* kitabında şəfaət barəsində bir hədisi zikr edir:

روى الإمام معمر بن راشد في ( الجامع ) ( 11 / 409 - 411 ) - الملحق ب مصنف عبد الرزاق ) عن زيد بن أسلم عن عطاء بن يسار عن أبي سعيد الخدري - رضي الله عنه - قال :
قال رسول الله صلى الله عليه وسلم :
( إذا خلص المؤمنون من النار وأمنوا ف [ والذي نفسي بيده ] ما مجادلة أحدكم لصاحبه في الحق يكون له في الدنيا بأشد من مجادلة المؤمنين لربهم في إخوانهم الذين أدخلوا النار .
قال : يقولون : ربنا إخواننا كانوا يصلون معنا ويصومون معنا ويحجون معنا [ ويجاهدون معنا ] فأدخلتهم النار
قال : فيقول : اذهبوا فأخرجوا من عرفتم منهم .
فيأتونهم فيعرفونهم بصورهم لا تأكل النار صورهم [ لم تغش الوجه ] فمنهم من أخذته النار إلى أنصاف ساقيه ومنهم من أخذته إلى كعبيه [ فيخرجون منها بشرا كثيرا ] فيقولون : ربنا قد أخرجنا من أمرتنا .
قال : ثم [ يعودون فيتكلمون ف ] يقول : أخرجوا من كان في قلبه مثقال دينار من الإيمان .
[ فيخرجون خلقا كثيرا ] ثم [ يقولون : ربنا لم نذر فيها أحدا ممن أمرتنا .

ثم يقول : ارجعوا ف ] من كان في قلبه وزن نصف دينار [ فأخرجوه فيخرجون خلقا كثيرا ثم يقولون : ربنا لم نذر فيها ممن أمرتنا . . . ] . .
حتى يقول : أخرجوا من كان في قلبه مثقال ذرة [ فيخرجون خلقا كثيرا ] .
قال أبو سعيد :
فمن لم يصدق بهذا الحديث فليقرأ هذه الآية :
[ إن الله لا يظلم مثقال ذرة وإن تك حسنة يضاعفها ويؤت من لدنه أجرا عظيما ]
قال : فيقولون : ربنا قد أخرجنا من أمرتنا فلم يبق في النار أحد فيه خير
قال : ثم يقول الله : شفعت الملائكة وشفعت الأنبياء وشفع المؤمنون وبقي أرحم الراحمين .
قال : فيقبض قبضة من النار - أو قال : قبضتين - ناسا لم يعملوا لله خيرا قط

قد احترقوا حتى صاروا حمما .
قال : فيؤتى بهم إلى ماء يقال له : ( الحياة ) فيصب عليهم فينبتون كما تنبت الحبة في حميل السيل [ قد رأيتموها إلى جانب الصخرة وإلى جانب الشجرة فما كان إلى الشمس منها كان أخضر وما كان منها إلى الظل كان أبيض ] .
قال : فيخرجون من أجسادهم مثل اللؤلؤ وفي أعناقهم الخاتم ( وفي رواية : الخواتم ) عتقاء الله .
قال : فيقال لهم : ادخلوا الجنة فما تمنيتم ورأيتم من شيء فهو لكم [ ومثله معه ] [ فيقول أهل الجنة : هؤلاء عتقاء الرحمن أدخلهم الجنة بغير عمل عملوه ولا خير قدموه ] .
قال : فيقولون : ربنا أعطيتنا ما لم تعط أحدا من العالمين
قال : فيقول : فإن لكم عندي أفضل منه
فيقولون : ربنا وما أفضل من ذلك ؟
[ قال : ] فيقول : رضائي عنكم فلا أسخط عليكم أبدا

İmam Mamər bin Raşid (Abdurrazzaqın Musənnəf əsərinə əlavə edilən 11/406-411) “Cami” isimli əsərində Zeyd bin Əsləmdən, o da Ata bin Yasirdən, o da Əbu Said əl-Xudridən rəvayət etdi ki, peyğəmbər, *salləllahu aleyhi va səlləm*, buyurur: “...Nəhayət möminlər atəşdən qurtulduqları zaman, nəfsim əlində olana and olsun ki, möminlərin atəşdə olan qardaşları haqqında Rəbbləri ilə mücadilə etmələri sizdən birinizin dünyada ikən öz haqqı üçün qardaşı ilə mücadilə etməsindən daha şiddətlidir. Onlar: “Ey Rəbbimiz! Bu (cəhənnəmdə) qalan qardaşlarımız bizim ilə bərabər namaz qılır, oruc tutar və həcc edər və (cihad edərdilər!) Lakin onları atəşə saldın.” deyirlər. Dedi: Onlara deyiləcəkdir: “Gedin! Tanıdığınız kimsələri oradan çıxarın!” Onlar gələcəklər və onları surətlərindən tanıyacaqlar, çünki atəş surətlərini yandırmayacaq (üzə toxunmayacaq)!” Atəş onlardan kimisinin baldırlarının yarısına qədər, kimisinin də topuqlarına qədər yandırır. Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra: “Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsə qalmadı!” deyirlər. Sonra möminlər təkrar geri dönüb yenə də (Allaha müraciət) edərlər. Allah

buyurar: “Geri dönün! Qəlbində bir dinar ağırlığında iman və yəqinlik olan hər kimi tanıyırsınızsa onu da oradan çıxarın!” Onlar yenə də bir çoxlarını oradan çıxarırlar. Sonra yenə: “Ey Rəbbimiz! Cəhənnəm içərisində əmr etdiklərindən heç kimsəni buraxmadıq!” deyirlər. Allah buyurur: “Geri dönün! Qəlbində yarım dinar ağırlığında xeyir olan hər kimi tanıyırsınızsa onu da oradan çıxarın!”. Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra təkrar: “Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsəni buraxmadıq!” deyirlər. Allah buyurur: “Geri dönün! Qəlbində zərrə ağırlığında xeyir olan hər kimi tanıyırsınızsa onu oradan çıxarın!”. Yenə bir çox insanları oradan çıxarırlar.

Əbu Səid dedi:

“Əgər kim bu hədisə inanmırsa bu ayəni oxusun: “Həqiqətən Allah zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə onu iki qat artırar və öz tərəfindən də böyük mükafat verər”[115].

Sonra təkrar: “Ey Rəbbimiz! Orada xeyir sahibi olan heç bir kimsəni buraxmadıq!” deyirlər.

Dedi: “Bundan sonra Allah buyurur: “Mələklər şəfaət etdilər, peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər. Şəfaət etməyən bir Ərhamur-Rahimin qaldı. Bundan sonra atəşdən bir camaatı toplayır və dünyada ikən heç bir xeyr işləməyib cəhənnəmdə yanıb kömürə dönmüş bir çox kimsələri çıxarır. Onlar Cənnətin yolları üzərində olan “Həyat Çayı” adı verilən bir çaya salınırlar. Onlar selin gətirdiyi yabanı reyhan toxumları kimi çıxırlar. Siz onun bəzən bir daş və ya bir ağac dibində bitdiyini görmüsünüz, günəşə tərəf olan hissəsi yaşıl, kölgədə qalan hissəsi isə açıq olur. Dedi: “(Çaydan) cəsədləri mirvari tək çıxacaqlar və boyunlarında qızıl halqa olacaqdır (başqa rəvayətdə isə “halqalar”): “Allahın azad etdikləri” (yazılacaqdır.)

Allah buyurur: “Cənnətə girin! Meyl etdiyiniz və gözünüzün

---

[115] ən-Nisa, 40

**görə bildiyi hər nə varsa və bir o, qədəri də sizindir!" deyilir. Cənnət əhalisi onlar haqqında: "Bunlar Rahmanın azad etdikləridir. Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda Cənnətə saldığı kimsələrdir."**

**Onlar: "Ey Rəbbimiz! Sən aləmlərdə heç kəsə vermədiyin yaxşılığı bizə verdin!"**

**Onlara: "Sizə bundan gözəl bir şey vardır!"**

**Onlar: "Ey Rəbbimiz! Bundan da gözəl?!"**

**Allah buyurur: "Mənim rizam! Artıq bundan sonra sizə əbədiyyən qəzəb etməyəcəyəm!"**[116]

Qeyd etmək lazımdır ki, Şeyx, *rahiməhullah*, kitabını bu hədisin üzərində qurmuşdur, daha dəqiq desək bu hədisdən anladığı məna üzərində qurmuşdur. Bir çoxları bu sözlərə tabe olaraq hədisi Şeyx əl-Albaninin izah etdiyi mənaya görə qəbul ediblər. Şeyx əl-Albani kitabında eləcədə bu hədisi öz etiqadına uyğun olaraq təvil etmiş və daha sonra İbn Əbi Cəmrənin söylədiklərinə etiraz etmişdir.

Biz şəfaət hədislərini doğru anlamaq üçün onların müxtəlif rəvayət yollarını və müxtəlif mətnlərini bir arada topladıq və bunu kitabımızın sonunda ayrı bir bölüm halına gətirdik. Bununla həm şəfaət hədislərinin təxrici barədə müstəqil bir araşdırma təqdim etmiş oluruq, həm də hədisdəki mövzumuz ilə əlaqədar olan və irəli sürülmüş iddialara cavab verməyimiz asanlaşmış olur. Bunu bir çox tərəfdən isbat etdikdən sonra İbn Əbi Cəmrənin doğru dediyini anlamış oluruq.

## Şəfaət hədislərinin isbat etdiyi mənalar

[116] "**Hukm Tərik əs-Saləh**", səh: 26-29

Bu hədislərdə müsəlmanlara qaranlıq qalan bəzi məqamlar mövcuddur. "*Heç bir xeyir əməl etməyənin Cənnətə daxil olması*" kimi şübhələr bu məqamlardan biridir. Lakin qarşıda – Allahın izni ilə - bunları izah edəcəyik!

Bir çoxları xəta edərək şəfaət hədislərindən bəzilərini nəql edərək müəyyən bir mövzuda dəlil gətiməyə çalışırlar. Bununla da digər rəvayətlərin məhdudlaşdırdığı və ya genişləndirdiyi mənalar gizli qalmaqdadır. Belə bir halda üzərimizə düşən vəzifə budur ki, bu rəvayətləri cəm edərək onların bizə çatdırdığı və üzərində ittifaq etdikləri mənaları üzə çıxarmaqdır. Kitabın sonunda topladığımız bu hədislərə əsasən bu mənaları aşağıdakı kimi müəyyən edə bilərik:

1. Tövhid əhli atəşdə günahları miqdarında qaldıqdan sonra Cənnətə daxil olacaqlar.

2. Muvahhidlər atəşdən şəfaətçilərin şəfaəti ilə, həm də Allahın rahməti ilə çıxacaqlar. Bütün şəfaətçilərin şəfaətindən sonra Allah Azzə və Cəllə öz rahməti ilə "lə iləhə illə Allah" deyənləri atəşdən çıxaracaq. Ona görə də alimlər bu iki sinif arasında fərq görürlər. 1) Şəfaətçilərin şəfaəti ilə atəşdən çıxanlar və 2) yalnız Allahın rahməti ilə çıxanlar.

3. Peyğəmbərimiz, *salləllahu aleyhi va səlləm*, öz ümməti üçün bir çox dəfə şəfaət edəcək. Bunlardan xüsusilə iki cür şəfaət seçilməkdədir:
   **Birinci:** "*Məqamu Mahmud*": bu növ şəfaət bütün insanlar üçün olacaqdır və Muhamməd, *salləllahu aleyhi va səlləm*, insanların hesaba çəkilməsinin tezləşdirilməsi üçün şəfaət edəcəkdir və bu, Siratdan əvvəl olacaq. İmam İbn

Xuzeymə bunu “ət-Təvhid” kitabında bəyan etmişdir.[117]
**İkinci:** Ümmətindən atəşdə olanların ordan çıxarılması üçün şəfaət edəcəkdir.

4. İbn Xuzeymə qeyd edir ki, qəlbində zərrə qədər və ya hədisdə zikr olunduğu qədər iman olan hər kəsin çıxarılması peyğəmbərə, *salləllahu aleyhi va səlləm*, əmr edildikdə onlardan yalnız bəziləri çıxarılacaq. Onların hamısı çıxarılmayacaq.[118] Eləcədə möminlər şəfaət etdikdə yalnız öz tanıdıqlarını çıxara biləcəklər, çünki bu hədislərin zahiri mənasından anlaşılır. Bununla da aydın olur ki, “qəlbində zərrə qədər iman olan kəslərin” atəşdən çıxarılması əmr edildikdə, onların hamısı oradan çıxarılmayacaqdır. Yalnız onlardan bir qismi çıxarılacaqdır.

5. Möminlərin şəfaəti peyğəmbərlərin şəfaətindən əvvəl olacaqdır. Bu hədislərə görə sabitdir. Lakin peyğəmbərimizin “**mən şəfaətçilərin ilkiyəm**” sözü buna zidd deyildir. Çünki bu şəfaət atəşdən müvahhidlərin çıxması üçün edəcəyi şəfaət deyil, əksinə hesabın başlanması və ümmətlərin ayrılması üçün edəcəyi şəfaətdir. İbn Xuzeymənin də qeyd etdiyi kimi tərtib bu şəkildə olmalıdır: 1) peyğəmbərimizin şəfaəti, 2) bu ümmətdən olan möminlərin şəfaəti və 3) digər peyğəmbərlərin şəfaəti və sonra isə 4) qabzə əhli çıxacaqdır. Qabzə əhli isə məxluqun şəfaəti ilə deyil, əl-Cabbarın rəhməti ilə atəşdən çıxanlara deyilir.

6. Qabzə əhli və ya Allahın rəhməti ilə çıxanlar Cəhənnəmdən çıxan sonuncu kəslər olacaqdır. Lakin hədislərdə qeyd olunan, Cəhənnəmdən çıxan sonuncu kəs və Cənnətdə gördüyünün on misli qədər nemət verilən kəs

---

[117] ”**ət-Təvhid**”, 2/600
[118] Bax: “ət-Təvhid”, 2/727-729

barədə isə ixtilaf vardır. Bəzilərinə görə o, nə şəfaətçilərin şəfaəti ilə, nə də qabzə əhlindən biri olaraq çıxacaqdır, lakin öz saleh əməllərinə görə çıxacaq. İbn Xuzeyməyə görə o, qabzə əhlindən əvvəl çıxarılmışdır, lakin Cənnətə isə sonuncu daxil olacaq! Doğrusunu Allah bilir!

7. Möminlər şəfaət edərək öz qardaşlarını atəşdən çıxardıqda, onları səcdə izlərinə görə deyil, üzlərindən tanıyacaqlar. Buna Əbu Saidin hədisi dəlalət edir: **"Tanıdıqlarınızı oradan çıxarın və üzlərinə baxıb onları tanıyacaqlar."**

 Lakin səcdə izlərindən tanınaraq çıxarılanlar isə Allahın mələklərinə çıxarılmasını əmr etdiyi kəslər olacaqdır və bunlar qabzə əhlidir, yəni Allahın rahməti ilə sonuncu olaraq atəşdən çıxanlardır və buna Əbu Hureyrənin rəvayət etdiyi hədislər dəlalət edir.

8. Qabzə əhlinə xas olan bir çox sifətlər vardır və hədisləri cəm edərək bunları belə yekunlaşdırmaq olar:

1) Cəhənnəmdən kömür kimi, yanaraq qaralmış halda çıxacaqlar: Qadi İyad, *rahiməhullah*, deyir:

ولا يبعد أن الامتحاش يختص بأهل القبضة...

**"Yanmaq sifətinin qabzə əhlinə xas olmasının mümkünlüyü uzaq deyildir..."**[119]

2) Cənnət çaylarında yuyunaraq ot kimi bitəcəklər
3) Onlara "Allahın azadlıları" deyiləcək
4) Cəhənnəm əhli onlara tənə edərək onların muvahhid olduqları halda atəşə düşdüklərini və İslamın onları xilas etmədiyini iddia edəcəklər. Bundan sonra isə Allah öz rəhməti ilə onları ordan çıxaracaq.

---

[119] "**Fəthul-Bari**", 11/457

5) Onların hamısı Cəhənnəmdən sonuncu olaraq məxluqatın şəfaəti ilə deyil, Allahın rəhməti ilə çıxacaqlar.
6) Mələklər onları səcdə izlərindən tanıyacaqlar.

Bütün bunlar hədislərdən çıxan və mövzumuz ilə əlaqədar olan əsas xüsusiyyətlərdir. Bu məsələdə sözümüzü bir qədər uzatmışıq və mövzu ilə əlaqədar gələn hədisləri sənədləri ilə birlikdə təqdim etmişik.

## Müxaliflərin bu hədisləri dəlil gətirmələrinə

## cavabımız

Əziz müsəlman! Allah sənə rəhm etsin! Səmimi müsəlmanlar məsələdə haqqı öyrənmək arzusunda olduqları halda, bu hədislər qarşısında bir qədər çətinlik çəkirlər. Onların qarşısında tam bir təsəvvür olmadığı halda, ayrı-ayrı hədislər mövzunu anlamaqda və ya haqqı görməkdə çətinlik yaradır. Şəfaət hədisləri bəziləri üçün qaranlıq qalan məsələlərdəndir. Bu hədisləri namazı tərk edənin müsəlman olacağını isbat etmək üçün dəlil gətirirlər və bununla da elə təsəvvür yaradırlar ki, ömrü boyu Allaha imkanı olduğu halda səcdə etməyən kəslər Qiyamət günü Allahın rahməti ilə atəşdən çıxarılaraq Cənnətə daxil olacaqlar. Belə bir etiqadın nəticəsində müsəlmanlar arasında namazın əhəmiyyəti çox zəifləmişdir və bir çoxları hətta bunun küfr olmadığını düşünərək səhlənkarlıq etməyə başlayıblar. Belə bir cəhalətdən Allaha sığınırıq! Məgər Allahın Elçisi buna dəvət edirdi?! Allah Böyükdür! Bütün bunlar insanlar ilə Allah arasındakı iman bağlarını zəiflətməkdən başqa heç bir şeyə gətirib çıxarmır. Müvəffəqiyyət Allahdandır və Allahın izni ilə bu şəfaət hədislərinə açıq bir şəkildə cavab verəcəyik.

## Heç bir xeyir işləməyənlər

Əbu Said əl-Xudrinin hədisində zikr olunan ibarə, bir çox müsəlman üçün anlamaqda çətinlik törədən ibarələrdən biridir. Əbu Saidin hədisində deyilir:

فيقبض قبضة من النار ناسا لم يعملوا لله خيرا قط قد احترقوا حتى صاروا حمما

**“Bundan sonra atəşdən bir camaatı toplayır və dünyada ikən <u>heç bir xeyr işləməyib</u> cəhənnəmdə yanıb kömürə dönmüş bir çox kimsələri çıxarır...”**

Bu söz, məsələni araşdıranlar üçün ağır gəldi və bunun məsələdə müxaliflərin leyhinə qəti bir dəlil olduğunu zənn etdilər. Lakin məsələnin həqiqəti onların zənn etdiyi kimi deyildir!

“<u>Heç bir xeyir əməl etməmiş</u>” sözü ərəblərdə bir işin naqisliyini izah etmək üçün söylədikləri kəlimədir. Bununla tamamilə bütün əməlləri xaric etmək qəsd olunmur. İmam İbn Xuzeymə, *rahiməhullah*, deyir:

هذه اللفظة: "لم يعملوا خيرًا قط" من الجنس الذي يقول العرب: ينفى الاسم عن الشيء، لنقصه عن الكمال والتمام، فمعنى هذه اللفظة على هذا الأصل: "لم يعملوا خيرًا قط" على التمام والكمال، لا على ما أوجب عليه، وأمر به، وقد بَيَّنْتُ هذا المعنى في مواضع من كتبي.

**“Bu söz, yəni “heç bir xeyir işləməmiş” ibarəsi, ərəblərin istifadə etdiyi kəlimələr növündəndir. Bir şey kamil olmaqdan və ya tamam olmaqdan naqis qaldıqda, ondan bu adı nəfy etmək üçün istifadə etdikləri bir ləfzdir. Bu sözün mənası bu əslə dayanır: <u>“Heç bir xeyri” tam şəkildə və mükəmməl olaraq “işləməmiş</u>” deməkdir, yoxsa “ona vacib olanı və ya əmr olunanı qətiyyən etməmişdir” anlamına gəlməz. Bu mənanı kitablarımda bir çox mövzuda izah etmişəm.”**[120]

Əbu Bəkr İbn Xuzeymə isə, *rahiməhullah*, bu ümmətin ən görkəmli imamlarındandır. İshaq bin Rahaveyhdən hədis dinləmişdir və İmam Şafinin katibi İmam əl-Muzəninin

---

[120] İbn Xuzeymə, “**ət-Təvhid**”, 2/732; bax: “**Fəthul-Bari**”, 13/429

əshabındandır və İmam əl-Buxarinin şeyxi olmuşdur. İbn Xuzeymənin söylədiyi sözlər hədisdəki mənanın anlaşılması üçün ən uyğun olan mənadır.

"*Heç bir xeyir işləməmiş*" sözü ilə, qətiyyən heç bir əməl etməmək qəsd olunmur. Əksinə əməllərinin naqis olduğu və yaxud da pis əməllərinin çoxluğu səbəbi ilə digər əməllərinin heç bir xeyri olmadığı anlamındadır. Sözün bu mənasını təsdiq edən dəlillər peyğəmbərimizin, *salləllahu aleyhi va səlləm*, hədislərində də gəlmişdir. Bu hədislərdən birini İmam Muslim rəvayət etmişdir və bu, məşhur bir hədisdir. Keçmiş ümmətlərdən birində yüz nəfəri qətl etmiş bir qatil peşmanlıq hiss edir və tövbə etmək üçün möminlərin yaşadığı şəhərə yola düşür:

فانطلق، حتى إذا نَصَفَ الطريق، أتاه الموت، فاختصمت فيه ملائكة الرحمة وملائكة العذاب، فقالت ملائكة الرحمة: جاء تائبًا، مقبلاً بقلبه إلى الله، وقالت ملائكة العذاب: إنه لم يعمل خيرًا قط، فأتاهم ملك في صورة آدمي

**"O, yola düşdü və yolun yarısını qət edər etməz ölümlə üzləşdi. Mərhəmət mələyi ilə əzab mələyi arasında mübahisə çıxdı. Mərhəmət mələyi dedi: "O, tövbə edərək və qəlbində peşmanlıq duyaraq Allaha gəldi!" Əzab mələyi isə dedi: "O, heç bir xeyir işləməmişdir!" Sonra insan surətində bir başqa mələk gəldi..."**[121]

Bu hədisdəki ləfz ilə Şeyx əl-Albaninin dəlil olaraq gətirdiyi hədisdəki ləfz, hər bir hərfinə qədər eynidir. Heç şübhəsiz ki, bu ibarə bəzilərinin zənn etdikləri anlama gəlmir, lakin yuxarıda İbn Xuzeymənin göstərdiyi anlamı əhatə edir. Çünki hədisdə sözü gedən qatil tövbə etməsinə və bunun üçün hicrət etməsinə baxmayaraq əzab mələyi onun "heç bir xeyir işləmədiyini" deyir. Halbuki, ən azından onun Allah üçün hicrət

121 Muslim, Kitəb ət-Tövbə, (766)

etməsi zahiri əməllərdəndir. İmam Əhmədin rəvayət etdiyi digər bir hədisdə isə peyğəmbər, *salləllahu aleyhi va səlləm*, deyir:

كان رجل مِمَّنْ كان قبلكم لم يَعْمَلْ خَيْرًا قَطُّ إلا التَّوْحِيدَ فلما احْتُضِرَ قال لِأَهْلِهِ انْظُرُوا إِذَا أنا مِتُّ أن يحرقوه حتى يدعوه حمما ثم اطحنوه ثم اذروه في يوم ريح فلما مات فعلوا ذلك به فإذا هو في قبْضة اللَّهِ فقال اللَّهُ عَزَّ وَجَلَّ يا ابْنَ آدم ما حملك على ما فعلت قال أي رب من مخافتك قال فغفر له بها ولم يعمل خيرا قط إلا التوحيد

**“Sizdən əvvəlki qövmlərdə bir kişi var idi. Tövhiddən başqa heç bir xeyir əməl etməmişdi. Ölüm ayağında olarkən öz ailəsinə dedi: “Baxın! Əgər mən ölərsəm, məni qap-qara olana qədər yandırın! Sonra məni kül edin və bir gün mənim külümü küləyə səpin!” Öldüyü zaman bunu etdilər. Allahın hüzuruna çıxarıldığı zaman gəldikdə, Allah Azzə va Cəllə dedi: “Ey Adəm övladı! Səni bu etdiyinə sövq edən nə oldu?” Həmin kəs dedi: “Ey Rəbb! Sənin qorxundan bunu etdim!” Dedi: Onu buna görə bağışladı və o, tövhiddən başqa heç bir xeyir işləməmişdi!**[122]

---

[122] Əhməd, 2/304 (8261). Bunu Əbu Kamildən, o da Haməddən, o da Sabitdən, o isə Əbu Rafidən, o da Əbu Hureyrədən rəvayət etmişdir. Bu rəvayət haqqında əl-Heysəmi deyir:

ورجال سند أبي هريرة رجال الصحيح

**”Əbu Hureyrənin hədisinin sənədindəki ravilər ”əs-Səhih”in raviləridir.”**

”Mucmə əz-Zəvaid”, 10/195

Bu ziyadənin zikr olunduğu digər rəvayət isə yenə İmam Əhməd tərəfindən (1/398) Yəhya bin İshaqdan, o da Həməd bin Səlimədən, o da Asim bin Bəhdələdən, o da Əbu Vaildən, o isə Abdullah ibn Məsuddan məvquf olaraq rəvayət etmişdir və əl-Heysəmi ”Mucmə əz-Zəvaid” əsərində (10/194) sənədinin həsən olduğunu dedi. Eləcədə Şeyx əl-Arnavut ”əl-Musnəd”in hamişində həsən olduğunu demişdir. Yenə Əhməd ”Müsnəd”ində (2/304) mürsəl, zəif sənədlə rəvayət etmişdir. Lakin bu ziyadə səhihdir və Şeyx əl-Albani ”əs-Səhihə”

Yuxarıdakı ləfz ilə İmam Əhməd rəvayət etmişdir. Digər rəvayətlərdə "tövhiddən başqa" sözü keçmir. Lakin siqa ravinin ziyadəsi olduğu üçün məqbuldur. Hədisin zahirindən anlaşılır ki, həmin adam tövhidə əməl etmişdir, çünki tövhid istisna edilmişdir. Lakin bununla belə digər rəvayətlərdə tamamilə heç bir xeyir işləmədiyi də qeyd olunur! Bununla da aydın olur ki, ərəblər bu sözü işlətdikdə bununla pis əməlləri xeyir əməllərindən çox olan kəsləri qəsd edirlər. Bu insanların pis əməlləri o qədər çoxdur ki, xeyir əməllərini görünməz hala gətirmişdir.

Bu sözün bir çox yerlərdə sabit şəkildə təkrarlanması, bunun ərəblər tərəfindən istifadə olunan bir ifadə tərzi olduğunu göstərir. Çünki adətən bu şəkildə ifadələr ərəblərin dilində müəyyən bir mənanı qəsd etmək üçün işlədilir. Muslimin Ənəsdən mərfu olaraq rəvayət etdiyi hədisdə də buna yaxın mənada işlədilmişdir:

يؤتى بأنعم أهل الدنيا من أهل النار يوم القيامة فيصبغ في النار صبغة ثم يقال يا بن آدم هل رأيت خيرا قط هل مر بك نعيم قط فيقول لا والله يا رب، ما رأيت خيراً قط، ولا مر بي نعيم قط...

**"Cəhənnəm əhlindən olan dünya əhlinin ən xeyrlilərindən birini Qiyamət günü gətirəcəklər və onu bir anlıq atəşə saldıqdan sonra, ondan soruşulacaq: "Ey Adəm övladı! (Dünyada ikən) heç bir xeyir gördünmü? Sənə bir xoşbəxtlik nəsib oldumu?" Adam deyəcək: "Ya Rəbb, Allaha and olsun ki, xeyr! Heç bir xeyir görmədim və mənə heç bir xoşbəxtlik nəsib olmadı!"**[123]

---

əsərində (3048) bu ziyadənin səhih olduğunu söyləmişdir.

[123] Muslim, (2707)

Dünya əhlindən ən çox xeyir sahibi olan biri, dünyada heç bir xeyir görmədiyini təsdiq edəcək. Bu şəkildə gələn ləfzlər ərəblərin ümumi mənada istifadə etdikləri inkar formasıdır. Bununla hər bir şeyi yox, yalnız tamam olmayan işləri inkar etmək üçün istifadə edirlər. Ümumiyyətlə bu şəkildə ifadələr ərəb dilindəki mənanın genişliyindən irəli gəlir və bir çox zaman hər hansı bir əməlin kamil olmadığını ifadə etmək üçün həmin əməli tamamilə nəfy edirlər. Əbu Ubeyd əl-Qasim bin Sələm, *rahiməhullah*, deyir:

كلام العرب المستفيض عندنا غير مستنكر في إزالة العمل عن عامله إذا عمله على غير حقيقة، ألا ترى أنهم يقولون للصانع إذا كان ليس بمحكم لعمله: ما صنعت شيئاً و لا عملت شيئاً، و إنما وقع معناه هاهنا على نفي التجويد لا على الصنعة نفسها، فهو عامل عندهم بالاسم، و غير عامل بالإتقان

**“Ərəb kəlimələrinin mənası boldur. Bizə görə bir əməlin sahibi öz əməlini tam şəkildə etməzsə o əməlin olmadığını söyləmək qəribə deyildir. Əməl tam doğru, qüsursuz şəkildə olmadıqda, onların həmin əməli edənə “*Heç bir şey düzəltməmisən! Heç bir şey etməmisən!*” dediklərini görmədinmi? Bu zaman burdakı məna həmin əməlin gözəlliyini (doğruluğunu) inkar etməkdir, yoxsa əməlin ümumiyyətlə edilməsini inkar etmək üçün deyildir. Onlara görə bir isim olaraq iş görən odur, lakin kamil şəkildə iş görən deyildir.”**[124]

Əziz müsəlman! Allah sənə anlayış versin! Alimin bu açıq sözlərinə diqqət et və məsələnin həqiqətini anlamağa çalış! Ərəblərin bu tərzdə bir şeyi inkar etmələri həmin şeyin yoxluğuna görə deyildir, lakin inkar etdikləri şeyin tam və ya doğru olmamasına görədir. Misal olaraq namazlarını tez və

---

[124] ”**əl-İmən**”, səh: 41

doğru qılmayan birinə peyğəmbərimizin, salləllahu aleyhi va səlləm, sözlərini yadınıza salın! Həmin adama demişdi: "Namaz qıl, çünki sən namaz qılmadın!" Bu sözlərin üzərində düşünən anlayar ki, ərəblər bu tərzdə sözləri çox istifadə edirlər və peyğəmbərimiz isə, aleyhi əs-sələm, ərəb dilini ən gözəl və ən kamil şəkildə danışanlardan idi. İbn Teymiyyə, rahiməhullah, yuxarıda gətirdiyimiz misal ilə əlaqədar deyir:

لأن ما لم يتم ينفى كقوله للذي أساء في صلاته (صل فإنك لم تصل) فنفي الإيمان حيث نفي من هذا الباب

**"Çünki tamamlanmayan bir şey adətən nəfy edilir, (peyğəmbərimizin) namazlarını doğru qılmayan birinə dediyi sözündəki kimi: "Namaz qıl, çünki sən namaz qılmadın!". İmanın nəfy edilməsi də bu şəkildə nəfy növlərindəndir."**[125]

Bu söylədiklərimiz ləfzin həqiqi anlamını başa düşməyə kömək edir və hədisləri bir araya gətirdikdən sonra bu qəbildən olan ləfzlərin heç bir problem törətmədiyini və onların lüğəvi zəmində izahının olduğunu görürük.

Üstəlik "xayran" kəliməsi qeyri-müəyyən halda işlənmişdir və bununla hər bir xeyir qəsd olunmur. Əgər hər bir xeyir qəsd olunsa, bu zaman bura şəhadət kəlimələri də daxil olmalıdır. Bu isə heç bir şəkildə mümkün olan bir şey deyildir. Çünki şəhadət kəlimələrini söyləməyən heç cür atəşdən çıxa bilməz. "Xayran" kəliməsinin "nəkira" olaraq, yəni qeyri-müəyyən şəkildə işlənməsi bunun ümumi olduğuna dəlalət edir. Ümumi dəlillər isə xüsusi dəlillər ilə məhdudlaşır. Namazı tərk edənin isə kafir və müşrik olması barədə gələn dəlillər xüsusi dəlillərdir. Şeyx ibn Saleh əl-Useymin, *rahiməhullah*, deyir:

---

[125] "**Məcmu əl-Fətava**", 7/27

لم يعمل خيراً، (وخيراً) نكرة في سياق النفي، فهي عامة، والعام يخصص بالخاص

**“Xeyir işləməmiş”, “xeyir” kəliməsi inkar edici bir məzmunda qeyri-müəyyən şəkildə işlənmişdir və bu, ümumi mənadadır. Ümumi dəlillər isə xüsusi dəlillər ilə təxsis olunur.”**[126]

Bu şəkildə dəlilləri anlamaq üsul elminin tələbidir. Hökmlər İslamın qoyduğu külli qaydalar ilə anlaşılmalıdır və bu, üsul alimlərinin anladığı bir mövzudur.

## Namaz qılmayanlar şəfaətə haqq qazanmayacaqlar

Müxaliflərimiz dedilər: Hədisdə namazı tərk edənin kafir olmayacağına dair bir dəlil vardır![127]

Biz deyirik: Hədislərdə namaz qılmayanlara da şəfaət ediləcəyi və yaxud da Allahın rəhməti ilə atəşdən çıxarılacağı barədə heç bir şey gəlməmişdir. Bunun dəlili əl-Buxarinin Əbu Hureyrədən rəvayət etdiyi hədisdir:

---

126 ”**Liqa əl-Bab əl-Məftuh**” kasetlər silsiləsi, kaset (84), ikinci hissə (əl-Əsilə) dəqiqə: 07:50
h p://audio.islamweb.net/audio/listenbox.php?audioid=111643

127 İlk dövr alimlərdən heç kəs bu hədisi namazı tərk edənin müsəlman olması üçün dəlil gətirməmişdir. Yalnız bizim bu zamanımızda Şeyx əl-Albani kimi bu mövzuda yazanlar bu hədisi öz görüşləri üçün dəlil gətiriblər. Onlardan sonra isə onların məzhəblərini davam etdirənlərdən və ya bu iddiada olanlardan bəziləri bu hədisi öz əqidələrini isbat etmək üçün dəlil gətirirlər. Məs: əz-Zahrani, ”**Dabt əd-Davabit**”, (səh: 64); əl-Anbari, ”**əl-Hukm bi ğayri mə Ənzəlallah**”, (səh: 210); Adnan Abdulqadir, ”**Haqiqatul-İmən**”, (səh: 61)

وأراد أن يخرج من النار من أراد أن يخرج ممن كان يشهد أن لا إله إلا الله أمر الملائكة أن يخرجوهم فيعرفونهم بعلامة آثار السجود وحرم الله على النار أن تأكل من ابن آدم أثر السجود فيخرجونهم قد امتحشوا فيصب عليهم ماء يقال له ماء الحياة فينبتون نبات الحبة في حميل السيل ويبقى رجل منهم مقبل بوجهه على النار

**“Nəhayət Allah, “Lə iləhə illə Allah” deyərək şəhadət edənlərdən atəşdən çıxmasını dilədiyi kəsləri atəşdən çıxarmaq istəyəcək və mələklərə onları çıxarmağı əmr edəcək. Onları səcdə izlərindən tanıyacaqlar, Allah adəm övladlarının səcdə izlərini yandırmağı atəşə haram etmişdir. Onları qap-qara yanmış halda çıxaracaqlar və üzərilərinə “Həyat” suyu deyilən sudan tökəcəklər. Selin yatağında bitən yabanı reyhan otları kimi bitəcəklər. Axırda isə üzü atəşə tərəf yönəlmiş bir nəfər (Cəhənnəmdə) qalacaq...”**[128]

Məhz bu sonuncu bir nəfər atəşdən çıxan sonuncu kəs olacaqdır. Çünki əl-Buxarinin bu hədisinin sonunda deyir:

قال أبو هريرة وذلك الرجل آخر أهل الجنة دخولا

**“Əbu Hureyrə dedi: “Bu kişi Cənnət əhlindən ora sonuncu daxil olan kəsdir.”**

Bu isə isbat edir ki, ondan sonra Cənnətə heç bir kəs daxil olmayacaq. Buxarinin “Kitab ət-Təvhid”də və Muslimin “Kitab əl-İman”da Əbu Hureyrədən mərfu olaraq rəvayət etdikləri digər hədisdə isə belə deyilir:

حتى إذا فرغ الله من القضاء بين العباد، وأراد الله أن يخرج برحمته من أراد من أهل النار؛ أمر الملائكة أن يخرجوا من النار، من كان لا يشرك بالله شيئًا، ممن أراد الله أن يرحمه، ممن يشهد أن لا إله إلا الله، فيعرفونهم في النار بأثر

[128] əl-Buxari, Kitəb ər-Riqaq, (6573)

السجود، تأكل النار ابن آدم إلا أثر السجود، فيخرجون من النار قد امتحشوا

**“Sonra Allah qulları arasında hökm verməyi qurtaracaq. Bundan sonra cəhənnəm əhlindən dilədiyi kəsləri rəhməti ilə çıxarmaq istəyəcək. Mələklərə, Allaha şərik qoşmamış və Allahın rəhm etmək istədiyi, “lə iləhə illə Allah” deyərək şəhadət edən hər kəsi çıxarmağı əmr edəcək. Onları səcdə izlərindən tanıyacaqlar, çünki atəş səcdə izindən başqa Adəm övladının bütün bədənini yandırar və onları tam yanmış halda çıxaracaqlar...”**[129]

Əziz müsəlmanlar! Allah sizlərə rəhm etsin! Hər iki hədisə fikir verin! Hər iki hədisdə atəşdən sonuncu olaraq Allahın rəhməti ilə çıxarılan qabzə əhli zikr olunur və hər iki hədisdə onların səcdə izlərinin olacağı vurğulanmışdır. Bu iki rəvayət dəlalət edir ki, Allahın rəhməti ilə çıxardığı kəslər Cəhənnəmdən çıxarılacaq sonuncu qövm olacaqdır və onlar namaz əhlindən olacaqlar.

Daha sonra bu iki rəvayəti Şeyx əl-Albaninin kitabında dəlil olaraq gətirdiyi Əbu Said əl-Xudrinin hədisi ilə cəm edin! Əbu Said əl-Xudrinin hədisində deyilir:

**Bundan sonra Allah buyurur: «Mələklər şəfaət etdilər, peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər. Şəfaət etməyən bir Ərhamur-Rahimin qaldı. Bundan sonra atəşdən bir camaatı toplayır və dünyada ikən heç bir xeyr işləməyib cəhənnəmdə yanıb kömürə dönmüş bir çox kimsələri çıxarır.**

Bu rəvayətdə və bizim təqdim etdiyimiz hər iki hədisdə də atəşdən sonuncu çıxanlar zikr olunmuşdur, yəni Allahın rəhməti ilə sonuncu atəşdən çıxan qabzə əhli zikr olunmuşdur. Əbu Saidin hədisindən fərqli olaraq Əbu Hureyrənin hədisində zikr olunur ki, mələklər onları səcdə izlərindən tanıyacaqlar. Bu isə dəlalət edir ki, onlar namaz qılanlar olacaqlar. Bu hədislərdən bəzilərini dəlil gətirərək digərlərini kənara atmaq

[129] əl-Buxari, (7437); Muslim, (182, 299)

halal deyildir və elm əmanətinə xəyanət etməkdir. Bununla digər hədislərin haqqını ödəməmiş olarıq. Belə bir halda bu hədislərin arasını cəm etmək lazımdır.

Digər tərəfdən isə möminlərin və peyğəmbərlərin şəfaətindən sonra Allahın Öz rəhməti ilə atəşdən çıxaracağı kəslər zikr olunmuşdur və Əbu Hureyrənin hədisində isə onların səcdə izlərinə görə tanınacağı vurğulanır. Əgər yalnız birinci dəfə səcdə izlərinə görə çıxarılacağını və sonrakı dəfələrdə isə səcdə izlərinin olmayacağını qəbul etsək, əl-Buxarinin və Muslimin rəvayət etdiyi hədisə müxalif olmuş oluruq. Bu isə caiz deyildir və belə bir halda bu hədisləri bir araya gətirmək vacibdir. Bununla da aydın olur ki, Şeyx əl-Albaninin, *rahiməhullah,* İbn Əbi Cəmrəyə etirazı və əl-Hafiz ibn Hacərdən bu barədə nəql etdiyi sözləri əsassızdır. Bu məsələdə İbn Əbi Cəmrənin, *rahiməhullah*, sözləri daha doğrudur. O, deyir:

أن من كل من مسلما ولكنه كان لا يصلي لا يخرج [ من النار ] إذ لا علامة له

**“Müsəlman olub, lakin namaz qılmayan kəs (atəşdən) çıxarılmayacaq, çünki onun üçün heç bir əlamət yoxdur.”**

“Sahiheyn”də keçən Əbu Hureyrənin hədisində Cəhənnəmdən sonuncu çıxanların səcdə izlərinə görə tanınacağının zikr olunduğunu görmürsənmi?! Bu dəlildən sonra heç bir şübhəyə yer yoxdur!

İmam əl-Buxari, Əbu Hureyrənin hədisini rəvayət edən ravi Ata bin Yezidin sözlərini nəql edir:

قال عطاء بن يزيد : وأبو سعيد الخدري مع أبي هريرة لا يرد عليه من حديثه شيئا

**“Ata bin Yezid dedi: “Əbu Said əl-Xudri bu zaman Əbu**

**Hureyrənin yanında idi və onun rəvayət etdiyi hədisdən heç bir şeyə etiraz etmədi."**

Ey səmimi müsəlman! Sözlərində bəziləri üçün şübhələr olan və Şeyx əl-Albaninin öz kitabına dəlil olaraq gətirdiyi o hədisi mübarək səhabə Əbu Said rəvayət etmişdir. Lakin Əbu Hureyrə, *radiyallahu anu,* şəfaət hədisini rəvayət edərkən, Cəhənnəmdən sonuncu çıxanların səcdə izlərinə görə tanınacağını deyir. Əbu Saidin hədisində isə "heç bir xeyir işləməmiş" sözü keçməkdədir. Əgər hədisi rəvayət edən Əbu Said, bu sözlərdən bəzi kəslərin anladığı mənanı anlasaydı, təbii ki, Əbu Hureyrəyə etiraz edərdi. Axı Əbu Said Cənnətə sonuncu girən kəsə "on misli" veriləcək deyərək Əbu Hureyrəyə etiraz etmişdi. Bəs o zaman bundan da daha əhəmiyyətli məsələdə isə nə üçün etiraz etmədi?! Həqiqət budur ki, Əbu Saidin rəvayət etdiyi hədisdəki "heç bir xeyir işləməmiş" sözündə bir problem yoxdur və bu namazlarını tərk edənlərin kafir olmadığını isbat etmək üçün bir dəlil deyildir. Bu ifadənin həqiqətini digər dəlillərin işığında izah etdik və bu ifadənin həqiqətdə nə anlama gəldiyini isbat etdik. Doğrusunu isə Allah bilir!

Bu hədisləri cəm etdikdə ortaya çıxan məna aydınlaşır və məhz bu iki hədisi zikr etdikdən sonra İmam əl-Mərvazi, *rahiməhullah*, deyir:

أفلا ترى أن تارك الصلاة، ليس من أهل ملة الإسلام، الذين يُرجى لهم الخروج من النار، ودخول الجنة بشفاعة الشافعين، كما قال صلى الله عليه وسلم في حديث الشفاعة الذي رواه أبو هريرة وأبو سعيد جميعًا رضي الله عنهما: "أنهم يخرجون من النار، يعرفون بآثار السجود" قد بين لك أن المستحقين للخروج من النار بالشفاعة: هم المصلون.

**"Məgər namazlarını tərk edənlərin, şəfaətçilərin şəfaəti ilə atəşdən çıxan və Cənnətə daxil olan İslam millətindən olmadığını görmürsənmi?! Əbu Hureyrənin və Əbu Saidin – Allah onların hər ikisindən də razı olsun – rəvayət etdikləri**

**şəfaət hədisində peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, dediyi kimi: "Onlar atəşdən çıxdıqda, səcdə izlərindən tanınacaqlar." Bununla da sənə aydın olur ki, atəşdən çıxmağa haqq qazananlar namaz qılanlardır."**[130]

Bütün bunlardan sonra Şeyx əl-Albaninin sözlərinə diqqət edin:

وقد فات الحافظ - رحمه الله - أن في الحديث نفسه تعقبا على ابن أبي جمرة من وجه آخر وهو أن المؤمنين لما شفعهم الله في إخوانهم المصلين والصائمين وغيرهم في المرة الأولى فأخرجوهم من النار بالعلامة فلما شفعوا في المرات الأخرى وأخرجوا بشرا كثيرا لم يكن فيهم مصلون بداهة وإنما فيهم من الخير كل حسب إيمانهم .

**"əl-Hafiz, *rahiməhullah,* İbn Əbi Cəmrənin sözünə etiraz olaraq qeyd edir ki, hədisin özündə bir başqa tərəf də mövcuddur. Bu isə budur ki, möminlər Allahdan namaz qılan, oruc tutan və digər qardaşları üçün birinci dəfə şəfaət etdikləri zaman onları əlamətlərinə görə ordan çıxaracaqlar, lakin ikinci dəfə isə bir çox insan çıxaracaqlar və açıq-aşkar onların içində namaz qılmayanların olmayacağı aydındır. Lakin onlarda imanları miqdarında xeyr olacaqdır..."**[131]

Şeyx əl-Albaninin bu sözlərinin açıq-aydın bir xəta olduğu heç kəsdən gizli deyildir. Çünki, möminlərin öz qardaşlarını əlamətlərinə görə tanıyaraq çıxarmaqları hədislərdə zikr olunmayan xətalı bir təvildir. Hədislər bunun əksini göstərir və şahid olduq ki, Əbu Saidin hədisində deyilir:
"Tanıdıqlarınızı ordan çıxarın və üzlərinə baxıb onları tanıyacaqlar..."

Möminlər öz qardaşlarını səcdə izlərinə görə deyil,

[130] əl-Mərvazi, "**əs-Salət**", 2/1009

[131] "**Hukmu Tərik əs-Saləh**", səh: 33

üzlərindən şəxsən tanıyacaqlar. Digər hədisdə isə deyilir: **Allah Azzə və Cəllə deyəcək: "Gedin və qəlbində bir dinar ağırlığında iman gördüyünüz hər kəsi çıxarın!" və Allah onların üzlərini yandırmağı atəşə haram edib." Onlar ora gələcəklər və onların bəzilərinin atəşdə ayaqlarına qədər batdığını və bəzilərinin də baldırlarının ortasına qədər batdığını görəcəklər. Onlar tanıdıqlarını ordan çıxaracaqlar və sonra qayıdacaqlar.**

Hədislərin dəlalət etdiyi kimi ilk şəfaətdə atəşdən çıxanların bəziləri topuqlarına qədər, digərləri isə dizlərinə qədər və bundan da çox atəşə batmış halda olacaqlar. Bu isə qəti şəkildə onların səcdə izlərinə görə deyil, əksinə onların mömin qardaşları tərəfindən tanındıqdan sonra ordan çıxarılacağına dəlalət edir. Hədisin zahiri ən açıq şəkildə buna şahidlik edir. Şeyx Nasir əl-Albaninin, *rahiməhullah*, hədisdən belə bir məna çıxarması çox qəribədir!

## Müşriklərin tövhid əhlinə tənə etməsi

Bizim dediklərimizi təsdiqləyən daha bir dəlil Ənəsin rəvayət etdiyi hədisdə mövcuddur. Bu hədisi şəfaət hədisləri içində zikr etmişdik:

وفرغ الله من حساب الناس وأدخل من بقي من أمتي النار مع أهل النار فيقول أهل النار ما أغنى عنكم أنكم كنتم تعبدون الله عز وجل لا تشركون به شيئا

**"Allah insanların hesabını verdikdən sonra ümmətimdən qalan hissəni cəhənnəm əhli ilə birlikdə atəşə salacaq. Cəhənnəm əhli deyəcək: "Sizə nə olur axı? Siz Allaha – Azzə və Cəllə - ibadət edirdiniz və Ona heç bir şeyi şərik**

**qoşmurdunuz!"**[132]

Bu hədisin təhqiqi kitabın sonunda keçmişdir və söylədiyimiz kimi bunu bir çox müəllif kitablarında rəvayət etmişdir. Şeyx Nasir əl-Albani, *rahiməhullah,* İbn Əbi Asimin "əs-Sünən" əsərinin təhqiqində bu hədis haqqında deyir:

أخرجه أحمد والدارمي وابن خزيمة في التوحيد . قلت : وسندهم صحيح على شرط الشيخين، وله طريق أخرى عن انس بنحوه رواه الطبراني كما في تفسير ابن كثير

**"Bunu Əhməd, əd-Darimi və İbn Xuzeymə "ət-Təvhid" əsərində təxric etmişdir. Deyirəm: Sənədi Buxari və Müslimin şərtlərinə görə səhihdir və bunun eləcədə Ənəsdən başqa rəvayət yolu da vardır və İbn Kəsirin təfsirində keçdiyi kimi bunu Tabari rəvayət etmişdir."**[133]

Hədisin işarə etdiyi mənaya görə atəşə düşənlər və daha sonra Allahın rəhməti ilə ordan çıxanlar, Allaha ibadət edən bir qövm olmuşdur, lakin öz günahlarının çoxluğuna görə atəşdə əzab çəkməyə layiq olublar. Bu hədislərin zahirindən anlaşılır. Digər rəvayətlərdə isə müşriklərin, əməllərinin onları qurtarmaması səbəbi ilə tövhid əhlinə tənə etməsi zikr olunmuşdur və bundan sonra Allah – Tabərakə və Təalə - onları oradan çıxaracaq. Bu rəvayətlərin hamısı birlikdə bu ləfzi qüvvətləndirir və Şeyx əl-Albaninin də işarə etdiyi kimi hədis səhihdir. Hədislərin zahirindən anlaşılır ki, cəhənnəm əhlinin tənə etdiyi qövm cəhənnəmdən sonuncu olaraq çıxarılacaq qabzə əhlidir. Çünki, onlar şəfaətçilərin, yəni məxluqun şəfaəti ilə deyil, məhz Allahu Təalənin rəhməti ilə çıxarılacaqlar. Onların tam yanmış halda cəhənnəmı tərk etmələri,

[132] Hədisin təhqiqi üçün şəfaət hədisləri içində Ənəsin, *radiyallahu anhu*, rəvayətinə bax!

[133] "**Təhqiq əs-Sunən li İbn Əbi Asim**", səh: 393

dediklərimizi təsdiqləyən dəlillərdəndir və daha sonra Cənnət əhli onlara “*Allahın azadlıları*” və ya “*cəhənnəmiyyun*” deyəcəklər.

Hədislərdə keçdiyi kimi onların ibadət əhli olmaları onların namaz əhlindən olmaqlarına dəlalət edir. Zahiri əməlləri olmayan kəslərə ibadət əhli deyilməz və bu hər kəsə məlumdur. Əgər bu dəlillər ilə birlikdə Əbu Hureyrənin hədisindəki dəlilləri də bir araya gətirsək, bəziləri üçün dumanlı qalan mənzərə aydınlaşmış olmalıdır. Bununla da “heç bir xeyir işləməyən” sözü ilə nəyin qəsd edildiyi ortaya çıxmış olur və İmam İbn Xuzeymənin izahına geri dönmüş oluruq. Müvəffəqiyyət Allahdandır!

## Şəfaət bütün ümmətlərə aiddir

Təqdim etdiyimiz dəlillərdən aydın olur ki, hədislərdə heç bir şəkildə namazları tərk edilənlər zikr olunmamışdır və belə bir təvil şəri dəlillərə əsaslanmayan təvildir. Lakin hətta hədisdəki ləfzin namazı tərk edənlərə də aid olduğunu qəbul etsək belə, bu hədis bizim əleyhimizə dəlil ola bilməz. Çünki burda başqa bir məqam daha vardır: “*Məgər cəhənnəmdən sonuncu olaraq Allahın rəhməti ilə çıxanlar yalnız Muhammədin ümməti olacaqmı?*” Əgər buna “Xeyr” deyərək cavab versələr, deyərik:

Biz əvvəlki ümmətlər arasında namazı tərk edənlərin də kafir olduğunu söyləmirik. Biz etiqad edirik ki, namaz əvvəlki ümmətlərə də buyurulmuşdur və bu barədə İmam əl-Mərvazinin gözəl izahı vardır.[134] Lakin əvvəlki ümmətlərdə də namazı tərk etməyin millətdən çıxaran bir küfr olması barədə əlimizdə heç bir dəlil yoxdur. Əksinə, əlimizdə bu ümmətdən namazı tərk edənlərin küfrünə dair dəlillər vardır.

---

[134] Bax: “**əs-Salət**”, 1/96

“Allahın rəhməti ilə Cəhənnəmdən çıxanlar bu ümmətin nümayəndələridir” deyərək cavab versələr, onlara bunun dəlilini soruşarıq. Şeyx əl-Albaninin özünün təsdiq etdiyinə görə atəşdən sonuncu çıxanların üzərində heç bir əlamət olmayacaqdır. Bəs o zaman onların yalnız Muhamməd ümmətindən olduğunu necə təsbit etdiniz?!
Hədislərdən anladığımız xüsusi bir məsələ vardır: Bir çox hədisdə qeyd olunduğu kimi, peyğəmbərimiz, *salləllahu aleyhi va səlləm*, ümmətindən “lə iləhə illə Allah” deyənlər üçün şəfaət edəcəkdir və Ənəsin hədisində zikr olunduğuna görə Muhamməd üç dəfə şəfaət edərək atəşdən tövhid əhlini çıxaracaq və dördüncü dəfə:

فيقول في الرابعة: ائذن لي فيمن قال: لا إله إلا الله، فيقول: ليس ذلك إليك

**“Dördüncü dəfə deyəcək: “Mənə (şəfaət etməyim üçün) “lə iləhə illə Allah” deyənlər üçün də izn ver!” və Allah deyəcək: “Bu, sənə aid deyildir!”**

Bir tərəfdən peyğəmbərimizin, *salləllahu aleyhi va səlləm*, tövhid kəliməsi ilə şəhadət edənlər üçün şəfaət etməsi sabit olduğu halda, digər tərəfdən Ənəsin hədisində buna izn verilməyəcək və bunun onun haqqı olmadığı deyiləcəkdir. Belə olduqda bu iki halı birləşdirmək ziddiyətli görünə bilər. Lakin bu barədə maliki alimlərindən İmam Muhamməd bin Xalifə əl-Ubbi, *rahiməhullah*, deyir:

والجمع بينهما متناف، لأن من قال: لا إله إلا الله، لا يخلد، ويجاب: بأنه اختلف، فقيل: يعني من قالها من أمته، وقيل: يعني من قالها من غير أمته...

**“Bu ikisinin arasını cəm etmək ziddiyətlidir, çünki “lə iləhə illə Allah” deyən (atəşdə) qalmayacaq. Bunun cavabı belədir: “Məsələdə ixtilaf vardır. Bəziləri bunun Muhammədin ümmətindən “lə iləhə illə Allah” deyənlər olduğunu, bəziləri**

**də bunun başqa ümmətlərdən tövhid kəliməsini deyənlərə aid olduğunu söyləyir...."**[135]

Bununla Muslimin "əs-Səhih" əsərinə yazdığı şərhində İmam əl-Ubbi məsələdə ixtilafın olduğuna işarə edir: Cəhənnəmdən sonuncu olaraq Allahın rəhməti ilə çıxan qabzə əhli bu ümmətdəndir yoxsa onlar başqa ümmətlərdəndirmi?
Heç şübhəsiz ki, hədisdə şəfaətin yalnız Muhammədin, *salləllahu aleyhi va səlləm*, ümmətinə aid olacağı qeyd olunmur. Lakin sabit rəyə görə Qiyamət günündə bütün ümmətlərə şəfaət ediləcəkdir və bunun dəlili kitabın sonunda təxricini etdiyimiz hədislərdə zikr olunur. Əbu Said əl-Xudrinin hədisində peyğəmbər, *salləllahu aleyhi va səlləm*, deyir:

ثم يقول الله : شفعت الملائكة وشفعت الأنبياء وشفعت المؤمنون وبقي أرحم الراحمين ...

**"Daha sonra Allah deyəcək: "Mələklər şəfaət etdilər, peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər və yalnız Ərham ər-Rahimin qaldı..."**

"**Peyğəmbərlər şəfaət etdilər**" ləfzindən anlaşılan budur ki, şəfaət bütün ümmətlərə aid olacaqdır. Bunun yalnız bizim ümmətə aid olduğunu zənn etmək böyük bir xəta olardı. Əbu Hureyrənin hədisinin göstərdiyi kimi sonuncu olaraq cəhənnəmdən çıxan tövhid əhlini mələklər səcdə izlərindən tanıyacaqlar. Lakin bununla belə onların arasında başqa ümmətlərin də ola biləcəyini inkar etmirik. Bizim ümmət bəzi xüsusiyyətlərinə görə digər ümmətlərdən seçilir. Digər ümmətlərdən fərqli olaraq bizim ümmətə xas olan əlamətlər mövcuddur və alın yerlərinin ağarması və parıltı bu əlamətlərdən bəziləridir. Əl-Hafiz İbn Hacər buyurur:

---

[135] əl-Ubbi, "**İkməl İkməl əl-Mualim**", 1/596

قد ثبت أن الغرة والتحجيل خاص بالأمة المحمدية فالتحقيق أنهم في هذا المقام يتميزون بعدم السجود وبإطفاء نورهم بعد أن حصل لهم.

**“Alındakı ağartı və parıltının Muhammədin ümmətinə xas olması sabit bir məsələdir və doğru olan budur ki, səcdələrinin olmaması və səcdə yerlərindəki nurun sönməsinə görə həmin anda onlar (münafiqlər) seçiləcəklər.”**[136]

Lakin namaz isə yalnız bizim ümmətə xas olan bir ibadət deyildir. Digər ümmətlər də namaz qılmışdır. Bütün bunları öyrəndikdən sonra müxaliflərimizi çıxılmaz bir vəziyyət qarşısına qoymuş oluruq:

1. Əgər sonuncu olaraq Cəhənnəmdən çıxanlarda heç bir səcdə işarəsi olmadığını deyirsizsə, o zaman sahiheyndə keçən Əbu Hureyrənin hədisinə müxalif düşürsüz, çünki hədisdə onların səcdə izlərinə görə tanınacağı zikr olunur.
2. İkinci tərəfdən isə əgər onların səcdə izlərinin olmadığını qəbul etsək belə, onların bizim ümmətdən olduqlarına necə əmin ola bilərik?! Axı hədisdə bunun üçün heç bir dəlil yoxdur. Sizin dediyinizə görə Muhammədin ümmətinə xas olan xüsusiyyətlərdən heç biri onlarda yoxdur. Bəs o zaman onların bizim ümmətdən olduğunu hardan bilirsiniz? Elm əhlinə dəlilin getdiyi yerə qədər getmək vacibdir!

# Üzrlü olanlar

136 “**Fəth əl-Bari**”, 11/449

Fərqli ləfzləri bir araya gətirdikdən sonra və hədisin lüğəvi mənasını öyrəndikdən sonra, namazı tərk edənin imanı olduğunu isbat etmək üçün bu hədisi dəlil gətirməyin əsassız olduğunu anlamış oluruq. Hətta hədisin ümumi anlamına namazı tərk edənlərin də daxil olduğunu qəbul etsək belə, bu hədis bizə qarşı dəlil ola bilməz. Çünki biz çox gözəl bilirik ki, namazı tərk edən bir çox qövmlər var ki, onların Allahın yanında şəri üzrləri olacaqdır. Bu cür insanlar namaz qılmadıqları halda Allahın yanında imanlarına görə mükafatlandırılacaqlar. Onların içində İslamı qəbul edib əməl etmək imkanı olmadan ölən kəslər olacaqdır və təbii ki, bu kimi kəslər imkansızlıqdan ötrü namaz qılmadıqları üçün üzrlü sayılırlar. Eləcədə küfr ölkəsində yaşayan və İslamı qəbul edən biri İslam hökmlərini öyrənməkdən aciz qala bilər və bu hökmlər içində namazın da olması mümkündür. Belə bir insan tövhid kəliməsini ixlas ilə söyləyərsə və bu halı üzərində ölərsə, namazlarını qılmadığı üçün üzrlü sayılır. Eləcədə kafirlər arasında İslamı qəbul edən, lakin öz ətrafından, öldürülməkdən və ya təqibdən qorxduğu üçün müsəlmanlığını gizli saxlayan və namazlarını qılmayan kəslər də buna misal ola bilər. Əgər onlar öz məmləkətlərindən hicrət etmək qüdrətinə sahib deyillərsə və yaxud da hicrət etməmişdən əvvəl ölsələr Allah yanında üzr sahibi ola bilərlər. Çünki mükəlləfiyyət qüdrət ilə şərtləndirilmişdir. Şəfaət hədisinə aid edilə biləcək bu ehtimallara bir çox alim işarə etmişdir. Şeyx Muhamməd bin Saleh əl-Useymin, *rahiməhullah*, deyir:

معنى قوله: ( لم يعملوا خيراً قط ) أنهم ما عملوا أعمالاً صالحة، لكن الإيمان قد وقر في قلوبهم، فإما أن يكون هؤلاء قد ماتوا قبل التمكن من العمل؛ آمنوا ثم ماتوا قبل أن يتمكنوا من العمل، وحينئذ يصدق عليهم أنهم لم يعملوا خيراً قط.

وإما أن يكون هذا الحديث مقيدا بمثل الأحاديث الدالة على أن بعض الأعمال الصالحة تركها كفر كالصلاة مثلاً؛ فإن من لم يصل فهو كافر ولو زعم أنه

مؤمن بالله ورسوله، والكافر لا تنفعه شفاعة الشافعين يوم القيامة، وهو خالد مخلد في النار أبد الآبدين، والعياذ بالله.
فالمهم أن هذا الحديث: إما أن يكون في قوم آمنوا ولم يتمكنوا من العمل فماتوا فور إيمانهم فما عملوا خيراً قط، وإما أن يكون هذا عاماً ولكنه يستثنى منه ما دلت النصوص الشرعية على أنه لابد أن يعمل كالصلاة؛ فمن لم يصل فهو كافر لا تنفعه الشفاعة ولا يخرج من النار

**" "*Heç bir xeyir əməl etməyən*" sözünün mənası, yəni onlar saleh əməllər etməyiblər, lakin iman onların qəlblərində yerləşmişdir. Bu həm o zaman olur ki, insan əməl etmək imkanından əvvəl ölür, iman gətirir və sonra əməl etmək imkanı olmadan ölür və bu zaman onlar haqqında təsdiqlənir ki, onlar xeyir əməllərdən heş bir şey etməyiblər. Həm də bu hədis, məsələn namaz kimi bəzi saleh əməllərin tərki ilə insanın kafir olduğuna dəlalət edən hədislər ilə şərtə bağlanmışdır. Əgər namaz qılmazsa, hətta Allaha və Rasuluna iman gətirdiyini iddia etsə də o, kafirdir və kafir Qiyamət günü şəfaət edənlərin şəfaətindən faydalanmayacaq və o, cəhənnəm atəşində əbədi qalacaqdır. Allah qorusun!**
**Mühüm olan budur ki, həm bu hədis iman gətirmiş və imanından az sonra əməl etmək imkanı olmadan ölən və heç bir xeyir əməl etməyən insanlar haqqındadır, həm də bu ümumidir və burdan şəri nəsslərin dəlalət etdiyi və vacib olduğu namaz kimi əməllər istisnadır. Kim namaz qılmazsa kafirdir, şəfaət ona fayda verməz və atəşdən çıxarılmaz."**[137]

Şeyx, *rahiməhullah*, bu sözləri ilə yuxarıda dediklərimizi təsdiqləyir. Eləcədə Şeyx Saleh bin Favzan əl-Favzana bu hədisi dəlil gətirənlər barədə soruşurlar:

هناك بعض الأحاديث التي يستدل بها البعض على أن من ترك جميع الأعمال

---

137 "**Məcmu Fətava və Rasail Şeyx İbni Useymin**", 2/48 (fətva: 171), "**Fətava əl-Aqidə**", səh: 123, Dar əl-Mənhəc

بالكلية فهو مؤمن ناقص الإيمان كحديث (لم يعملوا خيرًا قط) وحديث البطاقة وغيرها من الأحاديث، فكيف الجواب على ذلك؟

**“Bəziləri, bütün əməlləri tərk edənin imanı naqis mömin olduğunu isbat etmək üçün bəzi hədisləri dəlil gətirirlər. Məs: “Heç bir xeyir işləməmiş” hədisi və “əl-bitəqa” hədisi və digər hədisləri dəlil gətirirlər və buna cavabınız nədir?”**

Şeyx əl-Favzan belə cavab verir:

هذا من الاستدلال بالمتشابه، وهذه طريقة أهل الزيغ الذين قال الله سبحانه وتعالى فيهم:
هُوَ الَّذِيَ أَنزَلَ عَلَيْكَ الْكِتَابَ مِنْهُ آيَاتٌ مُّحْكَمَاتٌ هُنَّ أُمُّ الْكِتَابِ وَأُخَرُ مُتَشَابِهَاتٌ فَأَمَّا الَّذِينَ في قُلُوبِهِمْ زَيْغٌ فَيَتَّبِعُونَ مَا تَشَابَهَ مِنْهُ
فيأخذون الأدلة المتشابهة ويتركون الأدلة المحكمة التي تفسرها وتبينها، فلا بد من رد المتشابه إلى المحكم، فيقال: من ترك العمل لعذر شرعي ولم يتمكن منه حتى مات فهذا معذور وعليه تحمل هذه الأحاديث، فيقال: هذا رجل نطق بالشهادتين معتقدًا لهما مخلصًا لله عز وجل ثم مات في الحال ولم يتمكن من العمل لكنه نطق بالشهادتين مع الإخلاص لله والتوحيد كما قال صلى الله عليه وسلم: ((من قال لا إله إلا الله وكفر بما يعبد من دون الله حرم ماله ودمه وحسابه على الله) ، وقال: (فإن الله قد حرم على النار من قال: لا إله إلا الله يبتغي بذلك وجه الله) ، هذا لم يتمكن من العمل مع أنه نطق بالشهادتين واعتقد معناهما وأخلص لله عز وجل، لكنه لم يبق أمامه فرصة للعمل حتى مات فهذا هو الذي يدخل الجنة بالشهادتين وعليه يحمل حديث البطاقة وغيره مما جاء بمعناه، وعليه يحمل حديث الذين يخرجون من النار وهم لم يعملوا خيرًا قط لأنهم لم يتمكنوا من العمل مع أنهم نطقوا بالشهادتين ودخلوا في الإسلام أما من ترك الأعمال كلها مختارًا مع تمكنه منها فهذا لا يكون مؤمنًا هذا هو الجمع بين الأحاديث.

**"Bu mütəşabih ilə dəlil gətirməkdir və bu qəlbində xəstəlik olanların üsuludur və onlar haqqında Allahu Təalə buyurur: "Kitabı sənə nazil edən Odur. O Kitabın bir qismi, mənası aydın olan ayələrdir ki, bunlar da Kitabın anasıdır. Digərləri**

isə mənası aydın olmayan ayələrdir. Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşərlər."[138] Onlar mütəşabih dəlilləri götürürlər və həmin mütəşabih ayələri şərh edən və izah edən muhkəm dəlilləri isə tərk edirlər. Mütəşabih dəlilləri muhkəm dəlillərin işığında anlamaq lazımdır və deyirik: Kim əməlləri şəri bir üzr səbəbi ilə tərk edərsə və ölənə qədər bu əməlləri etmək imkanı olmazsa o, üzrlüdür və bu hədislər ona aiddir. Deyirik: Bu insan etiqad edir və Allaha -Azzə va Cəllə- qarşı ixlaslı olaraq iki şəhadət kəliməsini söyləyir və bu hal üzərində ölür və əməlləri etmək imkanı yoxdur və lakin Allaha qarşı ixlas və tövhid ilə şəhadət kəlimələrini söyləyir, beləki peyğəmbər, *salləllahu aleyhi va səlləm,* buyurmuşdur: "Kim lə ilərə illə Allah" söyləyərsə və Allahdan başqa ibadət olunanları təkfir edərsə, malı və qanı haram olmuşdur və hesabı Allahadır" və yenə demişdir: "Lə iləhə illə Allah" söyləyib bununla Allahın razılığını istəyəni Allah atəşə haram etmişdir", çünki bu insan əməl etmək imkanına sahib deyildir, şəhadət kəlimələrini söyləyir və mənalarına etiqad edir və Allaha Azzə və Cəllə qarşı ixlaslıdır, lakin ölənə qədər qarşına bu əməlləri etmək üçün fürsət çıxmır və məhz bu kəslər şəhadət kəliməsinə görə cənnətə daxil olacaqlar və "bətaqə" hədisi və bu mənada olan digər hədislər də onlar haqqındadır və eləcədə "heç bir xeyir əməl etmədikləri halda atəşdən çıxarılanlar" haqqında gələn hədis də bunlar haqqındadır, çünki onlar şəhadət edib İslama daxil olduqdan sonra əməl etmək imkanına sahib olmayıblar. Lakin imkanı olduğu halda öz istəyi ilə bütün əməlləri tərk edən isə müsəlman deyildir. Bu şəkildə hədislərin arası cəm edilmiş olur."[139]

---

138 Ali-İmran, 7

139 "**əl-İcəbət əl-Muhimmə fil Məşakil əl-Mulimmə**", səh: 112, "**Məsəil fil-İmən**", səh: 28-29

Buna yaxın bir mənada bir sual ilə əl-Ləcnədən soruşurlar və əl-Ləcnə[140] uzun bir cavab verir və fətvasının sonunda dəlil olaraq gətirilən bəzi hədislər barədə deyir:

و أما ما جاء في الحديث ( أن قوماً يدخلون الجنة لم يعملوا خيراً قط ) فليس عاماً لكل من ترك العمل و هو يقدر عليه، و إنما هو خاص بأولئك لعذر منعهم من العمل أو لغير ذلك من المعاني التي تلائم النصوص المحكمة و ما أجمع عليه السلف الصالح في هذا الباب

**"Hədisdə zikr olunan "heç bir xeyir işləməmiş bir qövm cənnətə daxil olacaq" sözünə gəldikdə isə, bu hədis imkanı olduğu halda əməlləri tərk edən hər kəsə aid deyildir. Əksinə bu hədis, insanı əməl etməkdən aciz qoyan bir üzrə sahib olan kəslər haqqında xüsusi bir dəlildir və yaxud da möhkəm dəlillərə uyğun mənada və bu mövzuda sələf əs-salihin üzərində icma etdiyi mənada gəlmiş xüsusi bir dəlildir."**[141]

Əziz müsəlman! Allah sənə və bizə rəhm etsin! Haqq budur ki, bu hədislərdə namazı tərk edənin küfrünü rədd edən heç bir dəlil yoxdur. Ümmətin alimləri bu hədisi bu anlamda qəbul etməyiblər.

## Etiraf

İşin qəribə tərəfi budur ki, Şeyx əl-Albani də bu həqiqəti görür və bu işin üzərinə təəccüb etdiyini də öz yazısında

140 Bu fətvanı imzalayanlar arasında Şeyx Saleh əl-Favzan, Abdulaziz Al əş-Şeyx, Bəkr Əbu Zeyd və əl-Ğudeyyan kimi dövrümüzün alimləri vardır.

141 "**əl-Ləcnə əd-Daimə lil-Buhus əl-İlmiyyə val-İftə**", (fətva: 21436, tarix:
1421/4/8), "**Məcəllə əl-Buhus əl-İsləmiyyə**", 61/104

bildirmişdir. O, mövzu ilə əlaqədar təlif etdiyi risaləsində deyir:

إذا عرفت ما سلف - يا أخي المسلم - فإن عجبي لا يكاد ينتهي من إغفال
جماهير المؤلفين الذين توسعوا في الكتابة في هذه المسألة الهامة ألا وهي :
هل يكفر تارك الصلاة كسلا أم لا ؟
لقد غفلوا جميعا - فيما اطلعت - عن إيراد هذا الحديث الصحيح مع اتفاق
الشيخين وغيرهما على صحته
لم يذكره من هو حجة له ولم يجب عنه من هو حجة عليه...

**"Ey müsəlman qardaşım! Əvvəldə qeyd olunanları gördün! Həqiqətən bu əhəmiyyətli məsələyə - yəni namazı təmbəlliklə tərk edən təkfir edilirmi, yoxsa yox? – dair ətraflı kitab yazan müəlliflərin çoxunun (bu hədisdən) qafil qalmaları məni heyrətə gətirir. Araşdırdığıma görə onların hamısı, Buxari və Muslimin və digərlərinin səhihliyi üzərində ittifaq etdiyi bu səhih hədisdən qafil qalıblar. Namazı tərk edəni kafir görməyənlər bu hədisi zikr etmirlər və müxalifləri də buna cavab verməyiblər..."**[142]

Allah Şeyxi bağışlasın və Axirətdəki məqamını yüksəltsin! Lakin onun bu sözlərini oxuduqda biz özümüz heyrətə gəlirik! Bu, ümmətin alimlərini haqqlarından məhrum etməkdir. Onlar bu elmin ən şərəfli təmsilçiləri olduqları halda, onlara bu şəkildə qafilliyi nisbət etmək olmaz. İslam ümmətinin bu qədər alimi tarix boyu bu hədisdəki bu dəlilləri görmədilərmi?! Əlbəttə ki, onlar hədis elmində və fiqhdə qat-qat yüksək səviyyədə idilər. İşin həqiqəti budur ki, hədislərdə namazı tərk edənin imanını isbat etmək üçün heç bir dəlil yoxdur. Yoxsa Şeyx əl-Albaninin anladığı kimi deyildir! Eləcədə kitabında İbnul-Qayyimi tənqid etməsi əsassızdır! İbnul-Qayyim, *rahiməhullah*, çox gözəl bilirdi ki, namazı tərk edəni təkfir etməyənlər hədisin ümumi mənasını dəlil gətiriblər. Biz burda bu məsələni ətraflı ələ almaq fikrində

---

142 "**Hukmu Tərik əs-Salət**", səh: 35

deyilik.

Şeyx əl-Albani, rahiməhullah, özü etiraf edir ki, şəfaət hədislərini heç bir tərəf dəlil olaraq gətirməyiblər. Daha dəqiq desək, namazı tərk edəni kafir görməyənlər mövzu ilə əlaqədar olaraq bu hədisləri dəlil kimi istifadə etməyiblər. Namazı tərk edəni kafir görən alimlər də buna cavab verməyə ehtiyac duymayıblar. Şeyx əl-Albaninin bunu etiraf etməsi, bizim şəfaət hədisləri barədə yuxarıda yazdıqlarımızı dəstəkləyir.

## İbnul-Qayyimin “Namaz” kitabı və faydalı məqamlar

Şeyx əl-Albaninin “***Namazı tərk edənin hökmü***” kitabını ilk dəfə oxuduqda İbnul-Qayyimdən nəql edilmiş sözləri öz dəyərində anlamaqdan məhrum oldum. İbnul-Qayyimin sözləri elə bir ardıcıllıqla təqdim edilmişdir ki, oxuyucu sözlərin əsl mahiyyətinə varmaqdan aciz qalır və tam bir fərqli məzmunda anlayır. Bu şəkildə sözləri hissə-hissə təqdim etmək alimin haqqına girməkdir.

İbnul-Qayyim, *rahiməhullah*, öz kitabında mövzunu ən geniş bir anlamda ələ almışdır və hər iki tərəfin dəlillərini zikr etdikdən sonra hökm verməkdən çəkinərək ən vacib olan məqamları qeyd etmişdir. Bununla sadəcə olaraq məsuliyyəti hər bir oxuyucunun üzərinə buraxmamışdır, lakin ona bu yolda bələdçilik etməyə çalışmışdır. Allah bu ümmətin alimlərinə rəhm etsin! Həqiqətən onlar məsuliyyətin ağırlığını hiss edən bir qövmdür!

Bu hissədə Şeyx əl-Albaninin sözlərini rədd etmək əvəzinə, İbnul-Qayyimin bizlərə çatdırdığı bu vacib məqamları qeyd etməklə yetinəcəyik. Hər şeydən əvvəl bilmək lazımdır ki, İbnul-Qayyim etiqadi küfr və ya inad küfrü ilə əməli küfrü bir-birindən ayırmışdır:

وها هنا أصل آخر وهو أن الكفر نوعان كفر عمل وكفر جحود وعناد الجحود أن يكفر بما علم أن الرسول جاء به من عند الله جحودا وعنادا من اسماء الرب وصفاته وأفعاله وأحكامه وهذا الكفر يضاد الإيمان من كل وجه وأما كفر العمل فينقسم إلى ما يضاد الإيمان وإلى ما لا يضاده فالسجود للضم والاستهانة بالمصحف وقتل النبي وسبه يضاد الإيمان وأما الحكم بغير ما أنزل الله وترك الصلاة فهو من الكفر العملي قطعا ولا يمكن أن ينفي عنه اسم الكفر بعد أن اطلقه الله ورسوله عليه فالحاكم بغير ما انزل الله كافر وتارك الصلاة كافر بنص رسول الله ولكن هو كفر عمل لا كفر اعتقاد...

**Burda başqa bir əsas məsələ vardır. Bu da küfrün iki növ**

**olmasıdır: 1) Əməldə küfr və 2) inkar və inad küfrü.**

**İnkar budur ki, Allahın Elçisinin Allahın qatından gətirdiyi bilinən şeyləri, Rəbbin isimlərini, sifətlərini, fellərini inkar edərək və inad edərək küfr etməkdir. Bu küfr hər tərəfdən imana ziddir.**

**Lakin əməldə küfr isə imana zidd olan və imana zidd olmayaraq iki qismə ayrılır. Bütə səcdə etmək, Quranı təhqir etmək, peyğəmbəri öldürmək və ya onu söymək imana ziddir. Allahın endirdiyi şeylərdən başqası ilə hökm etmək və namazı tərk etmək isə kəsinliklə əməli küfrdür və Allah və Elçisi bu adı ona verdikdən sonra ona kafir deməmək mümkün deyildir. Allahın endirdiyindən başqası ilə hökm edən hakim kafirdir və namazı tərk edən də Allahın Elçisinin nassı ilə kafirdir. Lakin bu əməli küfrdür, etiqadi küfr deyildir...“**[143]

İbnul-Qayyim burada vacib bir fərqi göstərmişdir. Əməldə olan küfr iki növdür və bunlardan biri imanı aradan qaldırdığı halda, digəri imanı ləğv etməz. Namazın tərkini və Allahın endirdiyindən başqası ilə hökm etməyi zikr edərək təfsilata getməmişdir və bunu mövzunun axarına həvalə etmişdir. Biz çox gözəl bilirik ki, istər namazı tərk etmək olsun, istərsə də Allahın endirdiyindən başqası ilə hökm etmək olsun, bunların hər ikisini də qəti olaraq riddət adlandırmaq xəta olardı. Çünki əgər bu şəkildə hökm etmiş olsaq, bir namazı vaxtı çıxana qədər tərk edən və ya Allahın endirdiklərindən hər hansı bir hökmü tərk edib, başqa bir hökm ilə hökm verən hər bir kəsi də mürtəd və kafir saymağımız vacib olardı. Məhz bu səbəblə İmam İbnul-Qayyim bunun digər əməllər kimi qəti olaraq insanı dindən çıxarmadığına işarə edir və bunun təfsilinə bizi yönəldir. Çünki bütə səcdə etmək, peyğəmbəri söymək və ya Mushafı təhqir etmək kimi etiqadda deyil, əməldə olan küfrlər qəti

---

143 ”**Kitəb əs-Salət va Hukmu Tərikihə**”, səh: 55

olaraq insanı dindən çıxardır. Lakin namazı tərk etmək fərqli bir küfrdür. Tək bir namazı tərk etmək və ya ikisini və ya daha çox namazı tərk etmək insanı mütləq olaraq dindən çıxarmaz və məhz buna görə də bunun imana zidd olmadığı qeyd olunmuşdur. Eləcədə Allahın hökmündən başqası ilə hökm vermək də bunun kimidir. İbnul-Qayyim bir başqa yerdə deyir:

والصحيح أن الحكم بغير ما أنزل الله يتناول الكفرين - الأصغر والأكبر - بحسب حال الحاكم، إنه إن اعتقد وجوب الحكم بما أنزل الله في هذه الواقعة وعدل عنه عصيانا مع اعترافه بأنه مستحق للعقوبة فهذا كفر أصغر، وإن اعتقد أنه غير واجب وأنه مخير فيه مع تيقنه أنه حكم الله فهذا كفر أكبر، وإن جهله وأخطأه فهذا مخطئ له حكم المخطئين

**"Doğru olan budur ki, Allahın endirdiyindən başqasi ilə hökm verməyənlərin küfrü iki növdür- kiçik və böyük- və bu hakimin halından asılıdır. Əgər bu halda (bu məsələdə) Allahın endirdiyi ilə hökm etməyin vacibliyinə etiqad etdiyi halda, ondan asiliyi səbəbi ilə üz döndərərsə və buna görə cəzaya layiq olduğunu etiraf edərsə bu, kiçik küfrdür. Lakin bunun vacib olmadığına etiqad edərsə və bunun Allahın hökmü olduğuna əmin olduğu halda, bu məsələdə ixtiyar sahibi olduğuna etiqad edərsə bu, böyük küfrdür. Əgər cahil olarsa, xəta edərsə o zaman xəta edənlərdəndir və ona xəta edənlərin hökmü aiddir."**[144]

Bu sözlərdən anlaşılır ki, müəyyən bir məsələdə Allahın hökmünü tərk edərək başqa hökmə müraciət edən insan irtida etmiş sayılmaz. Çünki bu, onun tamamilə Allahın hökmünü tərk etdiyinə dəlalət etməz. İbnul-Qayyimin "*fi həzihil vaqiati*" sözünə diqqət etmək lazımdır. Çünki bu, ümumi mənanı xüsusiləşdirir və Allahın hökmünü tamamilə tərk etmək ilə, onu müəyyən məsələlərdə və ya müəyyən məqamlarda tərk etmək

---

[144] "**Mədaric əs-Salikin**", 1/336-337

arasında fərq qoyur. Namazı tərk edənlərin də halı belədir. Bunun izahını daha sonra İbni Teymiyyənin, *rahiməhullah*, sözlərində tapa bilərik.

İbnul-Qayyimin bizə çatdırdığı məqamlardan birincisi Əhli-Sünnətin mürciədən fərqidir və imanın batin ilə zahir arasında necə bölündüyünə diqqət çəkməsidir. O, deyir:

معرفة الصواب في هذه المسألة مبني على معرفة حقيقة الإيمان والكفر ثم يصح النفي والإثبات بعد ذلك فالكفر والإيمان متقابلان إذا زال أحدهما خلفه الآخر

**“Bu məsələdə doğru olanı bilmək imanın və küfrün həqiqətini bilməyə bağlıdır. Nəfy etmək və isbat etmək ancaq bundan sonra səhih olur. İman ilə küfr isə bir-birinin qarşılığıdır. Bunlardan biri yox olduqda digəri onun yerini alır.”**[145]

Bu, əhəmiyyəti əvəzsiz bir mövzudur və müəllif tərəfindən söylənilmiş çox gözəl bir sözdür. O zaman bu həqiqətin nə olduğuna baxmağımız lazımdır. Bu mövzuda əməllərin imandan ayrılması və yaxud da əməlin imandakı yerinə diqqət etmək ən əsas məsələdir.

İmanın həqiqətindən danışdıqda, bunun söz və əməldən ibarət olduğunu ən əhatəli şəkildə anlamalıyıq. Söz yalnız dilin sözü anlamına gəlməz. Söz həm qəlbə aiddir, həm də dilimizə aiddir. Qəlbin sözü etiqaddır. Dilin sözü isə şəhadət kəlimələrini tələffüz etməkdir. Bunun üzərində hər kəs razılaşır, bəzi zəlil qruplardan başqa heç kəs bunu inkar etməmişdir. Eləcədə qəlbin əməlləri də mövcuddur. Qəlbin əməlləri isə təsdiq etmək, iqrar etmək, secmək, təvəkkül etmək, qorxmaq, ümüd bəsləmək kimi batini əzalarımızın qadir olduğu əməllərdir. Zahiri əməllər isə hər kəsə məlumdur. İbnul-Qayyim, rahiməhullah, bunun

[145] ”**Kitəb əs-Salət va Hukmu Tərikihə**”, səh: 53

əhəmiyyətini bu şəkildə qeyd edir:

وههنا أصل آخر، وهو أن حقيقة الإيمان مركبة من قول وعمل. والقول قسمان: قول القلب، وهو الاعتقاد، وقول اللسان، وهو التكلم بكلمة الإسلام. والعمل قسمان: عمل القلب، وهو نيته وإخلاصه، وعمل الجوارح، فإذا زالت هذه الأربعة، زال الإيمان بكماله، وإذا زال تصديق القلب، لم تنفع بقية الأجزاء، فإن تصديق القلب شرط في اعتقادها وكونها نافعة. وإذا زال عمل القلب مع اعتقاد الصدق، فهذا موضع المعركة بين المرجئة وأهل السنة

**"Burada başqa bir əsas qayda mövcuddur. O da imanın həqiqətinin söz və əməldən ibarət olmasıdır. Söz iki qismdir: Qəlbin sözü və bu, etiqaddır. Dilin sözü və bu, İslam kəlimələrini söyləməkdir. Əməl də iki qismdir: Qəlbin əməli və bu, qəlbin ixlası və niyyətidir. Əzaların əməli. Əgər bunların dördü də yox olarsa, iman da tamamilə yox olar. Əgər qəlbin təsdiqi yox olarsa, digər hissələr fayda verməz, çünki qəlbin təsdiqi onun etiqadı və fayda verməsi üçün şərtdir. Doğruluğuna etiqad etməklə bərabər qəlbin əməlləri yox olarsa, (bəs necə)? Bax, bu mövzu mürciə ilə əhli-sünnət arasında münaqişə məsələsidir."**[146]

Qəlbin əməllərinin yox olması ilə iman da yox olurmu? İbnul-Qayyimin sözlərindən anladığımız kimi mürciə ilə əhli-sünnətin arasında bu mövzuda fərq vardır. Bu heç də o, anlama gəlmir ki, mürciə qəlbin əməllərini imandan saymır. Xeyr! Əslində mürciələrin əksəriyyəti qəlbin əməllərini imandan sayırlar. Lakin onlar əhli-sünnətdən fərqli olaraq qəlb əməllərinin yox olmasının imanı yox etmədiyinə etiqad edirlər, çünki onlara görə iman sadəcə qəlbin təsdiqi ilə mövcud ola bilər. Əgər qəlbdə təsdiq varsa, iman da mövcuddur. Əhli-sünnət yekdilliklə qəlb əməllərinin aradan qalxması ilə imanın da yox olacağına etiqad edir. İbnul-Qayyim,

[146] "**Kitəb əs-Salət va Hukmu Tərikihə**", səh: 53

*rahiməhullah*, deyir:

فأهل السنة مجمعون على زوال الإيمان، وأنه لا ينفع التصديق مع انتفاء عمل القلب، وهو محبته وانقياده، كما لم ينفع إبليس وفرعون وقومه واليهود والمشركين الذين كانوا يعتقدون صدق الرسول، بل ويقرون به سراً وجهراً ويقولون: ليس بكاذب، ولكن لا نتبعه، ولا نؤمن به.

**"Əhli-sünnətin icmasına görə belə halda insanda iman qalmaz və qəlbin əməlləri olmadığı halda təsdiq heç bir fayda verməz. Qəlbin əməlləri isə əsasən qəlbin sevgisi və bağlılığıdır. Necəki bu, İblisə, Firona, Fironun qövmünə, Rasulun doğruluğuna etiqad edən, hətta gizli və açıq şəkildə bunu qəbul edən və "Yalançı deyildir, lakin biz ona tabe olmarıq və ona iman gətirmərik" deyən yəhudi və müşriklərə də fayda verməmişdir."**[147]

Aydın oldu ki, qəlbin əməli olmadan insanda iman ola bilməz. Bunu iddia edən kəs heç şübhəsiz ki, mürciələrin etiqadını bölüşür. Buraya qədər İbnul-Qayyimdən nəql etdiklərimizdən sonra aydın olur ki, həm qəlbin sözü, həm də qəlbin əməlinin yox olması ilə insanda iman qalmaz. Dilin sözü də bunun kimidir və mürciələrin, xavariclərin və əhli-sünnətin ittifaqı ilə dilin sözü olmadan insan müsəlman ola bilməz. Əksinə insanın müsəlmanlığının hər şeydən əvvəl zahirən sabit olması üçün tövhid kəlimələrini tələffüz etməsi lazımdır. Bu məsələdə yalnız cəhmiyyə məzhəbi fərqli bir görüşü mənimsəyərək Allahın haqq yolundan uzaq düşüblər. Onlara görə qəlb ilə Allahı tanımaq insanın möminliyi üçün kifayətdir və bu sözlərinə görə ümmətin sələfi onları təkfir etmişdir. İzah etdiyimiz bu həqiqət barədə heç kəsdə zərrə qədər də şübhə ola bilməz. Burada sonuncu bir sual cavabsız qalmışdır: Zahiri əməllərin yox olması ilə, insanın qəlbində iman öz

---

[147] "**Kitəb əs-Salət va Hukmu Tərikihə**", səh: 53-54

mövcudluğunu davam etdirə bilərmi? Bizim mövzumuz ilə ən yaxından əlaqəli olan məsələ, məhz bu məsələdir və çox ehtimal ki, İbnul-Qayyimin öz görüşü bu etiqada əsaslanır. O, deyir:

وإذا كان الإيمان يزول بزوال عمل القلب، فغير مستنكر أن يزول بزوال أعظم أعمال الجوارح، ولا سيما إذا كان ملزوماً لعدم محبة القلب وانقياده الذي هو ملزوم لعدم التصديق الجازم كما تقدم تقريره، فإنه يلزم من عدم طاعة القلب عدم طاعة الجوارح؛ إذ لو أطاع القلب وانقاد، أطاعت الجوارح، وانقادت، ويلزم من عدم طاعته وانقياده عدم التصديق المستلزم للطاعة، وهو حقيقة الإيمان. فإن الإيمان ليس مجرد التصديق، كما تقدم بيانه

**“Əgər qəlbin əməlinin yox olması ilə, iman da yox olursa, əzaların əməllərinin ən əzəmətlisinin yox olması ilə də, xüsusilə də bu əməlin yoxluğu qəlbdəki sevgi və bağlılığın yoxluğunu zəruri qılırsa, qəlbin imanının da yox olması heç kəsə yad deyildir. Beləki, yuxarıda da izah etdiyimiz kimi qəlbdəki sevgi və bağlılığın yoxluğu qəti bir təsdiqin olmamasını zəruri qılır. Həqiqətən qəlbin itaətsizliyi əzaların da itaətsizliyini tələb edir, çünki əgər qəlb itaət etsəydi və boyun əysəydi, əzalar da itaət edər və boyun əyərdi. Bununla da itaətin və bağlılığın olmaması, insanı itaətə təhrik edən təsdiqin olmamasını tələb edir və bu, imanın həqiqətidir, çünki bir az əvvəl izah etdiyimiz kimi iman, sadəcə olaraq təsdiq deyildir.”**[148]

İbnul-Qayyim əməllərdən danışarkən namazı xüsusi olaraq qeyd etmişdir və namazı əməllərin ən əzəmətlisi olaraq vəsf etmişdir. Bu gözəl izahı hifz edin! Bu sözlərin əhəmiyyəti izah olunmaz dərəcədə böyükdür. Sələfin bu barədə sözləri boldur. Zahiri əməllərin yoxluğu ilə, qəlb əməlləri, yəni sevgi, inqiyad, qorxu, təvəkkül və digər əməllər də yox olar. Bir insanın Allahı sevdiyini və yaxud da Ondan qorxduğunu iddia

---

[148] ”**Kitəb əs-Salət va Hukmu Tərikihə**”, səh: 54

etməsi ilə birlikdə, Onun qarşısında səcdə etməməsi necə də təzadlı bir haldır. Belə bir insan yalançıdır. Qəlbində zərrə qədər də Allaha sevgi olan insan, ən azından ona bir dəfə də olsa, səcdə edər! Biz burada özəl məhəbbətdən danışırıq, elə bir məhəbbət ki, birinin valideynə, xanımına, dostlarına qarşı məhəbbəti onunla müqayisə olunmasın. Əgər insan başqasını Allahdan çox sevirsə, zatən onun Allaha olan bu məhəbbəti heç cür fayda verməz. Zərrə qədər sevgi deyildikdə, Allahdan başqa heç kəsə qarşı duyulmayan bir sevgini qəsd edirik. Belə bir duyğu imkan çərçivəsində insanı hərəkətə sövq edər. Hərəkətin, yəni əməllərin olmaması da, belə bir sevginin olmadığına dəlalət edir. İmam Əbu Bəkr əl-Acurri, *rahiməhullah*, deyir:

فالأعمال – رحمكم الله – بالجوارح تصديق عن الإيمان بالقلب واللسان، فمن لم يصدق الإيمان بعمل جوارحه؛ مثل الطهارة والصلاة والزكاة والصيام والحج والجهاد، وأشباه لهذه، ورضي من نفسه بالمعرفة والقول لم يكن مؤمناً، ولم تنفعه المعرفة والقول، وكان تركه للعمل تكذيباً لإيمانه، وكان العمل بما ذكرناه تصديقاً منه لإيمانه، وبالله التوفيق

**"Allah sizə rəhm etsin! Əzalarla əməl etmək, qəlb və dildəki imanı təsdiq etmək deməkdir. İmanı təharət, namaz, zəkat, oruc, həcc, cihad və bənzəri əməllərlə təsdiq etməyən və qəlb ilə marifəti və dil ilə söyləməyi özü üçün kifayət görən kəs mömin olmaz, bilmək və söyləmək ona fayda verməz. Əməli tərk etməsi imanını yalanlamaq deməkdir, zikr etdiyimiz əməlləri etməsi isə imanını təsdiq etməsi deməkdir. Tövfiq Allahdandır."**[149]

Bu, əhlis-sünnətin imamı Əbu Bəkr əl-Acurrinin sözləri idi. Onun zamanında imanın həqiqəti məsələsi alimlər arasında bu şəkildə qəbul edilirdi. Daha sonra gələn fəlsəfəçilər və kəlamçılar isə və yaxud da onların təsirinə düşmüş fəqihlər

---

[149] “**Kitəb əş-Şəriah**”, 2/614

imanın həqiqəti məsələsində sələf ilə xələfin fikirlərini cəm etməyə çalışdılar. Bununla da haqqa isabət etdiklərini düşünürdülər. Halbuki, belə bir üsul məqbul deyildir. Sələfin iman barədəki görüşləri aydındır. Əl-Valid bin Muslim əl-Quraşi, *rahiməhullah*, deyir:

سمعت الأوزاعي، ومالك بن أنس، وسعيد بن عبد العزيز؛ ينكرون قول من يقول: إن الإيمان قول بلا عمل، ويقولون: لا إيمان إلا بعمل، ولا عمل إلا بإيمان

**"Əl-Əvzai, Malik ibn Ənəs və Said ibn Abdulazizi dinlədim. Onlar "İman əməlsiz sözdür" deyənləri inkar edərdilər və belə deyərdilər: "Əməlsiz iman yoxdur, imansız da əməl yoxdur!"**[150]

Bu sözlərin səhihliyini isbat etmək üçün sözümüzü burada uzatmağa ehtiyac duymuruq, çünki səhabə və sələfin bu barədəki sözləri kifayət etməlidir. Zahiri əməllər olmadan insanda imanın olması mümkün deyildir. Buna xüsusi diqqət yetirin, çünki bu zamanımızdakı elm tələbələrinin çoxunun yanıldığı bir məsələdir.

İbnul-Qayyim, *rahiməhullah*, bu qaydalardan sonra digər əhəmiyyətli məqamları da qeyd edir. Küfrün iki növünün olduğunu zikr edir və bunun dəlillərini təqdim edir. Daha sonra isə insanda küfr ilə imanın, şirk ilə tövhidin bir arada ola biləcəyini də vurğulayır. Heç şübhəsiz ki, böyük küfr ilə iman bir arada ola bilməz. Eləcədə böyük şirk ilə tövhid bir arada ola bilməz. Məhz buna görə də İbnul-Qayyim bu qaydadan əvvəl küfrün iki növünün olduğunu qeyd etmişdir. Bununla da insanda böyük küfr ilə imanın bir arada ola bilməyəcəyi aydın olur.

Daha sonra isə yeni bir məsələni gözəl bir şəkildə izah

150 əl-Laləkay, "**Şərhu Usuli İtiqad**", 4/930 (1586)

edir:

هنا اصل آخر وهو أنه لا يلزم من قيام شعبة من شعب الإيمان بالعبد ان يسمى مؤمنا وإن كان ما قام به إيمانا كافرا

**“Burada başqa bir əsas da vardır və o da budur ki, bir insanın etdiyi hər nə qədər imanı saxlayan bir şey olsa da, imanın şöbələrindən bir şöbənin olması ona mömin deyilməsini zəruri etmir.”**

Bu məqamı zikr etdikdən sonra eyni qaydanın da küfr şöbələrinə də aid olduğunu deyir. Eləcədə küfr şöbələrindən bir şöbəyə sahib olan kəsə, həmən kafir adı verilməz. Çünki bir insanda iman ilə kiçik küfr bir arada ola bildiyi kimi, böyük küfrü olduğu halda üzr sahibi də ola bilər. Bütün bunları söylədikdən sonra deyir:

و المقصود أن سلب الإيمان عن تارك الصلاة أولى من سلبه عن مرتكب الكبائر ، و سلب اسم الإسلام عنه أولى من سلبه عمن لم يسلم المسلمون من لسانه و يده ، فلا يسمى تارك الصلاة مسلما و لا مؤمنا ، و إن كان معه شعبة من شعب الإسلام أو الإيمان

**“(Bura qədər dediklərimiz ilə) qəsd olunan budur: Namazı tərk edən kəsdən imanı nəfy etmək, böyük günah sahiblərindən imanı nəfy etməkdən daha münasibdir. Namazı tərk edən kəsdən İslam adını nəfy etmək, dilindən və əlindən müsəlmanların salamat olmadığı kəsdən İslam adının nəfy edilməsindən daha münasibdir. Beləliklə namazı tərk edəndə İslamın və ya imanın şöbələrindən bir şöbə olsa belə, ona müsəlman və ya mömin adı vermək olmaz.”**

Bu sözlərindən əvvəl İbnul-Qayyim kafirdə belə imanın şöbələrindən hər hansı bir şöbənin ola biləcəyini qeyd etmişdi. Onun bu sözlərini əvvəlki sözlərinin işığında anlamaq lazımdır.

Şeyx əl-Albani, *rahiməhullah,* İbnul-Qayyimin bu sözlərini kitabında nəql edir[151] və buna qarşı ümumi mənada dəlillər ilə etiraz edir. Lakin İbnul-Qayyimin daha sonrakı sözləri buna aydınlıq gətirir və qətiyyətlə namazı tamamilə tərk edən kəsin kafir olduğunu isbat edir. İbnul-Qayyim, *rahiməhullah*, yuxarıda nəql etdiyimiz sözlərin davamında deyir:

نعم يبقى ان يقال فهل ينفعه ما معه من الإيمان في عدم الخلود في النار فيقال ينفعه إن لم يكن المتروك شرطا في صحة الباقي واعتباره وإن كان المتروك شرطا في اعتبار الباقي لم ينفعه ولهذا لم ينفع الإيمان بالله ووحدانيته وأنه لا إله إلا هو من أنكر رسالة محمد ولا تنفع الصلاة من صلاها عمدا بغير وضوء فشعب الإيمان قد يتعلق بعضها ببعض تعلق المشروط بشرطه وقد لايكون كذلك

**"Bəli, ortada bu sual qalır: Namazı tərk edən bu kəsin bərabərindəki imanı onun cəhənnəmdə əbədi qalmamasına fayda verəcəkmi? Bunun cavabı belədir: "Tərk edilən şey qalan hissənin səhihliyində və etibarlılığında şərt deyilsə, fayda verə bilər. Əgər tərk edilən şey qalan hissənin etibarlılığı üçün şərtdirsə, fayda verməyəcəkdir. Buna görə də Muhamməddin peyğəmbərliyini inkar edən üçün Allaha, Onun təkliyinə, Ondan başqa ibadətə layiq məbudun olmadığına iman gətirməsi fayda verməyəcəkdir. Qəsdən dəstəmazsız namaz qılan kəsə namazın heç bir faydası yoxdur. İmanın şöbələrindən bəziləri digərləri ilə şərt və məşrut əlaqəsi kimi əlaqədə ola bilir, bəzən də belə olmaz."**

İbnul-Qayyimin sözlərindən anlayırıq ki, imanın bəzi şöbələri digər şöbələrinin etibarlı sayılması üçün bir şərtdir. Məsələn: Şəhadət kəlimələrini söyləmək imanın digər şöbələrinin qəbul olunması üçün bir şərtdir. Əgər imanın bu şöbəsi olmazsa, digər şöbələrinin olması heç bir fayda verməz

---

151 "**Hukmu Tərik əs-Saləh**", səh: 39-40

və sahibini atəşdə əbədi qalmaqdan qurtarmaz. Başqa cür desək, şəhadət kəlimələrini tərk edən üçün, digər əməllərin heç bir faydası yoxdur. Bəs namazın hökmü nədir? Namaz imanın şöbəsi kimi digər şöbələrin qəbul olunması üçün şərtdirmi? Əgər şərtdirsə, namazı tərk edən müsəlman sayılmaz və atəşdə əbədi qalmaqdan qurtulmayacaq. Lakin əgər şərt deyilsə, atəşdə əbədi qalmayacaq! Görək İbnul-Qayyim, bu nisbətdə namazın hökmünü necə izah edir:

فيبقى النظر في الصلاة هل هي شرط لصحة الإيمان
هذا سر المسألة والأدلة التي ذكرناها وغيرها تدل على أنه لا يقبل من العبد
شيء من اعماله إلا بفعل الصلاة فهي مفتاح ديوانه ورأس مال ربحه ومحال
بقاء الربح بلا رأس مال فإذا خسرها خسر أعماله كلها وإن اتى بها صورة

**“Sonda namaz barədə mübahisə qalmışdır, namaz imanın səhihliyi üçün şərtdirmi?**
**Bu isə məsələnin sirridir. Zikr etdiyimiz dəlillər və daha başqa dəlillər namazı olmadıqda qulun heç bir əməlinin qəbul edilməyəcəyinə dəlalət edir. Namaz onun əməl dəftərinin açarıdır, qazancının sərmayəsidir. Sərmayəsiz qazancın davam etməsi imkansızdır. Sərmayəsini əldən versə, bütün əməllərini – üzdə etsə belə - itirəcək.”**

Diqqət edin! Məgər bu sözlər kifayət etməzmi?! İbnul-Qayyimin – *Allah ona rahmət etsin* - məsələdəki görüşü budur və onun bütün bu sözlərini cəm etdikdə yalnız bu nəticəyə gəlmək olur. Ey müsəlman! Diqqət et! Məgər heç bir əməli qəbul olmadığı halda, insana dili ilə deməsi fayda verə bilərmi?! Heç bir hədisdə sadəcə dil ilə şəhadət sözlərini tələffüz etməyin fayda verəcəyi qeyd olunmamışdır, lakin ixlas ilə dediyi halda fayda verəcəyi söylənilmişdir. Məgər bir insan ixlas ilə şəhadət edirsə və sidq ilə buna etiqad edirsə, imkanı olduğu halda Allaha səcdə etməməsi mümkündürmü?! Ey Müsəlman! Diqqət et! Bütün bunlar Quran və Sünnətdən gələn

dəlillərə əsaslanır və namazı tərk edənin küfrü barədə dəlillər güclüdür! Müxaliflərin gətirdiyi dəlillər isə o qədər zəifdir ki, onların ümumi mənadan başqa bir şey ifadə etmədiyini görürük. Bu dəlillər, mürciənin əhli-sünnətə qarşı gətirdiyi dəlillərin eynisidir və bu barədə qarşıda – inşə Allah - Şeyxul-İslam İbn Teymiyyənin, *rahiməhullah*, sözünü zikr edəcəyik.

İbnul-Qayyimin "Namaz" kitabındakı bu faydalı məqamları özətlə sizlərə təqdim etdik və bu sözlərdən faydalanmağa çalışın. Kitabın özünə müraciət etməyi tövsiyyə edirik, çünki onun təlif etdiyi bu kitab bu mövzuda yazılmış əvəzsiz bir kitabdır.

Burada bir şeyi qeyd etmək lazımdır. Şeyx əl-Albani kitabında İbnul-Qayyimi bu sözlərinə görə tənqid edərkən deyir:

فأقول : يبدو لي جليا أن ابن القيم رحمه الله بعد بحثه القيم في التفريق بين الكفر العملي والكفر الاعتقادي وأن المسلم لا يخرج من الملة بكفر عملي لم يستطع أن يحكم للفريق المكفر بترك الصلاة مع الأدلة الكثيرة التي ساقها لهم لأنها كلها لا تدل على الكفر العملي

**"Mən də deyirəm: Mənə açıq-aydın görünür ki, İbnul-Qayyim, *rahiməhullah*, əməli küfr ilə etiqadı küfrü bir-birindən ayırd edən və bir müsəlmanın əməli küfrlə İslam ümmətindən çıxmayacağını açıqlayan dəyərli araşdırmasından sonra namazı tərk edəni təkfir edən qrupun bir çox dəlillərini zikr etdiyi halda, bu barədə qəti bir hökm verə bilməmişdir. Çünki bu dəlillərin hamısı əməli küfrə dəlalət edir."**[152]

Şeyx əl-Albani, *rahiməhullah*, burada öz anlayışı ilə İbnul-Qayyimin anlayışını eyniləşdirdiyi üçün xətaya yol

---

[152] **"Hukmu Tərik əs-Salət", səh: 41**

vermişdir. Şeyx əl-Albaninin özünə görə bütün etiqadi küfrlər böyük küfrdür və bütün əməli küfrlər isə kiçik küfrdür. Ona görə əməli küfrlər etiqadi küfrlə birləşdikdə böyük küfrə çevrilir. Təbii ki, bu, çox xətalı və əsassız bir görüşdür. Nə də ki, İbnul-Qayyim bu mənada bir söz söyləməmişdir. Əksinə o, əməldəki küfrün özünü də iki qismə ayırmışdır və onların bir qisminin böyük küfr olduğunu qeyd etdikdən sonra digər əməli küfrlərin də kiçik küfr olduğunu söyləyir. Namazı tərk etməyi isə bunların heç birinə aid etməmişdir və qəti bir söz söyləməmişdir. Bunun izahını mövzunun axarına buraxmışdır və gördüyümüz kimi mövzunun sonunda namazın imanın səhihliyi üçün şərt olduğunu və dəlillərin buna dəlalət etdiyini vurğulamışdır. Bütün bunlardan sonra Şeyx əl-Albaninin iradının heç bir yeri yoxdur! Onun namazı imanın kamiliyi üçün şərt görməsi və daha sonra isə ümumiyyətlə bütün əməllərin imanın kamilliyi üçün şərt olduğunu deməsi xətalı bir anlayışın nəticəsidir. Bu məsələni isə burada ələ alsaq sözümüz uzanacaq və sonda mövzudan yayınmış olarıq. Doğrusunu Allah bilir!

## Xavaricin Əhli-Sünnətdən fərqi

Buraya qədər mövzu ilə bağlı yazılan bəzi kitablardakı

səhv anlayışın nə olduğunu gördük. Şeyx əl-Albaninin də etdiyi xətalara deyindik, lakin onun sözləri içində söylədiyi ən qəribə söz, namazı tərk edənlərin görüşlərində xaricilərə oxşadığını söyləməsidir. O, *rahiməhullah*, deyir:

فلو قال قائل بأن الصلاة شرط لصحة الإيمان وأن تاركها مخلد في النار فقد التقى مع الخوارج في بعض قولهم هذا وأخطر من ذلك أنه خالف حديث الشفاعة هذا كما تقدم بيانه .

**"Kimsə namazın imanın səhihliyi üçün şərt olduğunu və onu tərk edənin atəşdə əbədi qalacağını söyləsə, o kəs xaricilərlə bəzi sözlərində birləşmiş olur. Daha təhlükəli isə budur ki, izahını verdiyimiz şəfaət hədisinə müxalif olmuş olur."**[153]

Allah böyükdür! Yalnız ona sığınırıq! Bu haqqdan uzaq bir sözdür. Səhabələrin icması və tabiinin və hədis əhlinin cumhuru namazı tərk edəni kafir gördüyü halda, onları zəmm edilmiş xavaric firqəsinə bənzətmək əsassız bir sözdür. Xüsusilə də şəfaət hədisində zənn edilən bir dəlilin olmadığını göstərdikdən sonra, burda təhlükəli bir şeyin olmadığını, əksinə dəlillərdə olmayan xüsusiyyətləri sonradan əlavə etməyin təhlükəli olduğunu görürük. Biz deyirik: İbn Teymiyyə, *rahiməhullah*, bu mövzunu müzakirə edərkən "namazı tərk edəni təkfir etməyən fəqihlərin mürciə firqəsinin düşdüyü eyni şübhələrə düşdüklərini" bildirir. İbn Teymiyyənin bu sözlərini – inşə Allah – qarşıda təqdim edəcəyik. Bizə görə fəqihlərdən namazı tərk edəni təkfir etməyənlər mürciələrə bənzəməz. Mürciələr bu hökmlərini öz məzhəbləri üzərində qurmuşdur, lakin fəqihlərin halı isə fərqlidir. Onlar təkfir edən dəlilləri fərqli anlamışlar və yaxud da bu, onların halında tam tərcih məsələsi olmuşdur.

Xaricilər böyük günah sahiblərini təkfir edirlər və onlar eləcədə vacib olan əməllərdən hər hansı birinin tərk edilməsi ilə

---

[153] "**Hukmu Tərik əs-Salət**", səh: 42

insandakı imanın yox olacağına etiqad edirlər. Onlar da mürciələr kimi imanı tam və parçalanmaz bir bütöv kimi qəbul edirlər.

Əhli-Sünnətə görə isə namaz, digər fərzlərdən fərqlənir və namaz, səhih dəlillərə görə müşriklər ilə möminlərin arasındakı ayırıcı bir həddir. Namazı olmayanın dini yoxdur, namazın tərk edilməsi peyğəmbərimiz, *salləllahu aleyhi va səlləm*, tərəfindən şirk və küfr olaraq vəsf edilmişdir. Bu hədislər qeydə bağlı olmayan hədislərdir. Küfr ləfzinin işləndiyi, lakin həqiqətdə isə insanı dindən çıxarmayan küfr olan digər dəlillərdən fərqli olaraq heç bir qeydə bağlı deyildir.

Ümmət namaz və İslamın digər sütunlarına görə tərk edənin təkfir edilməsində ixtilaf etmişdir və onlardan təkfir etməyənlər digər tərəfi xaricilikdə və ya onlara bənzəməkdə ittiham etməmişdir. Yalnız İbn Rüşd əl-Hafidin bu barədə dediyi söz bir qədər Şeyx əl-Albaninin sözünə bənzəyir.[154]

Günahlara görə təkfir etmək ilə namazın və ya digər İslam sütunlarının tərkinə görə təkfir etmək eyni deyildir. İslamın beş sütunu digərlərindən seçilir və bunun günahı, şərab içmək və zina etmək günahı kimi deyildir. Şeyxul-İslam, *rahiməhullah*, deyir:

وقد اتفق المسلمون على أنه من لم يأت بالشهادتين؛ فهو كافر، وأما الأعمال الأربعة؛ فاختلفوا في تكفير تاركها، ونحن إذا قلنا: أهل السنة متفقون على أنه لا يكفر بالذنب، فإنما نريد به المعاصي، كالزنا والشرب، وأما هذه المباني، ففي تكفير تاركها نـزاع مشهور

**“Şəhadət kəlimələrini söyləməyənin kafir olmasında müsəlmanlar ittifaq etmişlər. Lakin digər dörd əmələ gəldikdə isə, onların tərk edilməsi barədə ixtilaf ediblər və biz, “əhli-sünnət, ittifaq etmişik ki, günahlara görə təkfir edilməz” dedikdə, bununla zina və şərab içmək kimi masiyətləri qəsd edirik. Lakin İslamın bu sütunlarına**

[154] ”**Bidəyətul-Muctəhid**”, 1/228

**gəldikdə isə, onları tərk edənin təkfir edilməsindəki ixtilaf məşhurdur.”**[155]

Qeyd etmək lazımdır ki, namazı tərk edəni kafir görməyənlər heç də əməlləri imanın kamilliyi üçün şərt saymamışlar. Onlara görə də əməllər imanın səhihliyi üçün şərt olmuşdur. Əhli-Sünnətin mürciədən fərqi bundadır ki, mürciə əməllərin tərk edilməsinə görə təkfir etməzlər və onlara görə insan yalnız etiqadına görə təkfir edilər. Onlar, “insan istənilən əməli tərk etsə, hətta ömrü boyu heç bir əməl etməsə də iman sahibidir” deyirlər. Bu isə əhli-sünnətin görüşlərindən fərqlidir, çünki əhli sünnətə görə insan söz, əməl və şəkkə görə təkfir olunur, eləcədə əməllərin tərk edilməsinə görə də təkfir edilir. Cabir bin Abdullahdan rəvayət edilən hədisə nəzər salsaq işin həqiqətini görmüş olarıq. əl-Mərvazi deyir: Muhamməd bin Yəhya bizə rəvayət etdi: İsmail bin Abdullkərim əs-Sanani rəvayət etdi: İbrahim bin Aqil bin Muqal bin Munəbbəh bizə atası Aqildən, o da Vəhb bin Munəbbəhin, Cabir bin Abdullahdan belə soruşduğunu rəvayət etdi:

سألته: هل في المصلين من طواغيت؟ قال: لا، وسألته: هل منهم مشرك ؟ قال: لا، وأخبرني أنه سمع النبي صلى الله عليه وسلم يقول: "**بين الشرك والكفر؛ ترك الصلاة**"، وسألته: أكانوا يَدْعون الذنوبَ شركًا؟ قال: معاذ الله، ولم يكن يدعون في المصلين مشركًا.

**“Ondan soruşdum: “Namaz qılanlar arasında tağutlardan varmı?” Dedi: “Xeyr!” Ondan soruşdum: “Onların arasında müşrik varmı?” Dedi: “Xeyr!” və peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, belə eşitdiyini mənə xəbər verdi: “(İnsan ilə) şirk və küfr arasında namazı tərk etmək durur.” Ondan soruşdum: “Günahları şirk adlandırırdılar?” Dedi: “Allah**

155 ”**Məcmu əl-Fətava**”, 7/302

**qorusun! Onlar namaz qılanları müşrik adlandırmazdılar"**[156]

Bu hədisin dəlalət etdiyi məna budur ki, səhabələrə görə namazı tərk etmək şirk sayılmışdır və onlara görə namazı tərk etmək digər günahlarla eyni səviyyədə olmamışdır. Çünki Vəhbin sualına bu tərzdə cavab verməsi, onun sözünü inkar etməsini göstərir.

Bu barədə Şeyx Abdulaziz bin Baz, *rahiməhullah*, deyir:

---

[156] əl-Mərvazi, (889); əl-Heysəmi, "**Mucmə əz-Zəvaid**", səh: 181
Hədisin raviləri siqadır. Lakin "Təhzib əl-Kəməl" əsərində (3/140) zikr olunduğuna görə İbn Main, Vəhbin Cabir bin Abdullahdan hədis eşitdiyini inkar etmişdir. Lakin Alləmə əl-Mizzi kitabında buna cavab verərək İbn Xuzeymənin eyni sənəd ilə bir başqa hədisi rəvayət etdiyini qeyd edir və sonra deyir:

وهذا إسناد صحيح إلى وهب بن منبه، وفيه ردٌّ على من قال: إنه لم يسمع من جابر، فإن الشهادة على الإثبات؛ مقدمة على الشهادة على النفي، وصحيفة همام عن أبي هريرة؛ مشهورة عند أهل العلم، ووفاة أبي هريرة، قبل وفاة جابر، فكيف يُستنكر سماعه منه، وكانا جميعًا في بلد واحد

**"Bunun isnadi Vəhb bin Munəbbəhə qədər səhihdir və bunda "o, Cabirdən eşitməmişdir" deyənlərə rədd vardır. Çünki isbat üçün şahidlik, inkar üçün şahidlikdən üstündür. (Üstəlik) Huməmin Əbu Hureyrədən səhifəsi elm əhli yanında məşhurdur, Əbu Hureyrə isə Cabirdən əvvəl vəfat etmişdir. Bəs o zaman ondan eşitməsini necə inkar etmək olar? Axı onların hamısı eyni yerdə yaşamışdır."**
"Təhzib əl-Kəməl", 3/140
əl-Mizzinin sözlərinin izahı belədir: Vəhb bin Munəbbəh təxminən hicri yüz onlarda ölmüşdür. Huməm isə hicri 132-ci ildə ölmüşdür. Cabir, radiyallahu anhu, hicri 72-ci ildə vəfat etmişdir, lakin Əbu Hureyrə isə, radiyallahu anhu, hicri 57-ci ildə ölmüşdür. Əgərin Huməmin Əbu Hureyrədən rəvayət etdiyi səhifəsi sabitdirsə, Vəhb bin Munəbbəhin Cabirdən rəvayət etdiklərinin səhih olması daha doğrudur.
Eləcədə İmam Muslim, rahiməhullah, Vəhbin tərcüməsində, onun Cabirdən və İbn Abbasdan hədis eşitdiyini qeyd edir.
"əl-Kunyə", (1819)

لم أنقل كلام العلماء المتعلق بتكفير تارك الصلاة ، وهم جمهور أصحـاب الحديث، علمـاً أنهـا أقـوال كثـيرةٌ جداً مبثوثة في كتب السّلف ، وذلك لأنّها مسألة اختلف فيها أصحاب الحديث ، لكن هاهنا مسألة مهمة ، وهي أن أصحاب الحديث الذين لم يكفروا تارك الصّلاة ، لا يعنون أنّ الصلاة عملٌ ، والعمل لا يكفّر تاركه أو فاعله بغير اعتقاد أو استحلال أو تكذيب ، فهذه لَوثةٌ إرجائية حاشاهم منها ، بل كما نقل عنهم المروزي قالوا :[الأخبار التي جاءت في الإكفار بترك الصّلاة نظير الأخبار التي جاءت في الإكفار بسائر الذنوب]. فهم نظروا إلى الأدلة التي ظاهرها التعارض فجمعوا بينها ، ورجّحوا عدم إكفَار تارك الصّلاة ، كتارك الصّوم والزّكاة ، إلا إذا تركها جحوداً أو إباءً أو استنكافاً. ولم يُنقل عن أحد منهم أنّ الصّلاة عمل وليست اعتقاداً ولا يكفُر تارك العمل! كما أنّهم لم يعدّوا من يكفّر تاركها بمثابة الخوارج الذين يكفرون بالذّنوب ، وهذا إقرارٌ منهم أنّ تارك العمل قد يخرج من الملة ، لكن لم يترجّح عندهم ذلك في شأن تارك الصّلاة

**“Namazı tərk edən alimlərin sözlərini nəql etmirəm. Onlar hədis əhlinin əksəriyyətini təşkil edirlər. Çünki məlumdur ki, onların sözləri çoxdur və bunlar sələfin kitablarında sabitdir. Eləcədə ona görə ki, bu məsələdə hədis əhli ixtilaf etmişdir. Amma burada əhəmiyyətli bir məsələ vardır. O da budur ki, namazı tərk edəni kafir saymayan hədis əhli, bununla "*namazın əməl olduğunu və əməl, onu tərk edəni və yaxud ona əməl edəni etiqad və ya istihlal və yaxud da təkzib olmadan kafir etməz*" anlamını qəsd etməyiblər. <u>Bunlar irca çirki və ləkələridir və onlardan uzaqdır.</u> Əksinə əl-Mərvazinin nəql etdiyi kimi onlar deyirdilər: “Namazı tərk etməyə görə kafir olmaq barədə gələn hədislər, digər günahlara görə kafir olmaq barədə gələn hədislər ilə paraleldir.” Onlar zahirində ziddiyətlik görünən dəlillərə nəzər saldılar və onları cəm etdilər və daha sonra orucu tərk edənin, zəkatı tərk edənin halında olduğu kimi namazı tərk edənin də kafir olmayacağı görüşünü tərcih etdilər. Lakin namazın fərziyyətini inkar edərək və ya təkəbbürlük edərək və ya küçümsəyərək tərk etmək isə istisnadır. Onların heç birindən, namazın əməl olub**

**etiqad olmaması və əməlləri tərk edənin təkfir edilməyəcəyi nəql olunmamışdır. Necəki onlar, namazı tərk edəni təkfir edənləri, günahlara görə təkfir edən xavaric olaraq saymayıblar və bununla onlar təsdiq edirlər ki, əməlləri tərk edən millətdən çıxmışdır. Lakin onların nəzdində bu, namazın tərki məsələsində ağır basmamışdır."**[157]

Bu mövzu məmləkətəmizdə səhv anlaşılmışdır və bunu elmə iddialı olan bəzi kəslərin əməyinin nəticəsi olaraq da görmək olar. İbn Bazın yuxarıdakı sözlərini anlamaq üçün sələfin kitablarına müraciət etmək kifayət edər.

Hami bilir ki, İmam Şafidən namazı tərk edən haqqında iki rəy nəql edilmişdir və bu ikisindən məşhur olan rəyə görə o, namazı tərk edəni kafir görməmişdir. Lakin bununla belə İmam Şafi, *rahmətullahi aleyhi*, deyir:

كان الإجماع من الصحابة والتابعين من بعدهم ممن أدركناهم: أن الإيمان: قول وعمل ونية، ولا يجزئ واحد من الثلاثة إلا بالآخر

**"Səhabə, tabiin və onlardan sonra bizim gördüyümüz kəslər icma ediblər ki, iman söz, əməl və niyyətdir və bu üçündən biri digəri olmadan səhih olmaz."**[158]

Əhli-Sünnətin zəlalət firqələrindən fərqi bundadır. Onlara görə əməlsiz iman səhih deyildir. Onlara görə qəlbində iman olan biri əməllərin hamısını heç bir halda tərk edə bilməz. Lakin ayrılıqda isə hər hansı bir əməlin tərk edilməsinə görə təkfir edilib edilməyəcəyində ixtilaf etdilər. Namazı tərk etmək barədə iki məşhur rəy formalaşdı və onlardan heç biri digər tərəfi nə xavaric, nə də mürciə adlandırmamışdır.

---

[157] "**Ət-Təvassut əl-İqtisad fi ənnəl-Kufr yəkun bil-Qaul əu əl-Fil əu əl-İtiqad**", səh: 19

[158] "**Şərhu Usuli İtiqadi Əhl əs-Sunnəh**", 5/956 (1593); "**Məcmu əl-Fətava**", 7/209

Bu barədə səhabələrin görüşünü iki tərəfdən öyrənə bilərik. İlk əvvəl onların məsələ barədəki mövqelərini icmali şəkildə öyrənə bilirik və bu barədə dəlillər yuxarıda zikr olunmuşdu. Cabir bin Abdullahın və Abdullah bin Şaqiqin nəql etdikləri icmanı və bu rəvayətlərin təxricini zikr etmişdik.

Lakin müfəssəl şəkildə ələ alsaq bu barədə ayrı-ayrı səhabələrin görüşləri rəvayət olunmuşdur.

**Xəlifə Ömər bin əl-Xattab**ın, *radiyallahu anhu*, bu barədə sözü yuxarıda zikr olunmuşdu və onun sözləri ən qəti ifadə tərzidir. Heç bir təvilə tabe deyildir.

**Abdullah ibn Məsud**, *radiyallahu anhu,* demişdir:

من لم يصل؛ فلا دين له

**“Kim namaz qılmırsa, onun dini yoxdur!”**[159]

Şeyx əl-Albani bunu “Səhih ət-Tərğib vat-Tərhib” əsərində səhih saymışdır və “əd-Daifə” əsərində həsən olduğunu deyir.[160] Sənədindəki ravilərdən olan Asim cərh olunmuşdur, lakin hədis şahidləri ilə birlikdə qüvvətlənir.

**Əbu Bəkr**in də, *radiyallahu anhu*, sözləri yuxarıda zikr olunmuşdu. Səhabələrin icması məsələsində gətirdiyimiz

---

[159] İbn Əbi Şeybə, ”**əl-Musənnəf**”, 6/167 (30388) və “**əl-İmən**”, səh: 26 (47); əl-Mərvazi, “**əs-Salət**”, (935, 936, 937); Abdullah ibn Əhməd, “**əs-Sunnə**”, (772) və “ **Məsəil İmam Əhməd**”, (393); əl-Xalləl, “**əs-Sunnə**”, (1387); ət-Tabarani, “**əl-Kəbir**”, 9/215 (8941, 8942); İbn Batta, “**əl-İbanə**”, (888)

[160] “**Səhih ət-Tərğib vat-Tərhib**”, (573) və “**Silsilə Əhadis əd-Daifə**”, 1/25 (214)

dəlillər kifayət qədərdir.

Möminlərin əmiri **Əli ibn Əbi Talib**, *radiyallahu anhu*: Muhammədd bin Əbi İsmaildən, o da Muqal əl-Xəsamidən rəvayət etdi:

: أتى عليا رجلٌ، وهو في الرحبة، فقال: يا أمير المؤمنين، ما ترى في امرأة لا تصلي؟
قال: "**من لم يصل؛ فهو كافر**".

**“Əli meydanda olduğu zaman bir kişi yanına gəldi və dedi: Ey möminlərin əmiri, namaz qılmayan haqqında nə düşünürsən? O, dedi: "Kim namaz qılmırsa, o, kafirdir!"**[161]

Muhammədd bin İsmail siqadır, lakin onun şeyxi Muqal əl-Xasəmi isə məchuldur. İbn Hibban onun siqa olduğunu demişdir. Məlumdur ki, İbn Hibban mutəsəhhil biridir. İbn Hibbana görə haqqında cərh gəlməyən biri siqadır və buna görə bir çox alim tərəfindən tənqid olunmuşdur.

Əlidən yenə bir başqa yol ilə rəvayət olunur. Bizə Əbu Yalə əl-Huseyn bin Əli əl-Bistami rəvayət etdi: bizə Əbu Ğasən rəvayət etdi: Əsbət bin Yusuf bizə əs-Suddidən, o da Abd Xayrdən rəvayət etdi:

قال علي: "من ترك صلاة واحدة متعمدًا؛ فقد برئ من الله، وبرئ الله منه"

**“Əli dedi: “Kim bir namazını qəsdən tərk edərsə, Allahdan bəraət etmişdir və Allah da ondan bəraət etmişdir.”**[162]

Bunun sənədi zəifdir. Əs-Suddi saduqdur, lakin xəta edir.

---

161 İbn Əbi Şeybə, ”əl-Musənnəf”, 6/171 (20427) və “əl-İmən”, səh: 46 (126); əl-Mərvazi, “əs-Salət”, 2/898 (933); əl-Xalləl, “əs-Sunnə”, (1393); İbn Batta, “əl-İbanə”, (889); “əş-Şəriah”, (300)
162 ”**əs-Salət**”, 2/898 (934)

Əbsat isə xətası çox olan bir ravidir.

Bu rəvayətin sənədinin çox zəif olmadığını qəbul ediriksə, Əlidən rəvayət olunan bu iki hədis bir-birini qüvvətləndirə bilər. Doğrusunu Allah bilir!

**İbn Abbas**, *radiyallahu anhu*:
Yəhya bin Abdulhəmid dedi: Şureyk bizə Səməkdən, o da İkrimədən, o isə İbn Abbasdan rəvayət etdi:

من ترك الصلاة، فقد كفر

**"Kim namazı tərk edərsə, küfr etmişdir."**[163]

Bu rəvayətin sənədi bir çox tərəfdən illətlidir. İbn Abdulhəmidi İmam Əhməd yalançılıqda ittiham etmişdir. Şureykin hafizəsində zəiflik olduğu söylənilmişdir. Səməkin isə İkrimədən etdiyi rəvayətlər qarışıqdır.

**Bilal**, *radiyallahu anhu*:
Bişr bin Bəyən əl-Əhməsi, Qeys ibn Əbi Həzimdən rəvayət etdi:

رأى بلال رجلاً يُصلي لا يتم ركوعًا ولا سجودًا، فقال بلال: "يا صاحب الصلاة، لو متَّ الآن ما متَّ على ملة عيسى بن مريم"

**"Bilal rükusunu və səcdəsini tam etmədən namaz qılan birini gördü və ona dedi: "Ey namaz sahibi! Əgər bu an ölsən, İsa ibn Məryəmin milləti üzərində ölmüş sayılmazsan."**[164]

Bunu əl-Xalləl "əs-Sunnə" əsərində və ət-Təbərani isə "Mucəm əl-Kəbir" əsərində rəvayət etmişdir. Əl-Heysəmi "əl-Mucmə"də bunu "Mucəm əl-Əvsat" əsərinə istinad etmişdir

163 əl-Mərvazi, (930)

164 əl-Mərvazi, (943-944); əl-Xalləl, "**əs-Sunnə**", (394); ət-Təbərani, "**əl-Kəbir**", 1/356 (1085)

və ravilərinin siqa olduğunu demişdir.[165]

Qeys Bilaldan hədis eşitmişdir. əl-Buxari Qeysin Bilaldan rəvayətini təxric etmişdir. Lakin əl-Mədini onun Bilaldan rəvayət etdiyini, amma onunla qarşılaşmadığını demişdir. əl-Alai buna etiraz edərək deyir:

قلت: في هذا القول نظر، فإن قيسًا لم يكن مدلسًا، وقد ورد المدينة عقب وفاة النبي النبي صلى الله عليه وسلم ، والصحابة بها مجتمعون، فإذا روى عن أحد؛ فالظاهر سماعه منه

**”Deyirəm: Bu söz mübahisəlidir, çünki Qeys tədlis etməzdi. Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, ölümündən az sonra Mədinəyə gəlmişdir və səhabələrin hamısı orada idi. Əgər onlardan birindən rəvayət edibsə, görünən budur ki, eşidərək rəvayət etmişdir.”**[166]

Bu sözlər çox güclü əsasa dayanır. Çünki əl-Buxari, *rahiməhullah*, Qeysin Əbu Bəkrdən, *radiyallahu anhu*, hədisini qəbul etmişdir. Əbu Bəkr isə Bilaldan əvvəl vəfat etmişdir. İmam əl-Acurri mövzu barədə açdığı babda deyir:

-وقد أخرج بعض الآثار في ذلك-: ومثله عن بلال وغيره، مما يدل على أن الصلاة من الإيمان، ومن لم يصل؛ فلا إيمان له، ولا إسلام

**“Bu barədə bəzi əsərlər təxric edilmişdir: Bunun bənzəri Bilaldan və başqalarından rəvayət olunmuşdur. Bütün bunlar namazın iman olduğuna və namaz qılmayanın nə imanı, nə də İslamı olmadığına dəlalər edir.”**[167]

Əsərlərin zahiri onun namazı tərk edəni kafir gördüyünə dəlalət edir. Əgər namazını tam qılmayandan islamı nəfy edirsə, namazını heç qılmayanın kafir olacağı daha doğrudur.

---

165 “**əl-Mucmə əz-Zəvaid**”, 2/121

166 ”**Cami ət-Təhsil**”, səh: 257

167 “**əş-Şəriah**”, 1/296 (302)

**Əbu əd-Darda**, *radiyallahu anhu*:
Valid bin Muslim dedi: Abdurrahmən bin Yezid bin Cabir bizə xəbər verdi ki, Abdullah bin Əbi Zəkəriyya, Umm əd-Dardanı, Əbu əd-Dardanın sözlərini rəvayət edərkən eşitmişdir:

لا إيمان لمن لا صلاة له

**“Namazı olmayanın imanı da yoxdur.”**[168]

Valid öz şeyxindən eşidərək rəvayət etdiyi üçün tədlis etmədiyindən əminik, eləcədə şeyxi ilə şeyxinin arasında da eşitmək yolu ilə rəvayət etmişdir və bununla da onun təsviyə etmədiyindən əminik. Sənədindəki ravilər siqadır. Umm əd-Darda isə, əgər Umm əd-Darda əs-Suğradırsa, onun adı Huceymədir və siqa bir ravidir. Əgər Umm əd-Darda əl-Kubradırsa, Şeyx əl-Albaninin də söylədiyi kimi siqadır və hədisi bununla səhih saymışdır.[169] Doğrusunu Allah bilir!

Eləcədə Abdullah ibn Amrdan, Muazdan, Abdurrahmən bin Aufdan və Əbu Hureyrədən bu barədə rəvayətlər gəlmişdir. İbn Həzm bunları “əl-Muhallə” əsərində rəvayət etmişdir.[170]

Bütün bunlar səhabələrin alimlərindən rəvayət etdiyimiz sözləri idi və onların heç birindən bunun əksinə bir şey nəql olunmamışdır. Bu isə onlara görə namazı olmayanın dini olmadığını göstərən güclü bir dəlildir.

Tabii nəslindən isə rəvayət olunan əsərlərin ən məşhuru

---

168 əl-Mərvazi, 2/903 (945); əl-Xalləl, ”**əs-Sunnə**”, (1384); İbn Batta, “**əl-İbanə**”, (887); əl-Laləkay, (1536)

169 “**Səhih ət-Tərğib vat-Tərhib**”, (574)

170 Bax: “**əl-Muhallə**”, 2/243

**Məkhul**un əsəridir. İsmail bin İyəş, Abdullah bin Kulaidən rəvayət etdi:

أخذ بيدي مكحول، فقال: يا أبا وهب، ليعظم شأن الإيمان في نفسك، من ترك صلاة مكتوبة متعمدًا؛ فقد برئت منه ذمة الله، ومن برئت منه ذمة الله؛ فقد كفر.

**"Məkhul əlimi tutdu və dedi: "İmanın şanı nəfsində daha əzəmətli olsun! Kim bir fərz namazı qəsdən tərk edərsə, Allahın zimməti ondan bəraət etmişdir və kimdən Allahın zimməti uzaq olarsa, kafir olmuşdir."**[171]

Bu əsərin sənədi həsəndir. İsmail bin İyəş haqqında bəzi sözlər varid olmuşdur, beləki onun başqa məmləkət əhlindən rəvayətləri tənqid olunmuşdur. Lakin ibn Kulai isə saduqdur və dəməşqlidir. İsmailin Şam əhlindən rəvayətləri isə qəbuldur və onun Kulaidən bu rəvayətində heç bir bəis yoxdur.

**Said bin Cubeyr** isə demişdir: "**Kim namazını qəsdən tərk edərsə, küfr etmişdir.**"[172] Bunu Saiddən nəql edən ravi Leysdir və o, zəifdir.

**Nafi**nin, *rahiməhullah*, sözləri də səhabələrin görüşü ilə eynidir. Muhamməd bin Yəhya rəvayət etdi: Muhamməd bin Yusuf rəvayət etdi: Muqal bin Ubeydullah əl-Cəziri dedi:

قلت لنافع: رجل أقر بما أنزل الله تعالى، وبما بينه نبيه صلى الله عليه وسلم ، ثم قال: أترك الصلاة، وأنا أعرف أنها حق من الله تعالى، قال: "ذاك كافر" ثم انتزع يده من يدي غضبانًا موليًا.

**"Nafiyə dedim: "Bir kəs Allahu Təalənin endirdiyini və Onun peyğəmbərinin, *salləllahu aleyhi va səlləm*, bəyan etdiklərini**

---

[171] İbn Əbi Şeybə, "**əl-Musənnəf**", 6/171-172 (30429) və "**əl-İmən**", səh: 47 (129)

[172] əl-Mərvazi, 2/889 (919)

**qəbul edir və daha sonra deyir: "Mən namazı tərk edirəm, lakin onun Allahu Təalədən haqq olaraq gəldiyini bilirəm." Nafi dedi: "Belə biri kafirdir" və sonra qəzəbli halda və üzünü döndərərək əlini əlimdən çəkdi."**[173]

Muqal saduqdur, lakin xətaları vardır. Bəzi yerlərdə bunu bir qədər geniş olaraq rəvayət etmişdir. Lakin bu görüş Nafidən sabitdir və İbn Teymiyyə kimi bir çox əhli-sünnət imamları bunu kitablarında dəlil olaraq qəbul ediblər.

Bu görüş eləcədə **İbrahim ən-Nəxai**, **əl-Həkəm bin Uteybə**yə aiddir.[174] Bu görüş **əş-Şabi**yə də istinad edilmişdir.[175] **Həsən əl-Basri** və **Abdullah bin Şaqiq**in isə nəql etdiyi səhabə icması yuxarıda zikr edilmişdir. Vakinin məzhəbinə gəldikdə isə, bəziləri onun namazı tərk edəni təkfir etmədiyini zikt etmişlər. Bunu İbn Abdilbərr, *rahiməhullah,* ona aid etmişdir.[176] Lakin **əl-Vaki**dən belə bir görüşə rastlamadım, əksinə bunun əksini söyləyən görüşü vardır. əl-Xallal rəvayətində deyir: Əbu Abdullah namazı tərk edəni tövbəyə çağırmağı uyğun gördü. Əbu Talib əl-Xorasani ona dedi:

سمعت وكيعًا يقول في الرجل، يقول: الصلاة عليَّ، ولكني لا أصلي، فيجئ وقتها، فلا يصلي، قال وكيع: استتبه ثلاثًا، فإن تاب؛ وإلا ضربت عنقه

---

[173] əl-Mərvazi, 2/924 (977)

[174] Bax: Bunu İbn Abdilbərr və digərləri ona aid edirlər. Bax: "**əl-İstizkər**", 5/343; "**Fəthul-Bari**", 4/413; əl-Bəğavi, "**Şərh əs-Sunnə**", 2/179; əl-Qurtubi, "**əl-Mufhim limə Əşkələ min Təlxis Kitəbi Muslim**", 1/272; əl-Xattabi, "**Məalim əs-Sunən**", 2/45; əl-Heysəmi, "**əz-Zəvacir**", 1/138: sənədini tapa bilmədim.

[175] Bax: "**Minhəc əl-İməm əş-Şafi fi İsbət əl-Aqidə**", 1/207: sənədini tapa bilmədim.

[176] Bax: "**əl-İstizkər**", 5/346; "**Fəthul-Bari**", 4/418; əl-Maqdisi, "**əl-Muğni**", 2/299

**“ “Namaz alidir, lakin mən namaz qılmıram” deyən və vaxtı çıxana qədər namaz qılmayan bir kəs haqqında Vakinin belə dediyini eşitdim. Onu üç dəfə tövbəyə çağıraram, əgər tövbə edərsə nə gözəl, yoxsa boynunu vuraram.”**[177]

Yalnız tabii nəslinin kiçiklərindən sayılan **əz-Zuhri** fərqli bir görüş söyləmişdir və bu səhih sənədlə ondan rəvayət olunmuşdur ki, namazı tərk edən fasiqdir və həbs edilməlidir. Bu görüşü, Əbu Hənifənin görüşü ilə eynidir və səhih dəlillərə görə bu görüş zəif bir görüşdür. İbn Şihab əz-Zuhri ilə eyni görüşü paylaşan başqa bir tabii tanımırıq. İbnul-Qayyim, *rahiməhullah*, tabiinin və onlardan sonra gələnlərin görüşünü zikr edərkən, onların namazı tərk edəni müsəlman görmədiklərini qeyd etmişdir. Eləcədə məşhur imam İshaq bin Rahaveyh bu görüşün səhabə və tabiinə aid olduğunu deyir. Belə bir halda heç şübhəsiz ki, tabiinin böyük bir əksəriyyəti namazlarını qəsdən tərk edəni kafir görmüşdür. Doğrusunu Allah bilir!

## Elm əhlindən digərlərinin görüşü

[177] əl-Xalləl, ”**Əhkəm əl-Miləl**”, səh: 214; “**əl-Məsəil va ər-Rasəil əl-Mərviyyə an əl-İməm Əhməd fil-Aqidə**”, 2/40 (518)

Bu məsələdə Əbu Hənifənin görüşü məşhurdur. Ona görə namazı tərk edən təkfir edilməz və öldürülməz, lakin həbs edilər.[178] əş-Şafinin katibi İmam əl-Muzəni də eyni görüşü mənimsəmişdir.[179] Şafi məzhəbindən İbn Sureyc də bu görüşdə olmuşdur.[180]
Said bin əl-Musəyyəb və Ömər ibn Abdulaziz də eyni rəydə olmuşlar.

İmam Malikdən bu barədə aydın bir söz rəvayət edilməmişdir. İmam Malikin bu barədə olan məşhur sözü budur:

من آمن بالله، وصدق المرسلين، وأبى أن يُصلي؛ قتل

**“Kim Allaha iman gətirərsə və peyğəmbərlərini təsdiq edərsə, lakin namaz qılmaqdan imtina edərsə, öldürülər.”**[181]

Bunu İbn əl-Qasim, İmam Malikdən rəvayət etmişdir. İbn Abdilbərrə görə İmam Malik bu sözü ilə namazı tərk edəni kafir görmür. Maliki alimlərinin əksəriyyətinə görə Malik namazı tərk edəni kafir saymamışdır. Lakin maliki alimlərindən İbn Rüşd əl-Cədd isə İmam Malikdən nəql etdiyimiz yuxarıdakı sözləri barədə deyir:

وأما من أقر بفرض الصلاة، والصيام، والوضوء، وأبى من فعل ذلك، وهو قادر عليه؛ فقول مالك في هذه الرواية:

---

178 Bax: ət-Tahavi, “**Muxtəsar İxtiləf əl-Uləmə**”, 4/393; əl-Məvardi, “**əl-Havi**”, 2/525; ən-Nəvəvi, “**əl-Məcmu**”, 3/16; “**Fəth əl-Bər**”, 4/426; “**əl-Muğni**”, 2/299

179 Bax: əl-Mavərdi, ”**əl-Havi**”, 2/525; ən-Nəvəvi, “**əl-Məcmu**”, 3/16

180 Bax: əl-Xattabi, ”**əl-Məalim**”, 2/45

181 İbn Abdilbərr, ”**ət-Təmhid**”, 4/418; əl-Qurtubi, ”**Cami li Əhkəm əl-Quran**”, 8/74

أن يستتاب في ذلك كله، فإن أبى في شيء منه أن يفعله؛ قتل، يدل على أنه يقتل على الكفر، فيكون ماله لجماعة المسلمين، كالمرتد إذا قتل على ردته، لأنه وإن لم يكن نفس الترك لشيء من ذلك كله كفرًا على الحقيقة، فإنه يدل على الكفر، ولا يصدق من قال في شيء من ذلك كله: إنه مؤمن بوجوبه عليه، إذا أبى أن يفعله، فحكمه حكم الزنديق الذي يقتل على الكفر، ولا يصدق فيما يدعيه من الإيمان، وإلى هذا ذهب أصبغ في قوله: فإصراره على أن لا يصلي؛ جحد لها،

**"Amma kim namazın, orucun və dəstəmazın fərz olduğunu qəbul edərsə, lakin imkanı olduğu halda bunları etməkdən imtina edərsə, bu barədə Malikdən rəvayət vardır:**
**"Bunların hamısında tövbəyə dəvət edilir, əgər bunlardan hər hansı birini etməkdən imtina edərsə, öldürülər." Bu dəlalət edir ki, o, küfr üzərində ölür və riddət səbəbi ilə öldürülən mürtəddə olduğu kimi onun da malı müsəlmanlara aid olur. Çünki həqiqətdə bütün bunlardan hər hansı bir şeyin özünü tərk etmək küfr olmasa da, onun bu əməli küfrünə dəlalət edir. O, bunlardan hər hansı birinin vacibliyinə inandığını söyləyərsə və əməl etməkdən imtina edərsə, onun sözünün doğruluğuna inanmaq olmaz. Onun hökmü zındıqdır və küfrünə görə öldürülər. İman iddiasında olanın da sözünün doğruluğuna inanılmaz. Əsbağ bu görüşü bu sözündə ifadə edir: "Namaz qılmamaqda israr etməsi, onu inkar etməsidir."**[182]

İbn Rüşdün bu sözlərindən anlaşılan budur ki, İmam Malik namaz qılmamaqda israr edəni təkfir etmişdir və ona görə rəvayətin zahiri buna dəlalət edir. Lakin İbn Rüşd özü isə bu sözlərindən həmən sonra deyir:

وقد قيل: إنه يقتل على ذنب من الذنوب، لا على الكفر، فيرثه ورثته من المسلمين، وهو أظهر الأقوال في هذه المسألة، ومن أهل العلم من رأى نفس

182 İbn Rüşd əl-Cədd, "**əl-Bəyən va ət-Təhsil**", 16/394-395

الترك للصلاة عمدًا كفرًا....

**“Eləcədə deyirlər: “O, küfrə görə deyil, günahlardan bir günaha görə öldürülür. Müsəlmanlar onun mirasına varis ola bilərlər. Bu məsələdəki rəylərin ən doğrusu budur. Elm əhlindən bəziləri də namazı qəsdən tərk etməyin özünü küfr sayırlar...”**

İbn Rüşdün sözündən anlaşılan budur ki, İmam Malik namazı israr ilə tərk edəni təkfir etmişdir, sadəcə olaraq namazın tərkinə görə təkfir etmir. Digərləri isə ümumi olaraq Malikə görə namazı tərk edənin kafir olmadığını deyirlər. İbn Rüşd özü də bu görüşü ümumi olaraq nəql etmişdir.[183]

İmam ət-Tahavi, *rahiməhullah*, isə deyir:

وقال بعض حفاظ قول مالك: إن من مذهب مالك، أن من ترك صلاة متعمدًا، لغير عذر، حتى خرج وقتها؛ فهو مرتد، ويقتل، إلا أن يصليها

**“Bəzi hafiz alimlər Malikin rəyini bu şəkildə nəql edirlər: Malikin məzhəbinə görə, kim heç bir üzr olmadan bir namazı vaxtı çıxana qədər qəsdən tərk edərsə, mürtəddir, öldürülməlidir. Yalnız namazına geri dönməsi istisnadır.”**[184]

Biz deyirik: İmam Malikdən nəql olunan doğru rəy məzhəb alimlərinin söylədikləridir və məzhəb alimlərinin bu yöndəki sözləri onu göstərir ki, Malik namazı tərk etməyi küfr saymamışdır. İmam əş-Şinqiti, *rahiməhullah*, təfsirində İmam Malikdən namazı tərk edəni kafir sayması barədə gələn bu rəvayətin zəif olduğunu deyir.[185] Məlumdur ki, İmam əş-Şinqiti maliki məzhəbinə bağlı olan Şinqit bölgəsindəndir.

---

[183] Bax: “**əl-Muqadəmət əl-Muməhədət**”, 1/142; “**Haşiyə əl-Mudəvvanə**”, 1/65

[184] ”**Muxtəsar İxtiləf əl-Uləma**”, 4/393

[185] Bax: “**Ədva əl-Bəyan**”, 4/311

Bunu da qeyd etmək lazımdır ki, İbn Rüşdün yuxarıda nəql etdiyimiz sözlərinə də diqqət yetirmək lazımdır. Çünki doğru olan budur ki, burada iki fərqli hal qeyd olunmuşdur. Sadəcə olaraq bir əməl kimi namazı tərk etmək və namazı tərk etməyin üzərində israr etmək. İbn Rüşdə görə birinci halda İmam Malik təkfir etməmişdir, ikinci hala görə isə ondan nəql olunan rəvayətin zahirindən anlaşılana görə təkfir etmişdir. Doğrusunu Allah bilir!

İlk dövr maliki alimlərindən Abdulməlik ibn Həbib[186] və Əsbağ[187] namazı tərk edəni təkfir etmişlər. İbn Həbib digər İslam rükunlarını da tərk edəni kafir gördüyü halda, Əsbağ yalnız namazı tərk etməkdə israr edəni kafir görmüşdür. Digər maliki alimləri isə namazı tərk edəni kafir görmürlər və məzhəbin məşhur rəyi budur.

İmam Şafidən isə, *rahiməhullah*, rəvayət olunan məşhur rəyə görə namazı tərk edən kafir deyildir.[188] ət-Tahavi isə İmam Şafidən fərqli bir görüş nəql etmişdir və onun namazı tərk edəni təkfir etdiyini söyləmişdir.[189] ət-Tahavi isə hənəfi alimi olmasına baxmayaraq, ilk elmini öz dayısı məşhur şafi alimi və İmam Şafinin kitablarını qələmə alan əl-Muzənidən almışdır. "Zahirətul-İrca" əsərinin sahibi Şeyx Səfər əl-Havali buna əsaslanaraq İmam Şafinin namazı tərk edəni təkfir etmədiyini söyləyən rəyi inkar etmişdir. Məzhəbin bu barədəki fiqhini oxuyan bunun əsassız bir iddia olduğunu anlayar. Şafi

---

186 "**əl-Bəyan va ət-Təhsil",** 16/395 və "**əl-Muqaddimət əl-Muməhədət**", 1/142; əl-Qurtubi, "**əl-Mufhim**", 1/271,272

187 "**əl-Bəyan va ət-Təhsil**", 16/393

188 Bax: əl-Mərvazi, "**əs-Salət**", 2/956; əs-Sabuni, "**Aqidətu əs-Sələf va Əshabil-Hədis**", səh: 278; əl-Məvardi, "**əl-Havi**", 13/166; ən-Nəvəvi, "**əl-Məcmu**", 3/16; İbn Rüşd, "**əl-Muqaddimət əl-Muməhədət**", 1/142; İbn Rüşd əl-Hafid, "**əl-Bidayətul-Muctəhid**", 1/226; İbn Abdilbərr, "**əl-İstizkər**", 5/345-346; "**Fəth əl-Bər**", 4/417-418; əl-Qurtubi, "**əl-Mufhim**", 1/271; "**əl-Muğni**", 2/299; Şeyxul-İslam, "**Məcmu əl-Fətava**", 7/371

189 "**Muşkil əl-Əsər**", 8/205; "**Muxtəsar İxtiləf əl-Uləma**", 4/393

məzhəbinin alimləri ilk rəyi daha məqbul görüblər. İmam Şafi özü kitabında namazı tərk edənin kafir olmayacağına işarə etmişdir:

وحضور الجمعة فرض، فمن ترك الفرض تهاونًا؛ كان قد تعرّض شرًا، إلا أن يعفو الله، كما لو أن رجلاً ترك صلاة حتى يمضي وقتها؛ كان قد تعرض شرًا، إلا أن يعفو الله

**"Cümədə iştirak etmək fərzdir. Kim səhlənkarlıq üzündən bir fərzi tərk edərsə, şərri üzə vurmuşdur və Allahın onu bağışlaması istisnadır. Necəki bir nəfər namazı vaxtı çıxana qədər tərk edərsə, şərri üzə vurmuş olur və Allahın onu bağışlaması istisnadır."**[190]

"Allahın onu bağışlaması istisnadır" sözü, bu əməlinə görə onun Allahın məşiyyəti altında olduğuna işarə edir. Bu isə İmam Şafinin öz sözləridir. İmam İbn Abdilbərr Şafinin məzhəbini bu şəkildə izah etmişdir. Lakin "əl-Umm" kitabında onun başqa sözləri də mövcuddur və bu sözlərdə isə namazı tərk edənin kafir olması ehtimalı güclüdür. İmam Şafi deyir:

ويقال لمن ترك الصلاة، وقال: أنا أطيقها، ولا أصليها: لا يعملها غيرك، فإن فعلت، وإلا قتلناك، كما تترك الإيمان، ولا يعمله غيرك، فإن آمنت؛ وإلا قتلناك

**"Namazı tərk edən və "mənim namaz qılmağa taqətim var, lakin namaz qılmıram" deyən birinə belə deyilməlidir: "Bunu səndən başqa heç kəs etməyəcək, namazını qılsan, nə gözəl! Əks təqdirdə səni öldürərik. Necəki imanını tərk edənə deyilir: "Bunu səndən başqa heç kəs etməyəcək, iman gətirsən, nə gözəl! Əks təqdirdə səni öldürərik."**[191]

---

190 əş-Şafi, "**əl-Umm**", 1/355 (Dar əl-Kutub əl-İlmiyyə), 1/239 (Dar əl-Fikr)

191 "**əl-Umm**", 9/275

Bu sözlərdə təkfir ehtimalı çox güclüdür. Bununla belə bunu kiçik küfr kimi də təvil edirlər.[192] Lakin namazı tərk etməyi, imanı tərk etməklə qiyas etmişdir. İmam əl-Muzəniyə görə qəsd olunan, imanını tərk edənə tətbiq olunan həddin ona da tətbiq olunmasıdır və bu zaman bir-neçə gün tövbəyə dəvət etməyə lüzum olmur.

İmam Şafinin namazı tərk edəni kafir gördüyünü söyləyənlər ola bilsin ki, onun məhz bu sözlərinə əsaslanırlar. Belə bir ehtimal güclüdür. İzah etdiyimiz kimi bu sözlərdə təkfir ehtimalı güclü olsa da, təvilə açıq sözlərdir. Məzhəb alimlərinin təsbit etdikləri rəy isə fərqlidir, beləki şafilərə görə namazı tərk etmək böyük küfr deyildir.

İmam Əhməddən isə bu barədə çoxlu görüş rəvayət olunmuşdur. İlk əvvəl namazı tərk edəni kafir görən görüşlərə nəzər salaq. İshaq bin İbrahim bin Haniy deyir:

حضرت رجلاً عند أبي عبدالله، وهو يسأله: فجعل الرجل يقول: وأن لا يكفر أحد بذنب؟ قال أبوعبدالله: اسْكُتْ، من ترك الصلاة؛ فقد كفر.

**“Əbu Abdullahın (ibn Hənbəl) yanında olarkən bir nəfər ondan sual soruşurdu və ona belə bir şey soruşdu: “Doğrudurmu ki, heç kəs günahına görə təkfir edilməz?” Əbu Abdullah dedi: “Sus! Kim namazı tərk edərsə küfr etmişdir.”**[193]

Yenə eyni mənbədə bir sonrakı rəvayətdə Abdus ibn Malikin belə dediyi rəvayət olunur:

سمعت أحمد يقول:.... ومن ترك الصلاة؛ فقد كفر

---

[192] Bax: İmam Mavərdi, “**əl-Havi**”, 2/525

[193] ”**əl-Məsəil va ər-Rasəil Mərviyyə anil- İmam Əhməd fil-Aqidə**”, 2/36 (495) və daha sonrakı rəvayətlərə də nəzər sal!; “**Suələt ibn Haniy**”, 2/156 (1876)

**”Əhmədi belə deyərkən eşitdim:...Kim namazı tərk edərsə, küfr etmişdir.”**

Abdus ibn Malikin bir başqa rəvayətində isə deyilir:

وليس من الأعمال شيء تركه كفر؛ إلا الصلاة، من تركها؛ فهو كافر

**“Əməllər içində namazdan başqa heç bir şeyi tərk etmək küfr deyildir. Kim namazı tərk edərsə, kafirdir.”**[194]

Hənbəl bin İshaq isə deyir:

سمعت أحمد يقول: لم نسمع في شيء من الأعمال تركه كفر؛ إلا الصلاة.

**“Əhmədi belə deyərkən eşitdim: “Namazdan başqa hər hansı bir əməli tərk etməyin küfr olduğunu eşitmədik.”**[195]

Digər rəvayətdə İsmail əş-Şalənciyyə deyir:

سألت أحمد عن قول النبي صلى الله عليه وسلم :
"**من غشنا؛ فليس منا**" قال: على التأكيد والتشديد، ولا أكفر أحدًا إلا بترك الصلاة.

**“Əhməddən peyğəmbərin, *salləllahu aleyhi va sələm*, bu sözü barədə soruşdum:**
**“Kim bizi aldadarsa, bizdən deyildir.” Dedi: Hədis təkid və çəkindirmək mənasındadır və heç kəs namazı tərk etməkdən başqa bir şeyə görə (heç bir günaha görə) təkfir edilməz.“**[196]

---

194 ”**Usul əs-Sunnə lil-İmam Əhməd**”, Abdus ibn Malik əl-Attarın rəvayəti, səh: 59-60 (25) (Məktəbə İbn Teymiyyə)
195 ”**əl-Məsəil va ər-Rasəil**”, (497)
196 ”**əl-Məsəil va ər-Rasəil**”, (498)

İmam Əhmədin bu sözü dəlalət edir ki, o, namazı digər əməllər içindən xüsusiləşdirmişdir.

Əbu əl-Haris əs-Saiğ dedi:

قلت لأبي عبدالله: فيكون بتركه الصلاة كافرًا؟ فقال: قال النبي صلى الله عليه وسلم : "**بين العبد والكفر؛ ترك الصلاة**".

**“Əbu Abdullaha dedim: “Namazı tərk etməklə insan kafir olurmu?” Dedi: “Peyğəmbər, *salləllahu aleyhi va səlləm*, demişdir:**
**“Qul ilə küfr arasında namazı tərk etmək durur.”**[197]

əl-Həsən bin Əli əl-İskəfi deyir:

: قال أبو عبدالله في تارك الصلاة: لا أعرفه إلا هكذا، من ظاهر الحديث، " فأما من فسّره جحودًا؛ فلا نعرفه، وقد قال عمر -رضي الله عنه- حين قيل له: الصلاة، قال: لا حظ في الإسلام لمن ترك الصلاة.

**“Əbu Abdullah namazı tərk edən barədə dedi: “Bunu, hədisin zahirindən anlaşılandan başqa bir şəkildə bilmirik. Hədisi namazın fərziyyətini inkar etmək olaraq izah etməyə gəldikdə isə, belə bir şey bilmirik. Ömər, radiyallahu anhu, ondan namaz haqqında soruşulduqda demişdir: “Namazı tərk edənin İslamdan heç bir nəsibi yoxdur.”**[198]

Sonuncu iki rəvayət dəlalət edir ki, İmam Əhmədə görə hədisin zahiri mənası namazı tərk etməyin böyük küfr olduğunu göstərir. İmam Əhmədin sünnət imamı olması və hədis elmində yüksək məqama sahib olması münaqişə mövzusu deyildir. Onun digər şəkildə hədislərin təvil edilməsini inkar etməsi xüsusi əhəmiyyət kəsb edir. Çünki xüsusi bir dəlil olmadan hədisi zahiri mənasından başqa mənaya təvil etmək

---

197 ”**əl-Məsəil va ər-Rasəil**”, (499)
198 ”**əl-Məsəil va ər-Rasəil**”, (501)

halal deyildir və hədis üsulunun qaydası budur.

Abdulməlik əl-Məymuni deyir:

قلت لأبي عبدالله: الرجل يقر بالصلاة والفرائض، ولا يفعلها؟ قال: هذا أشدّ، ولم يجئ في شئ ما جاء في الصلاة

**“Əbu Abdullaha dedim: “Bir nəfər namazı və fərzləri qəbul edir, lakin onlara əməl etmir. (Onun halı nədir)?” Dedi: “Bu daha pisdir, namazda olan şey, başqa heç bir şeydə yoxdur.”**[199]

əl-Xalləl isə eyni sözləri nəql etdikdən sonra əlavə edir:

قال: أرى أن يُضرب، ويُحبس، ويتهدد، قلت له: أليس تركها كفرًا؟ فأكبر ظني أنه قال لي: بلى

**“Dedi: “Mənə görə o, döyülməlidir, həbs olunmalıdır və təhdid olunmalıdır!” Ondan soruşdum: “Məgər namazı tərk etmək küfr deyilmi?” Çox ehtimal ki, mənə belə cavab verdi: “Əlbəttə!”**[200]

Əbu Davud isə nəql edərək deyir:

سمعت أحمد يقول: إذا قال الرجل: لا أصلي؛ فهو كافر

**“Əhmədi belə deyərkən eşitdim: “Əgər bir nəfər “Namaz qılmıram” deyərsə, kafirdir.”**[201]

Əhməd bin əl-Huseyn bin Həsən deyir:

سئل أبوعبدالله عمن ترك الصلاة متعمدًا؟ قال: ليس بين الإيمان والكفر؛ إلا ترك الصلاة.

---

199 ”**əl-Məsəil va ər-Rasəil**”, (503)
200 əl-Xalləl, ”**əl-Cami**”, 2/536 (1369)
201 ”**əl-Məsəil va ər-Rasəil**”, (504)

**“Əhməddən namazını qəsdən tərk edən biri haqqında soruşdular və o, dedi: “İman ilə küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur.”**[202]

Bu şəkildə gələn rəvayətlər çoxdur. Bu rəvayətlər içində İmam Əhmədin mövqeyini xüsusi ilə sərgiləyən sözlərini əl-Xalləl rəvayət edir: əl-Abbas bin Muhammməd əl-Yəməmi bizə xəbər verdi:

قال: سألت أبا عبدالله عن الحديث الذي يروي عن النبي صلى الله عليه وسلم قال: "لا يكفر أحد من أهل التوحيد بذنب" قال: موضوع، لا أصل له، كيف بحديث النبي صلى الله عليه وسلم : "من ترك الصلاة؛ فقد كفر" فقال: أيورث بالملة؟ قال: لا يرث، ولا يورث.

**“Dedi: Peyğəmbərdən, *salləllahu aleyhi va sələm*, rəvayət olunan bu hədis barədə Əbu Abdullahdan soruşdum: “Tövhid əhlindən heç kəs günahına görə təkfir olunmaz.” Dedi: “Uydurmadır, heç bir əsli yoxdur. Necə ola bilər, axı peyğəmbər, *salləllahu aleyhi va sələm,* demişdir: “Kim namazı tərk edərsə, küfr etmişdir.” Dedi: “Bəs insanlar ona varis ola bilərmi?” Dedi: “Nə varis olmaz, nə də ondan miras alınmaz.”**[203]

Əhməddən rəvayət olunanlar ən açıq şəkildə göstərir ki, İmam Əhmədə görə namaz digər fərzlərdən fərqlənir və namazın tərki küfrdür. Lakin Şeyx əl-Albani bunu bəzi yerlərdə inkar etmişdir və kitabın digər yerlərində isə fərqli şəkildə təvil etmişdir. Şeyxə görə İmam Əhməd yalnız namazını tərk etməkdə israr edənlərin küfrünə hökm vermişdir. Bu güclü bir ehtimaldır və İmam Əhməddən rəvayət edilən digər sözlər də buna işarə edir. Lakin ümumi şəkildə namazı tərk etmək küfr

---

[202] ”**əl-Məsəil va ər-Rasəil**”, (505)

[203] əl-Xalləl, ”**əl-Cami**”, 2/535 (1361)

sayılır və sahibini dindən çıxarır. Namazı tərk etməkdə israr edərək öldürülən ilə, ömrü boyu heç bir səcdə etməyənin halı eynidir. Çünki, fərziyyətinə etiqad edən kəs mütləq namaz qılacaq, lakin namazını hifz etməkdə aciz olmasına tənbəllik və ya səhlənkarlıq kimi xislətlər maneə ola bilər. Belə bir insan heç bir zaman namazı tamamilə tərk etməz. Belə bir insanı namaz qılmağa təhrik etsək namazını qılacaqdır, çünki tənbəllik və səhlənkarlıq insana kənardan aşılanan həvəs və dəstək ilə aradan qalxır. Əgər tamamilə namazını tərk etmişsə, bu, onun küfrünə dəlalət edər.

Biz Şeyx əl-Albaninin sözləri ilə razılaşırıq və İmam Əhmədin mütləq olaraq namazı tərk edəni təkfir etmədiyini deyirik. Lakin əgər kimsə "mən namaz qılmayacam" deyərsə, bu, insanda imanın olmadığına dəlalət edir. Bununla belə bir dənə namazı qılmamaqda israr edən kəsin küfrünə hökm verilməz. İmam Əhməd üçün namazı tərk etmək küfrdür, lakin bu hökm hər kəsə tətbiq edilməz və yalnız namazlarını tamamilə tərk edənlərə aid edilməlidir. İbn Teymiyyənin və İbnul-Qayyimin də görüşü bu yöndədir.

Şeyx əl-Albaninin öz görüşü isə fərqlidir və ona görə namazı tamamilə tərk edən belə təkfir edilməz. Bu isə xətalı görüşdür! Şeyx əl-Albani öz görüşü üçün əsasən şəfaət hədislərini dəlil gətirmişdir və biz şəfaət hədislərini dəlil olaraq gətirənlərə kifayət qədər cavab vermişik.

Bizim məmləkətdəki insanların halına gəldikdə isə, onların halı tam fərqli bir haldır, çünki cahil adını verdiyimiz bu kəslər adətən deyirlər: "Mən İslama hörmət edirəm, lakin namaz qılmaq mənlik deyildir!" və yaxud da "Namaz qılanlara hörmət edirəm, lakin mən namaz qıla bilmərəm. Əsas odur ki, qəlbim təmiz olsun!". Bütün bunlar açıq aydın küfrdür və namazı tamamilə tərk etməyin ən açıq nümunəsidir.

Namazı tərk edəni kafir görən digər alimlər arasında Əbu Amr, İmam əl-Əvzai, Sədəqa bin əl-Fədl, Əbu Heysəmə Zuheyr

ibn əl-Hərb, Əyyub əs-Saxtiyəni, Əbu Davud ət-Tayəlisi, İmam əl-Acurri, İshaq ibn Rahaveyh, Abdullah ibn Mubarək, İmam əl-Mərvazi və digər alimlər vardır. İmam İbn Məndə, *rahiməhullah*, namazı tərk edəni kafir görmüşdür və digər İslam sütunlarına gəldikdə isə, ona görə yalnız vacibliyini inkar etdiyi halda kafir olur.[204]

Eləcədə İmam İbn Əbi Şeybə namazını tərk edəni təkfir etmişdir.[205]

Bəziləri İbn Battanın namazı tərk edəni təkfir etmədiyini söyləyir, lakin onun bu sözlərini heç yerdə görə bilmədik. İbnul-Qayyim də bu görüşü ona aid etmişdir. Əksinə onun namazı tərk edəni təkfir etdiyini göstərən sözləri isə öz kitabında zikr olunmuşdur.[206]

Eləcədə İmam əs-Səvrinin də namazı tərk edəni kafir gördüyü söylənilir, lakin ondan bu barədə aydın bir rəvayət gəlməyib.[207]

# İcma iddia edənlərə cavab

[204] Bax: İbn Məndə, "**əl-İmən**", 1/362

[205] əl-Mərvazi, "**əs-Salət**", 2/928 (98)

[206] "**əl-İbanə**", 2/683

[207] Daha sonrakı alimlərdən namazı tərk edəni kafir görənlər içində İbn Teymiyyə, İbnul-Qayyim, İbn Həcər əl-Heysəmi kimi alimlər vardır. Bu alimlərə görə tərki üzərində israr edərsə, kafir olur. əl-Heysəminin sözləri üçün bax: "Fətava əl-Kubra əl-Fiqhiyyə, 2/32; Son dövr alimlərdən isə Abdurrahmən bin Nasir əs-Sadi, Muhamməd Həmid əl-Faqi, Əhməd Şakir, Abdulaziz ibn Baz, Muhamməd bin Saleh əl-Useymin, Muqbil bin Hadi əl-Vadi və digər alimlərin adlarını çəkmək olar.

Şeyx əl-Albani, *rahiməhullah,* kitabında Şeyx Əbul-Fərəcin sözlərini dəlil olaraq nəql edir:[208]

ثم قال أبو الفرج : ( ولأن ذلك إجماع المسلمين فإننا لا نعلم في عصر من الأعصار أحدا من تاركي الصلاة ترك تغسيله والصلاة عليه ولا منع ميراث مورثه

**“Sonra Əbul-Fərəc deyir: “Çünki bunda müsəlmanlar icma etmişdir və biz heç bir zaman namazı tərk edənin ölüsünün yuyulmadığını, namazının qılınmadığını və mirasının varislərə verilmədiyini bilmirik.”**[209]

Buna bənzər sözləri İmam Nəvəvi “əl-Məcmu” əsərində və maliki alimi İbn Battal, *rahiməhumallah*, Muslimin şərhində zikr etmişdir.

Deyirik: Biz də hər hansı bir kəsin namaz qılmadığına görə öldürüldüyünü bilmirik. Bu barədə heç bir məlumatımız yoxdur. Məgər bununla ümmətin namazı tərk edənin öldürülməyəcəyinə dair icma etdiyini söyləmək doğrudurmu? Halbuki alimlərin cumhuruna görə namazı tərk edən öldürülməlidir.

Yenə deyirik ki, bu icma iddiası haradandır? Məgər namazı tərk edən alimlər öz etiqadlarının əleyhinə belə kəslərin cənazəsində iştirak edibmi? Bəlkə ölüsünü yuyub və ya mirasına varis olub? Bu cür kəlimələr dəlil sayılmaz! Ümmətin bunda icma etdiyini söyləmək əsassız bir iddiadır. Bunu bir çox tərəfdən izah edə bilərik:

Birinci anlamaq lazımdır ki, ümmətin alimləri bu məsələdə ixtilaf etmişdir. Belə bir ixtilafın olduğunu bildikdən sonra, ümmətin bunda icma etdiyini söyləmək doğru deyildir.

Alimlərin cumhuruna görə namazı tərk edən

---

208 ”**Hukmu Tərik əs-Salət**”, səh: 49

209 ”**Şərh əl-Kəbir**”, 1/386; bax: İbn Qudamə, “**əl-Muğni**”, 1/301

öldürülməlidir. Namazını tərk etmiş bir müsəlman təsəvvür edin və ona namazı qılmağı əmr edirlər. Lakin bu kəs namazı qılmamaqda israr edir. Nəhayət bu insanı öldürürlər! Məgər belə bir insan müsəlman ola bilərmi?! Məgər ölümü namaza üstün tutan bir kəs müsəlman ola bilərmi?! Belə bir insanın kafir olduğunu hətta Şeyx əl-Albani də kitabında təsdiq etmişdir. O zaman bu ümmət namazını tərk edəni öldürdükdən sonra, necə onu yuyaraq cənazəsini qılıblar?! Necə onun malını miras olaraq götürüblər?! Bu barədə İbnul-Qayyim, *rahiməhullah*, deyir:

ومن العجب ان يقع الشك في كفر من أصر على تركها ودعى إلى فعلها على رؤوس الملأ وهو يرى بارقة السيف على رأسه ويشد للقتل وعصبت عيناه وقيل له تصلي وإلا قتلناك فيقول اقتلوني ولا اصلي ابدا
ومن لا يكفر تارك الصلاة يقول هذا مؤمن مسلم يغتسل ويصلي عليه ويدفن في مقابر المسلمين وبعضهم يقول إنه مؤمن كامل الإيمان إيمانه كإيمانه جبريل وميكائيل

**“Təsəvvür edin ki, namazın tərkində israr edən biri - hər kəsin gözü qarşısında, başı üzərində qılıncın parılıtısını gördüyü halda, öldürmək üçün əl-qolu bağlı, gözləri bağlı şəkildə - namaza çağırılır və ona deyilir: “Namaz qıl! Yoxsa səni öldürəcəyik.” O isə deyir: “Öldürün məni, mən heç bir zaman namaz qılmayacam.” Belə birinin təkfirində şübhəyə düşmək çox təəccüblü haldır.**
**Namazı tərk edəni təkfir etməyənlər deyirlər: “Bu, mömindir, müsəlmandır. Ölüsü yuyulmalıdır, üzərində namaz qılınmalıdır və müsəlman məqbərəsində dəfn edilməlidir.” Onlardan bəziləri də deyir: “O, imanı kamil bir mömindir. Onun imanı Cəbrayıl və Mikayılın imanı kimidir.”**[210]

Əziz müsəlman! Bu sözləri oxuduqdan sonra Əbul-Fərəcin, *rahiməhullah*, iddia etdiyi icmanın nə qədər əsassız

---

[210] ”**Kitəb əs-Salət**”, səh: 63

olduğunu anlayacaqsan. Şeyx əl-Albaninin də bu sözləri kitabında dəlil gətirməsi çox qəribədir. İbnul-Qayyim bu sözlərindən sonra deyir:

فلا يستحي من هذا قوله من إنكاره تكفير من شهد بكفره الكتاب والسنة واتفاق الصحابة والله الموفق

**“Belə söyləyən bir kimsə Kitab, Sünnət və səhabə ittifaqının küfrünə şahidlik etdiyi bir kəsi təkfir etməyi rədd etdiyi üçün utanmır. Tövfiq Allahdandır!”**

Ümmətin alimlərindən bir çoxunun söylədiyi sözlər bu həqiqət ilə uyuşmur. Çünki namazı tərk edənin müsəlman kimi öldürüləcəyinə fətva verən məzhəb alimləri, ölümü namaza üstün tutan kəsin müsəlmanlığına necə hökm edə bilirlər?! Axı belə bir insanın küfrü göz qabağındadır! Çox təəssüf ki, məsələdə bir çoxları məzhəblərindəki məşhur görüşdən kənara çıxmamışdır.

## Fəsil

Şeyx əl-Albani, *rahiməhullah*, kitabında Huseyfənin hədisini dəlil olaraq təsdiq etmişdir. Yuxarıda Əli Həsən

əl-Hələbiyə cavab verərkən, hədisin izahını da təqdim etdik. Gördüyümüz ki, hədisdə mövzu ilə əlaqədar heç bir dəlil yoxdur.

Lakin Şeyx Nasiruddin, *rahiməhullah*, bu dəlillərin üzərində israr edir və bir çox yerdə bunu dəlil olaraq göstərmişdir. Təbii ki, bu, bir xətadır.

Şeyxə aid ən böyük vəhm isə Huzeyfə hədisindən sonra əl-Ğazalidən nəql etdiyi sözlərdədir. Bunu İbn Hacər nəql etmişdir.

Şeyx əl-Albani kitabında deyir:

ويعجبني بهذه المناسبة ما نقله الحافظ في ( الفتح ) عن الغزالي أنه قال : ( والذي ينبغي الاحتراز منه : التكفير ما وجد إليه سبيلا فإن استباحة دماء المسلمين المقرين بالتوحيد خطأ والخطأ في ترك ألف كافر في الحياة أهون من الخطأ في سفك دم لمسلم واحد ) .

**"Bu münasibətlə əl-Hafizin "əl-Fəth" əsərində əl-Ğazalidən nəql etdiyi sözlər çox xoşuma gəldi: "Çəkinməli olduğumuz şeylərdən də biri, qurtuluşu olan kəsləri təkfir etməkdir, çünki tövhidi təsdiq edən müsəlmanların qanını halal görmək xətadır. Min kafiri həyatda buraxmaqdakı xəta, bir müsəlmanın qanını tökməkdəki xətadan yüngüldür."**[211]

Allaha sığınırıq! Bu sözlər İmam əl-Ğazalinin təhrif olunmuş sözləridir, çünki bu sözlərin namazı tərk edənlər haqqında cüzi bir aidiyyatı belə yoxdur. İmam Ğazali *"tövhidi təsdiq edən müsəlmanlar"* sözü işlətmir. Onun dediyi sözlər belədir:

فإن استباحة دماء المصلين المقرين بالتوحيد خطأ...

**"Tövhidi təsdiq edən namaz əhlinin qanını halal saymaq**

[211] "**Hukmu Tərik əs-Salət**", səh: 60

**xətadır…”**[212]

Aydın olan budur ki, namaz qılanların qanını tökmək xətadır və İmam əl-Ğazali bunu söyləmişdir.

Şeyx əl-Albani öz kitabında İbn Teymiyyənin və İbnul-Qayyimin namazı tərk edəni təkfir etmədiyini isbat etmək üçün bəzi mütəşabih kəlimələri zikr etmişdir. Onların mövzu ilə əlaqədar söylədikləri sözləri qeyd etməmişdir. Allah ona rəhm etsin! Bizim üzərimizə vacib olan alimlərin müəyyən səbəblərdən etdikləri xətaları göstərməkdir. Bəzi təəssübkeş cahillərin tənqidləri isə boş-boş sözlərdir. Onları çox zaman belə deyərkən eşidirsən: “Məgər sən Şeyx əl-Albanidən elmlisən?” Subhənallah! Bu, nə qədər də cahil bir sözdür. Biz deyirik: Burda söylədiklərimiz öz havamızdan deyildir. Möhkəm dəlillərə əsaslanan hökmlərdir. Alimlərin xətalarını isə digər alimlər göstərmişdir. Biz sadəcə olaraq doğru olanı nəql edirik. Müvəffəqiyyət isə Allahdandır!

## İbn Teymiyyənin görüşü

---

[212] “Fəthul-Bari”, 12/314

Şeyx əl-Albaninin azərbaycan dilinə tərcümə edilmiş bu əsərində isə yuxarıda işarə etdiyimiz nəql tam əksinə tərcümə olunmuşdur. Tərcümədə deyilir:

“**İmkan olduqca namazı tərk edəni təkfir etməkdən çəkinməliyik. Tövhidi iqrar edən muvahhid müsəlmanın qanını axıtmağı mübah saymaq xətadır. Bir kafiri həyatda buraxmaqdakı xəta, bir müsəlmanın qanını tökməkdəki xətadan yüngüldür.**”

“Namazı tərk edənin hökmü”, səh: 43

Çox asanlıqla deyə bilərik ki, “Fəthul-Bari”də bu mənada bir söz yoxdur. Qardaşlarımıza da məsləhət görürük ki, kitabı redaktə edərkən belə xətalarda diqqətli olsunlar. Ən azından sözləri müəllifin söylədiyi kimi tərcümə etsinlər! Doğrusunu isə Allah bilir!

Namazı tərk edəni kafır görən alimlər də öz aralarında ixtilaf ediblər. Onlardan bir qrup tək bir fərz namazı tərk edəni kafir gördüyü halda, digərləri iki və daha çox namazın tərkinə görə təkfir etmişdir. Biz bu alimlərin sözlərini və dəlillərini müzakirə etmək istəmirik. Bunun üçün İbnul-Qayyimin mövzu barədə yazdığı kitabına müraciət etmək olar.

Digər bir qrup alim isə namazlarını tamamilə tərk edənləri kafir görmüşdür. Bu görüşü müdafiə edən alimlərin başında Şeyxul-İslam İbn Teymiyyə gəlir. İbnul-Qayyim də bu görüşdədir. Şeyx İbn Useyminin sizlərə təqdim etdiyimiz risaləsində qəbul etdiyi görüş də budur. Biz də bu rəyin doğru olduğunu söyləyirik. Dəlillər namazı tərk edənin kafir olduğunu göstərir, bunda heç bir şübhə ola bilməz. Lakin bu, tək bir namazın tərki deyildir, namazları tam bir şəkildə tərk etməkdir. Bunun üçün İbn Teymiyyənin bu barədə söylədiklərinə nəzər salmaq kifayət edər, çünki o, "İman əl-Əvsat" kitabının sonunda[213] bunu geniş müzakirə edir və dəlilləri zikr edir. Şeyxul-İslam, *rahiməhullah*, deyir:

وأما مع الإقرار بالوجوب إذا ترك شيئا من هذه الأركان الأربعة ففي التكفير أقوال للعلماء هي روايات عن أحمد: (أحدها): أنه يكفر بترك واحد من الأربعة حتى الحج وإن كان في جواز تأخيره نزاع بين العلماء فمتى عزم على تركه بالكلية كفر وهذا قول طائفة من السلف وهي إحدى الروايات عن أحمد اختارها أبو بكر و (الثاني): أنه لا يكفر بترك شيء من ذلك مع الإقرار بالوجوب وهذا هو المشهور عند كثير من الفقهاء من أصحاب أبي حنيفة ومالك والشافعي وهو إحدى الروايات عن أحمد اختارها ابن بطة وغيره. و (الثالث) لا يكفر إلا بترك الصلاة وهي الرواية الثالثة عن أحمد وقول كثير من السلف وطائفة من أصحاب مالك والشافعي وطائفة من أصحاب أحمد. و (الرابع): يكفر بتركها وترك الزكاة فقط. و (الخامس): بتركها وترك الزكاة إذا قاتل الإمام عليها دون ترك الصيام والحج.

---

[213] Bax: " **Məcmu əl-Fətava**", 7/609-621

"Lakin vacibliyini qəbul etdiyi halda bu dörd rükundan birini tərk edənin təkfir edilməsi barədə alimlərin müxtəlif sözləri vardır. Bu barədə Əhməddən çoxlu rəy rəvayət olunmuşdur:
Onlardan birincisi: Bu dördündən hər hansı birini tərk etməsi ilə kafir olur, hətta həcc belə bura daxildir. Həccin təxirinin caiz olub olmaması isə alimlər arasında ixtilaflıdır. Kim bunları tərk etməyə qərar verərsə kafir olar. Bu isə sələfdən bir camaatın rəyidir. Yenə bu Əhməddən gələn rəvayətlərdən biridir. Əbu Bəkr də bunu tərcih etmişdir.
İkinci: Vacibliyini qəbul etdiyi halda bunlardan birini tərk etməsi ilə kafir olmaz. Bu isə Əbu Hənifənin, Malikin və Şafinin əshabından olan fəqihlər nəzdində məşhurdur. Bu eləcədə İbn Batta və digərlərinin İmam Əhməddən rəvayət edilən rəylərdə tərceh etdikləri rəydir.
Üçüncü: Yalnız namazı tərk edərsə kafir olar. Bu isə İmam Əhməddən nəql olunan üçüncü rəydir və sələfin çoxunun, Malik və Şafinin əshabından olan bir taifənin və Əhmədin əshabından bir taifənin rəyidir.
Dördüncü: Yalnız namazın və zəkatın tərki ilə kafir olar.
Beşinci: Namazın tərki ilə və əgər imam onlara qarşı vuruşduğu halda zəkatı tərk edərlərsə kafir olarlar. Orucu və həcci tərk etməklə kafir olmazlar."

Burada İmam Əhmədin namazı tərk edəni kafir görmədiyini söyləyənlərə cavab vardır. Şeyxul-İslamın da dediyi kimi, yalnız bir rəydə İmam Əhməd namazı tərk edəni kafir görməmişdir.

Daha sonra buyurur:

وهذه المسألة لها طرفان. (أحدهما) في إثبات الكفر الظاهر. و (الثاني) في إثبات الكفر الباطن. فأما " الطرف الثاني " فهو مبني على مسألة كون الإيمان قولا وعملا كما تقدم ومن الممتنع أن يكون الرجل مؤمنا إيمانا ثابتا

في قلبه بأن الله فرض عليه الصلاة والزكاة والصيام والحج ويعيش دهره لا يسجد لله سجدة ولا يصوم من رمضان ولا يؤدي لله زكاة ولا يحج إلى بيته فهذا ممتنع ولا يصدر هذا إلا مع نفاق في القلب وزندقة لا مع إيمان صحيح ؛ من السجود الكفار كقولـه: ولهذا إنما يصف سبحانه بالامتناع
{يوم يكشف عن ساق ويدعون إلى السجود فلا يستطيعون}
{خاشعة أبصارهم ترهقهم ذلة وقد كانوا يدعون إلى السجود وهم سالمون}
وقد ثبت في الصحيحين وغيرهما من حديث أبي هريرة وأبي سعيد وغيرهما في الحديث الطويل حديث التجلي {أنه إذا تجلى تعالى لعباده يوم القيامة سجد له المؤمنون وبقي ظهر من كان يسجد في الدنيا رياء وسمعة مثل الطبق لا يستطيع السجود} فإذا كان هذا حال من سجد رياء فكيف حال من لم يسجد قط وثبت أيضا في الصحيح {أن النار تأكل من ابن آدم كل شيء إلا موضع السجود فإن الله حرم على النار أن تأكله} فعلم أن من لم يكن يسجد لله تأكله النار كله وكذلك ثبت في الصحيح {أن النبي صلى الله عليه وسلم يعرف أمته يوم القيامة غرا محجلين من آثار الوضوء} فدل ذلك على أن من لم يكن غرا محجلا لم يعرفه النبي صلى الله عليه وسلم فلا يكون من أمته.

**”Bu məsələnin iki tərəfi vardır: Onlardan birincisi: Zahiri küfrün isbatı, ikincisi: Batini küfrün isbatı.**
**İkinci tərəfə gəldikdə, bu, imanın söz və əməldən ibarət olması üzərinə qurulan bir məsələdir. Bu əvvəldə izah olunmuşdur və insanın qəlbində Allahın ona namazı, zəkatı, orucu və həcci fərz qılması barədə sabit bir iman ilə mömin olması ilə birlikdə illərcə yaşadığı halda ömrü boyu bir dənə də olsa Allaha səcdə etməməsi, Ramazanda heç oruc tutmaması, heç zəkat verməməsi və Allahın evinə həcc etməməsi ağla sığmayan bir şeydir. Bu mümkün olan şey deyildir. Bu yalnız qəlbində nifaq olanlarda və zındıqlarda görünən bir haldır. Qəlbdə səhih bir imanla belə bir şey olmaz. Buna görə də Allah -Subhənəhu - kafirləri səcdədən boyun qaçırmaqla vəsf etmişdir:**
**"Baldırın açılacağı və onlar səcdəyə çağırılacaqları, lakin buna qadir ola bilməyəcəkləri gün onların baxışları yazıq görkəm alacaq, özlərini də zəlalət bürüyəcəkdir. Hərçənd ki, onlar**

dünyada ikən sağ-salamat halda səcdə qılmağa dəvət olunurdular."[214]

İki Səhihdə və digər kitablarda sabit olduğu kimi Əbu Hureyrə və Əbu Saiddən rəvayət olunan uzun bir hədisdə - "təcəlli hədisində" deyilir: "Qiyamət günü Allah qullarına görününcə möminlər səcdə edəcəklər. Lakin vaxtilə dünyada riya və şöhrət uğruna səcdə edənlərin belləri quruyacaq və onlar səcdə edə bilməyəcəklər." Əgər riya üçün səcdə edənlərin halı budursa, o zaman heç səcdə etməyənlərin halı necə olacaqdır? Eləcədə Səhihdə sabit olduğu kimi: "Atəş Adəm oğlunun səcdə yerlərindən başqa hər bir yerini yeyər. Çünki Allah atəşə səcdə yerlərini yeməyi haram qılmışdır." Bil ki, atəş dünyada heç səcdə etməyənin bütün yerini yeyər.[215] Eləcədə əs-Sahihdə sabit olmuşdur ki, peyğəmbər, *salləllahu aleyhi va səlləm*, Qiyamət günü ümmətini dəstəmazın izlərindəki parıltıdan və ağartıdan tanıyacaq. Bu dəlildir ki, parıltı və ağartı olmayan kəsləri peyğəmbər, *salləllahu aleyhi va səlləm*, tanımayacaqdır və onun ümmətindən sayılmayacaqlar.

Bu, bizim zamanımızdakı insanların halıdır. "*Qəlbimiz təmizdir*" dedikləri halda, Allahın bütün haramlarını edir və bütün fərzlərini tərk edirlər. İmkanları olduğu halda Allaha bir dəfə də olsun səcdə etməzlər, var-dövləti boğazlarına qədər dolu olduğu halda Allah yolunda sədəqə verməzlər. Allaha və peyğəmbərlərinə inandıqlarını söylədikləri halda, əməlləri ilə bunları yalanlayarlar. Halbuki, onların küfrü daha şiddətlidir!

---

[214] əl-Qaləm, 42-43

[215] Şəfaət hədislərindən danışarkən izah etmişdik ki, mələklər sonuncu olaraq atəşdən çıxanları səcdə izlərindən tanıyacaqlar və bu "Səhiheyn"də sabit olan bir hədisdir. Şeyxul-İslam da bunu dəlil gətirmişdir. Bu sözlərdən anlaşılır ki, şəfaət hədislərində Şeyx əl-Albaninin iddia etdiyindən fərqli olaraq namazlarını tərk edənlərin atəşdən qurtulacaqlarına dair heç bir dəlil yoxdur.

Bir çox müsəlmanlar isə buna əhəmiyyət vermirlər. Gündəlik həyatlarında belə insanlara etibar edərək kəsdikləri ətləri yeyirlər, onları kəbinlərində vəli olaraq qəbul edirlər. Ən azından belə şeylərdən uzaq durmaları lazımdır. Belə insanlar haqqında hökm verməsələr belə, onlardan dini həssasiyət üçün uzaq durmaqları lazımdır.

İbn Teymiyyə daha sonra mövzu ilə əlaqədar digər dəlilləri zikr edir:

وقولـه تعالى: {كلوا وتمتعوا قليلا إنكم مجرمون، ويل يومئذ للمكذبين، وإذا قيل لهم اركعوا لا يركعون، ويل يومئذ للمكذبين} وقولـه تعالى: {فما لهم لا يؤمنون، وإذا قرئ عليهم القرآن لا يسجدون، بل الذين كفروا يكذبون، والله أعلم بما يوعون}. وكذلك قولـه تعالى: {فلا صدق ولا صلى، ولكن كذب وتولى}. وكذلك قولـه تعالى: {ما سلككم في سقر، قالوا لم نك من المصلين، ولم نك نطعم المسكين، وكنا نخوض مع الخائضين، وكنا نكذب بيوم الدين، حتى أتانا اليقين} فوصفه بترك الصلاة كما وصفه بترك التصديق ووصفه بالتكذيب والتولي و " المتولي " هو العاصي الممتنع من الطاعة. كما قال تعالى: {ستدعون إلى قوم أولي بأس شديد تقاتلونهم أو يسلمون فإن تطيعوا يؤتكم الله أجرا حسنا وإن تتولوا كما توليتم من قبل يعذبكم عذابا أليما}.
وكذلك وصف أهل سقر بأنهم لم يكونوا من المصلين وكذلك قرن التكذيب بالتولي في قولـه: {أرأيت الذي ينهى، عبدا إذا صلى، أرأيت إن كان على الهدى، أو أمر بالتقوى، أرأيت إن كذب وتولى، ألم يعلم بأن الله يرى، كلا لئن لم ينته لنسفعن بالناصية، ناصية كاذبة خاطئة}

**“Eləcədə Allahu Təalə deyir:**

**“Kafirlərə deyiləcək: "Yeyin və bir az əylənin! Həqiqətən, siz günahkarlarsınız! O gün Qiyaməti yalan sayanların vay halına! Onlara: "Rüku edin!"– deyildiyi zaman rüku etməzlər. O gün haqqı yalan sayanların vay halına!”**[216]

**Allahu Təalə yenə deyir:**

[216] əl-Mursəlat, 46-49

“Onlara Quran oxunduqda səcdə etmirlər? Əksinə, küfr edənlər haqqı yalan sayırlar. Allah onların nəyi gizlətdiklərini çox yaxşı bilir!”[217]

Yenə Allahu Təalə buyurur:

“Nə təsdiq etdi, nə də namaz qıldı! Əksinə yalanladı və üz döndərdi.”[218]

Allahu Təalə bir başqa ayədə buyurur:

“Sizi Səqərə salan nədir? Onlar deyəcəklər: "Biz namaz qılanlardan deyildik. Kasıbı da yedizdirməzdik. Batil sözlər danıþanlarla birlikdə biz də danıþardıq və Haqq-hesab gününü yalan hesab edərdik . Bu halda ikən ölüm yəqinliyi bizə çatdı.”[219]

Allah onları bir yandan namazı tərk etməklə və digər yandan isə haqqı təsdiq etməməklə, haqqı yalanlamaqla və üz döndərmək ilə vəsf etmişdir. “Üz döndərən” isə itaətdən imtina edən asi biridir. Necəki Allahu Təalə buyurur:

Geri qalan bədəvilərə de: "Siz çox qüvvətli bir tayfaya qarşı döyüşməyə çağırılacaqsınız. Siz ya onlarla döyüşəcəksiniz, ya da onlar müsəlman olacaqlar. Əgər itaət etsəniz, Allah sizə gözəl bir mükafat verər. Yox, əgər daha əvvəl üz döndərdiyiniz kimi üz döndərsəniz, O sizə ağrılı-acılı bir əzab verər"[220]

Eləcədə cəhənnəm əhlini “namaz qılanlardan olmamaqla” vəsf etdiyi kimi, təkzib edənləri də aşağıdakı ayədə “(ibadətdən) üz döndərməklə” vəsf etmişdir:

“Bu bir bəndəyə namaz qıldığı zaman maneə olmaq istəyəni gördünmü? Söylə görək, əgər o bəndə doğru yoldadırsa, yaxud Allahdan qorxmağı əmr edirsə, onda necə olsun? Söylə

---

[217] əl-İnşiqaq, 21-23

[218] əl-Qiyamə, 31-32

[219] əl-Muddəssir, 42-47

[220] əl-Fəth, 16

**görək, əgər o kafir haqqı yalan sayıb üz döndəribsə, onda necə olsun? Məgər o bilmir ki, Allah görür? Xeyr! Əgər son qoymasa, Biz onun kəkilindən, o yalançı, günahkar kəkilindən tutub cəhənnəmə atacağıq!”**[221]

Burada ibadətlərdən üz döndərməyin küfr olduğu izah olunmuşdur, çünki Allahu Təalə bir çox yerdə “təvəlli” (üz döndərmək) ilə, təkzibi bir arada zikr etmişdir və Şeyxul-İslam bunu mövzu ilə əlaqədar dəlil olaraq gətirir. Bununla da anlaşılır ki, ibadətlərdən üz döndərmək və imtina etmək küfrün növlərindəndir. İnsan bu küfr ilə dindən çıxır və onun üçün dili ilə təkzib etməyi şərt qoşmaq heç bir dəlilə dayanmayan bir iddiadır.

İbn Teymiyyə İslamda qardaşlığın səhih olması üçün namazın şərt olduğunu izah etdikdən sonra deyir:

وأمثال هذه النصوص كثيرة في الكتاب والسنة. وأما الذين لم يكفروا بترك الصلاة ونحوها ؛ فليست لهم حجة إلا وهي متناولة للجاحد كتناولها للتارك فما كان جوابهم عن الجاحد كان جوابا لهم عن التارك ؛ مع أن النصوص علقت الكفر بالتولي كما تقدم ؛

**“Buna bənzər dəlillər Quran və Sünnətdə çoxdur. Lakin namaz və bənzərlərinin tərkinə görə təkfir etməyənlərin gətirdikləri hər bir dəlil namazın vacibliyini inkar edənləri əhatə etdiyi kimi namazı tərk edənləri də əhatə edir. Onların namazın vacibliyini inkar edən haqqındakı bütün cavabları eyni zamanda namazı tərk edənlər haqqında da onlara qarşı da cavabdır. Əvvəldə söylədiyimiz kimi bütün dəlillər küfrü namazdan üz döndərməklə əlaqələndirir.”**

Şeyxul-İslamın bu sözlərinə diqqət edək! Müxaliflərimiz dəlilləri təvil edərək, bunların namazın vacibliyini inkar edənlərə aid olduğunu iddia edirlər. İbn Teymiyyənin də

---

[221] əl-Aləq, 9-16

söylədiyi kimi bu mübahisəlidir, çünki bu dəlillər vacibiyyətini inkar edənləri də əhatə etdiyi kimi, sadəcə olaraq namazı tərk edənləri də əhatə edir. Sözünün sonunda isə doğru olanı təsbit edərək, bunların ibadətdən üz döndərənlərə aid olduğunu vurğulayır və əvvəldə bunun dəlillərini zikr etdiyinə işarə edir. Bu hədisləri təvil edənlər isə, heç bir dəlilə dayanmadan təvil edirlər və yaxud da xüsusi dəlilləri ümumi dəlillərlə təvil etməyə çalışırlar. Bu isə xətadır! Şeyxul-İslam daha sonrakı sözlərində bunu belə izah edir:

وهذا مثل استدلالهم بالعمومات التي يحتج بها المرجئة كقوله {من شهد أن لا إله إلا الله وأن محمدا رسول الله وأن عيسى عبد الله ورسوله وكلمته ألقاها إلى مريم وروح منه... أدخله الله الجنة} ونحو ذلك من النصوص. وأجود ما اعتمدوا عليه قوله صلى الله عليه وسلم {خمس صلوات كتبهن الله على العباد في اليوم والليلة. فمن حافظ عليهن كان له عند الله عهد أن يدخله الجنة ومن لم يحافظ عليهن لم يكن له عند الله عهد إن شاء عذبه. وإن شاء أدخله الجنة}. قالوا: فقد جعل غير المحافظ تحت المشيئة. والكافر لا يكون تحت المشيئة ولا دلالة في هذا ؛ فإن الوعد بالمحافظة عليها والمحافظة فعلها في أوقاتها كما أمر كما قال تعالى:
{حافظوا على الصلوات والصلاة الوسطى}
وعدم المحافظة يكون مع فعلها بعد الوقت كما أخر النبي صلى الله عليه وسلم صلاة العصر يوم الخندق فأنزل الله آية الأمر بالمحافظة عليها وعلى غيرها من الصلوات. وقد قال تعالى:
{فخلف من بعدهم خلف أضاعوا الصلاة واتبعوا الشهوات فسوف يلقون غيا}
فقيل لابن مسعود وغيره: ما إضاعتها ؟ فقال: تأخيرها عن وقتها فقالوا: ما كنا نظن ذلك إلا تركها فقال: لو تركوها لكانوا كفارا.

**“Eləcədə onların ümumi nəssləri dəlil olaraq gətirmələri mürciələrin dəlil gətirməkləri kimidir, bu misalda olduğu kimi: "Kim Allahdan başqa məbud olmadığına və Muhamməddin Allahın Rasulu olduğuna və İsanın Allahın qulu və Onun Rasulu və Onun Məryəmə endirdiyi kəliməsi və Onun tərəfindən olan ruh olduğuna... şəhadət edərsə Allah onu Cənnətə daxil edər." Eləcədə buna bənzər digərlərini də**

dəlil gətirirlər.
Onların etimad etdikləri ən güclü dəlil isə peyğəmbərin, *salləllahu aleyhi va səlləm,* bu sözüdür: "Allah bəndələrinə bir gün və bir gecədə beş vaxt namazı fərz buyurmuşdur. Kim bunları davamlı qılarsa Allah yanında onu Cənnətə daxil edəcəyi barədə əhs vardır. Əgər davamlı qılmazsa Allahın onun üçün heç bir əhdi yoxdur. Diləsə əzab edər, diləsə Cənnətə daxil edər."
Onlar deyirlər: "Namazlarını davam etməyənlər Allahın istəyi altındadır, kafir isə Allahın istəyi altında ola bilməz." Lakin hədis buna dəlil deyildir. Çünki vad "namazlara davam etmək" haqqındadır və davamlı qılmaq isə əmr olunduğu kimi onları vaxtında qılmaqdır. Allahu Təalənin dediyi kimi: "Namazları, xüsusilə orta namazı qoruyun (davamlı qılın)"[222] Davamsızlıq isə namazların vaxtından sonra qılınması ilə olur. Peyğəmbərdən, salləllahu aleyhi va səlləm, Xəndək günündə asr namazı barədə xəbər verildiyi kimi və bu namazın və digər namazların davamlı qılınması haqqında Allah ayə nazil etdi. Allahu Təalə deyir: "Onların arxasınca namazı buraxıb şəhvətə uyan bir nəsil gəldi. Onlar ziyana uğrayacaqlar."[223] İbn Məsuda və digər səhabələrə soruşdular? "Namazı buraxmaqları nədir?" Dedi: "Vaxtından sonraya gecikdirmək". Onlar dedilər: "Biz bunun yalnız namazı tərk etmək olduğunu zənn edirdik." (İbn Məsud) dedi: "Əgər tərk etsəydilər kafir olardılar."

Söylədiyimiz kimi, müxaliflərimizin bu mövzuda gətirdikləri dəlillər yalnız ümumi mənalı dəlillərdir. Şeyxul-İslam İbn Teymiyyənin də, rahiməhullah, söylədiyi kimi, bu şəkildə adətən mürciələr əhli-sünnətə qarşı dəlil gətirirlər. Bu barədə Şeyx Favzanın da sözləri yuxarıda zikr olunmuşdu, beləki, o da bu cür dəlillərin şübhə əhli tərəfindən gətirildiyinə

[222] əl-Bəqara, 238
[223] Məryəm, 59

işarə edir.[224] Mövzunu araşdıran qardaşlarımızı bu barədə xəbərdar etmək arzusundayıq və onların daha ayıq davranmaları lazımdır.

Daha sonra Şeyxul-İslam namazlardan birini, yoxsa hamısının tərk etməyin küfr olmasından söz açır və deyir:

وكذلك قولـه:
{فويل للمصلين، الذين هم عن صلاتهم ساهون}
ذمهم مع أنهم يصلون ؛ لأنهم سهوا عن حقوقها الواجبة من فعلها في الوقت وإتمام أفعالها المفروضة كما ثبت في صحيح مسلم {عن النبي صلى الله عليه وسلم أنه قال: تلك صلاة المنافق تلك صلاة المنافق تلك صلاة المنافق يرقب الشمس حتى إذا كانت بين قرني شيطان قام فنقر أربعا لا يذكر الله فيها إلا قليلا} فجعل هذه صلاة المنافقين لكونه أخرها عن الوقت ونقرها. وقد ثبت في الصحيح {عن النبي صلى الله عليه وسلم: أنه ذكر الأمراء بعده الذين يفعلون ما ينكر ؛ وقالوا: يا رسول الله أفلا نقاتلهم قال: لا ما صلوا} وثبت عنه أنه قال: {سيكون أمراء يؤخرون الصلاة عن وقتها فصلوا الصلاة لوقتها ثم اجعلوا صلاتكم معهم نافلة} فنهى عن قتالهم إذا صلوا وكان في ذلك دلالة على أنهم إذا لم يصلوا قوتلوا وبين أنهم يؤخرون الصلاة عن وقتها وذلك ترك المحافظة عليها لا تركها. وإذا عرف الفرق بين الأمرين فالنبي صلى الله عليه وسلم إنما أدخل تحت المشيئة من لم يحافظ عليها لا من ترك ونفس المحافظة يقتضي أنهم صلوا ولم يحافظوا عليها ولا يتناول من لم يحافظ فإنه لو تناول ذلك قتلوا كفارا مرتدين بلا ريب

**"Eləcədə Allahın bu sözü də buna dəlildir: "Vay halına namaz qılanların, o şəxslərin ki, onlar namazlarında səhlənkardırlar."[225] Allah onları namaz qıldıqları halda zəmm etmişdir, çünki onları namazı vaxtında qılmaq və fərzləri tam yerinə yetirmək kimi namazın vacib haqqlarında səhlənkarlıq**

---

[224]Bununla namazı tərk edəni kafir saymayan əhli-sünnət alimlərinin dəyərini aşağı salmaq qəsd olunmur. Çünki son dövr alimlər mütəkəllim filosoflar ilə sələfin sözlərini ayırmaqda xətalara yol vermişdir. Onlar belə xətalarına görə zəmm olunmazlar, əksinə səhih hədisdə qeyd olunduğu kimi yalnız bir əcr qazanmış olurlar.

[225] (əl-Maun, 4-5)

edirlər. Səhih Müslimdə sabit olduğu kimi peyğəmbər, *salləllahu aleyhi va səlləm* buyurmuşdur: "O, münafiq namazıdır, o münafiq namazıdır, o münafiq namazıdır. Günəşi gözləyib günəş şeytanın buynuzları arasına gəldikdə qalxıb tələsik dörd rükət namazı qılar və Allahı çox az zikr edər." Namazı vaxtından sonraya gecikdirdiyi üçün və oyalandığı üçün peyğəmbər bu namazı münafiq namazı adlandırmışdır. Əs-Səhihdə peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, sabit olduğu kimi o, özündən sonra münkər əməllər edəcək əmirləri zikr etmişdir. Bunu eşitdikdə səhabələr soruşdular: "Ya Rasulullah! Onlara qarşı vuruşmayaq?" Dedi "Namaz qıldıqları müddətcə, xeyr!" Başqa bir hədisdə sabit olduğu kimi peyğəmbər demişdir: "Namazlarını gecikdirən əmirlər olacaqdır, siz namazlarınızı vaxtında qılın və daha sonra onlarla birlikdə nafilə olaraq qılın!" Peyğəmbər namaz qıldıqları müddətcə qarşı bu əmirlərə qarşı vuruşmağı nəhy etmişdir. Bu da ona dəlildir ki, onlar namazlarını qılmasaydılar onlara qarşı vuruşardılar. Onların namazlarını vaxtından gecikdirəcəklərini bəyan etmişdir. Bu isə namazın davamiyyətini tərk etməkdir, yoxsa namazın özünü tərk etmək deyildir. Əgər bu iki halın arasındakı fərqi bildinsə, məlum olur ki, peyğəmbərimiz namazı tərk edənləri yox, namazı davamlı qılmayanları Allahın istəyi (məşiyyəti) altına daxil etmişdir. Davamlılığın özü onların namaz qılmaqlarını tələb edir. Namazlarını mühafizə etməzlər və (birinci hədis) namazlarını davamlı qılmayanlara aid deyildir. Əgər namazlarını davamlı qılmayanlara aid olsaydı, o zaman heç şübhəsiz ki, onlara qarşı kafir və mürtəd kimi vuruşardılar."

Burada Şeyxul-İslam namazlarını qorumayan və bəzən qılıb, bəzən qılmayan və yaxud da vaxtlarından sonra qılan hakimlər haqqında danışır. Hədislərə əsasən onların kafir olmadığını isbat edir. Çünki digər hədislərdə namazı tərk etməyin açıq-aydın küfr olduğu zikr olunmuşdur, lakin burada

isə namazlarını hifz etməməkləri zikr olunur. Bu sözlər bizim söylədiklərimizi təsdiqləyir və əvvəldə qeyd etdiyimiz kimi, yalnız namazı tamamilə tərk etmək insanı dindən çıxaran küfrdür. Hədislər buna dəlalət edir.

Daha sonra buyurur:

ولا يتصور في العادة أن رجلا يكون مؤمنا بقلبه مقرا بأن الله أوجب عليه الصلاة ملتزما لشريعة النبي صلى الله عليه وسلم وما جاء به يأمره ولي الأمر بالصلاة فيمتنع حتى يقتل ويكون مع ذلك مؤمنا في الباطن قط لا يكون إلا كافرا ولو قال أنا مقر بوجوبها غير أني لا أفعلها كان هذا القول مع هذه الحال كذبا منه كما لو أخذ يلقي المصحف في الحش ويقول أشهد أن ما فيه كلام الله أو جعل يقتل نبيا من الأنبياء ويقول أشهد أنه رسول الله ونحو ذلك من الأفعال التي تنافي إيمان القلب فإذا قال أنا مؤمن بقلبي مع هذه الحال كان كاذبا فيما أظهره من القول. فهذا الموضع ينبغي تدبره فمن عرف ارتباط الظاهر بالباطن زالت عنه الشبهة في هذا الباب وعلم أن من قال من الفقهاء أنه إذا أقر بالوجوب وامتنع عن الفعل لا يقتل أو يقتل مع إسلامه ؛ فإنه دخلت عليه الشبهة التي دخلت على المرجئة والجهمية والتي دخلت على من جعل الإرادة الجازمة مع القدرة التامة لا يكون بها شيء من الفعل ولهذا كان الممتنعون من قتل هذا من الفقهاء بنوه على قولهم في " مسألة الإيمان " وأن الأعمال ليست من الإيمان وقد تقدم أن جنس الأعمال من لوازم إيمان القلب وأن إيمان القلب التام بدون شيء من الأعمال الظاهرة ممتنع سواء جعل الظاهر من لوازم الإيمان أو جزءا من الإيمان كما تقدم بيانه.

**“Normal olaraq düşünülməz ki, hər hansı bir kəs qəlbində mömin olsun, Allahın ona namazı fərz etdiyini qəbul etsin, peyğəmbərin, *salləllahu aleyhi va səlləm,* şəriətinə və onun gətirdiklərinə bağlı olsun və vəliyyul-əmr ona namaz qılmağı əmr etsin və o da öldürülənə qədər bundan boyun qaçırsın və bununla birlikdə isə qətiyyən mömin olsun. Belə insan yalnız kafir ola bilər. Əgər "Mən vacib olduğunu qəbul edirəm, lakin onu etmirəm" deyərsə, bu söz onun bu halı qarşısında yalan olar. Necəki mushafı götürüb pisliyə atan bir kəsin "Bu kitabda yazılan hər şeyin Allahın sözü olduğuna şəhadət edirəm" deməsi və ya peyğəmbərlərdən birini öldürən bir**

kəsin bu cinayəti edərkən "Mən onun Allahın Elçisi olduğuna şəhadət edirəm" deməsi və bunlara bənzər qəlbdəki imanı aradan qaldıran əməllər edənin halı kimi. "Mən qəlbimdə möminəm" deyərsə izhar etdiyi bu sözündə yalan söyləmişdir Bu mövzu haqqında düşünmək lazımdır. Zahir ilə batin arasındakı irtibatı bilən kəs üçün bu məsələdəki şübhə aradan qalxar. O zaman biləcək ki, "kim namazın vacibliyini qəbul edərsə, lakin namazı qılmaqdan boyun qaçırarsa öldürülər" və ya "müsəlman olaraq öldürülər" deyən faqihlər bu məsələdə mürciələr və cəhmiyyənin düşdüyü şübhəyə düşmüşdür. Eləcədə "kəsin iradə ilə bir arada olan tam bir qüdrət ilə birlikdə heç bir fel olmaya bilər" deyənlərin də şübhəsinə düşmüşlər. Buna görə də namazı tərk edənin öldürülməyəcəyini söyləyən faqihlər bu fikirlərini iman məsələsindəki etiqadları üzərinə qurublar, yəni onlara görə əməllər imandan deyildir. Lakin əvvəldə söylədiyimiz kimi cinsul-aməl[226] qəlbdəki imanın vacib nəticəsidir və zahiri əməllərdən bir şey olmadan qəlbdə səhih bir imanın olması

[226] Cinsul-aməl: bütün zahiri əməllərin tamamına verilən addır. Bundan fərqli olaraq isə "əhədul-aməl" isə zahiri əməllərdən hər hansı birinə verilən addır. Xaricilər ilə əhli-sünnəti fərqləndirmək üçün bu qavramları anlamaq lazımdır. Çünki xaricilərə görə əhədul-aməl imanın səhihliyinin şərtidir. Yəni, insan vacib olan əməllərdən birini tərk etməklə imanını tərk etmiş olur və kafir olur. Əhli-Sünnət isə cinsul-aməli imanın səhihliyi üçün şərt görmüşdür. Yəni, insan yalnız bütün zahiri əməlləri tərk etməklə, imanı tərk etmiş sayılır. Bəzi alimlər bu terminləri istifadə etməyi xoş görmürlər, çünki sələf bu şəkildə terminlərə müraciət etməmişdir. Lakin, biz deyirik ki, məsələnin daha da gözəl anlaşılması üçün bunlara ehtiyac vardır.
Zamanımızda bəzi cahillər iddia edirlər ki, insanda zahiri əməllər olmasa da, qəlbin əməlləri ola bilər. Bu isə batil bir iddiadır və imanın həqiqətindən cahil olanların söyləyə biləcəyi sözdür. İşin qəribə tərəfi budur ki, onlar bunu İbn Teymiyyəyə və İbnul-Qayyimə istinad edirlər. Halbuki, onların sözlərini biz təqdim edirik və onlar bu cahillərin iddia etdiklərinin əksini söyləyirlər.

**<u>mümkün deyildir.</u> İstərsə bu zahiri əməllərə qəlbdəki imanın vacib nəticəsi deyilsin, istərsə də bunlara imanın bir cüzü (ayrılmaz bir hissəsi) adı verilsin, fərq etməz. Bunun izahı əvvəldə keçmişdir.”**

Burada bəzi iddiaları rədd etmişdir. Fəqihlərin çoxuna görə namazı tərk edən tövbəyə dəvət edilər, lakin tövbə etməzsə və namaz qılmaqdan imtina edərsə öldürülər və sonra müsəlman kimi yuyular, cənazəsi qılınar və müsəlman məqbərəsində dəfn olunar. İbn Teymiyyə, *rahiməhullah*, bunu rədd edir və bunun əsassız bir hökm olduğunu izah edir. Bu sözü söyləyənlərin əslində mürciə məzhəbinin şübhələrinə düşdüyünü də ifadə edir.

Digər tərəfdən isə zahiri əməllər məsələsində xəta edən qruplara da cavab vermişdir. Çünki zahiri əməllər məsələsində əhli-sünnətdən olduğunu iddia edən, lakin əslində mürciənin görüşlərini bölüşən bir çox qrup vardır. Zamanımızda da belə qruplar “sələfi” dəvəti adı altında öz məzhəblərini yayırlar. Onlara görə “zahiri əməllər imanın kamilliyi üçün şərtdir”. Bunu sələfin əqidəsi olaraq təqdim edirlər. Bilin ki, sələf onların dedikləri sözlərdən uzaqdır və bu, aşkar bir yalandır. Sələf zahiri əməlsiz imanın olmayacağını söyləmişdir və İbn Teymiyyə də bunu yuxarıda bu şəkildə izah etmişdir.

İbn Teymiyyə bunu mövzunun davamında bu şəkildə izah etmişdir:

وحينئذ فإذا كان العبد يفعل بعض المأمورات ويترك بعضها كان معه من الإيمان بحسب ما فعله والإيمان يزيد وينقص ويجتمع في العبد إيمان ونفاق. كما ثبت عنه في الصحيح أنه قال: {أربع من كن فيه كان منافقا خالصا ومن كانت فيه خصلة منهن كانت فيه خصلة من النفاق حتى يدعها إذا حدث كذب وإذا اؤتمن خان وإذا عاهد غدر وإذا خاصم فجر}. وبهذا تزول الشبهة في هذا الباب فإن كثيرا من الناس ؛ بل أكثرهم في كثير من الأمصار لا يكونون محافظين على الصلوات الخمس ولا هم تاركوها بالجملة بل يصلون أحيانا ويدعون أحيانا فهؤلاء فيهم إيمان ونفاق وتجري عليهم أحكام الإسلام

الظاهرة في المواريث ونحوها من الأحكام ؛ فإن هذه الأحكام إذا جرت على المنافق المحض - كابن أبي وأمثاله من المنافقين - فلأن تجري على هؤلاء أولى وأحرى.

**“Bu belə olduqda, bəzi əmr olunan şeyləri edən və bəzilərini də tərk edən bir qulda etdikləri qədər iman vardır. İman isə artıb azala bilir. Qulda iman və nifaq bir arada ola bilər. Beləki peyğəmbərdən "əs-Sahih"də sabit olduğu kimi o, demişdir: "Bu dörd şey kimdə varsa o, xalis münafiqdir. Kimdə bu xislətlərdən biri varsa, bu xisləti tərk edənə qədər həmin insanda nifaqdan bir xislət vardır. Əgər yalan danışarsa, verilən əmanətə xəyanət edərsə, verdiyi sözdən dönərsə və mübarizədə çirkin yollara əl atarsa."[227] Bununla məsələdəki şübhələr aradan qalxar. Çünki insanların çoxu, - onların isə çoxu çoxlu şəhər bölgələrində yaşayır - beş vaxt namazı davamlı qılmazlar və onların hamısını da tərk etməzlər. Lakin bəzən qılarlar, bəzən də qılmazlar. Bu kəslərdə həm iman, həm də nifaq vardır. Miras və bənzəri zahiri İslam hökmləri isə bunların üzərinə tətbiq olunur. Əgər bu hökmlər Əbu Ubeyy və onun kimi əsl münafiqlər haqqında tətbiq olunursa, bunlar haqqında tətbiq olunması isə daha doğrudur."**

Bu eləcədə İbnul-Qayyimin də görüşüdür. O da öz müəllimi kimi məsələ yanaşmışdır və hər ikisi də bunu imanın anlaşılmasına bağlı bir məsələ olaraq təqdim ediblər. Həqiqət də buna bağlıdır! Ona görə biz də deyirik: Namazlarını bəzən qılıb, bəzən qılmayanlar müsəlmanlardır. Belə insanlar təkfir edilməz.

Lakin ibadətləri tamamilə tərk edənlərin halı isə fərqlidir və bunlar haqqında İbn Teymiyyə mövzunun davamında buyurur:

---

[227] əl-Buxari, əl-İmən, (34); Muslim, əl-İmən, (58); ət-Tirmizi, (2632); ən-Nəsai, (5020); Əbu Davud, əs-Sunnə, (4688); Əhməd, 2/189

وقد تبين أن الدين لا بد فيه من قول وعمل وأنه يمتنع أن يكون الرجل مؤمنا بالله ورسوله بقلبه أو بقلبه ولسانه ولم يؤد واجبا ظاهرا ولا صلاة ولا زكاة ولا صياما ولا غير ذلك من الواجبات لا لأجل أن الله أوجبها مثل أن يؤدي الأمانة أو يصدق الحديث أو يعدل في قسمه وحكمه من غير إيمان بالله ورسوله لم يخرج بذلك من الكفر فإن المشركين وأهل الكتاب يرون وجوب هذه الأمور فلا يكون الرجل مؤمنا بالله ورسوله مع عدم شيء من الواجبات التي يختص بإيجابها محمد صلى الله عليه وسلم. ومن قال: بحصول الإيمان الواجب بدون فعل شيء من الواجبات سواء جعل فعل تلك الواجبات لازما له ؛ أو جزءا منه فهذا نزاع لفظي كان مخطئا خطأ بينا وهذه بدعة الإرجاء التي أعظم السلف والأئمة الكلام في أهلها وقالوا فيها من المقالات الغليظة ما هو معروف والصلاة هي أعظمها وأعمها وأولها وأجلها.

"Aydın oldu ki, din həm sözlə, həm də əməllə olmalıdır. Bir insanın qəlbində Allaha və rasuluna iman gətirməsi və ya həm qəlbində, həm də dilində iman gətirməsi və buna qarşılıq heç bir zahiri fərzləri icra etməməsi, yəni nə namaz qılmaması, nə zəkat verməməsi, nə oruc tutmaması, nə də başqa bu kimi fərzləri yerinə yetirməməsi mümkün deyildir, belə bir şey ola bilməz. İnsanın Allahın bunları vacib qılması səbəbi ilə də etməsi mömin olması üçün kifayət deyildir. (Yəni) Məsələn Allaha və Rasuluna iman gətirmədən əmanəti qaytarmaq, doğru danışmaq və ya verdiyi andında və sözündə adil olmaq kimi ibadətləri etməklə insan küfrdən çıxmaz. Çünki müşriklər və Kitab əhli bu işlərin vacib olduğuna inanırlar.

Muhamməde, *salləllahu aleyhi va səlləm*, xüsusən fərz qılınmış bu fərzlərdən heç birinə əməl etmədən insan Allaha və Rasuluna iman gətirmiş sayılmaz. Kim desə ki, "lazım olan iman bu fərzlərdən heç bir şeyə əməl etmədən də ortaya çıxa bilər, istər bu fərzlərə əməl etməyi imanın vacib nəticəsi adlandırsın, istərsə də bunları imanın ayrılmaz hissəsi saysın, - bu ləfzi bir ixtilafdır - bu sözü söyləyən açıq bir xəta ilə xəta etmişdir və bu irca bidətidir və sələf və kəlam imamları bu

**bidətin sahibləri haqqında xüsusi xəbərdarlıq ediblər və onlar haqqında ağır sözlər söyləyiblər və bu məlumdur. Namaz isə bunların ən böyüyü, ən əsası, ən fəzilətlisi və ən üstünüdür."**

İnsaf sahibləri üçün bu sözlər kifayət etməlidir. Sözümüzü burada bitirmək istəyirik və sizə təqdim etdiyimiz materialın əsasında deyirik ki, namazı tərk edən kafirdir. Peyğəmbərimizin, salləllahu aleyhi va səlləm, hədisləri buna dəlalət edir və səhabələrin icması bunu təsdiqləyir. İlk dövr hədis alimləri bunları gəldiyi kimi qəbul etmişlər və təvil etmədən zahiri anlamlarına həvalə ediblər.

Sonunda Allahın bu ayəsini xatırlamaq istəyirik:

﴿ مُنِيبِينَ إِلَيْهِ وَاتَّقُوهُ وَأَقِيمُوا الصَّلَاةَ وَلَا تَكُونُوا مِنَ الْمُشْرِكِينَ ﴾

**﴿ Tövbə edərək Ona üz tutun, Ondan qorxun, namaz qılın və şərik qoşanlardan olmayın!”﴾**[228]

# ŞƏFAƏT HƏDİSLƏRİNİN TƏXRİCİ

---

[228] ər-Rum,31

İmam əl-Mərvazi, *rahiməhullah*, bu ayə barədə deyir:

فبيَّن أن علامة أن يكون من المشركين، ترك الصلاة

**”Allah bununla bəyan etmişdir ki, müşrik olmağın əlaməti namazı tərk etməkdir.”**

”Tazim Qadr əs-Salət”, 2/1005-1006

## 1. **Əbu Said əl-Xudrinin, *radiyallahu anhu*, hədisi:**

**A** - Əl-Leys, Xalid ibn Yeziddən, o da Said ibn Əbi Hiləldən, o da Zeyd ibn Əsləmdən, o da Ata ibn Yəsardan, o isə Əbu Saiddən rəvayət edir: Dedi: **“Biz dedik: “Ey Allahın Rasulu! Biz Rəbbimizi Qiyamət günü görəcəyikmi?...** və hədis uzun bir hədisdir və hədisin şəfaətdən bəhs edən hissəsi belədir:

"فما أنتم بأشدلي مُنَا شَدَةً في الحق قد تبين لكم؛ من المؤمنين يومئذٍ للجبار، إذا رأوا أنهم قد نجوا في إخوانهم، يقولون: ربنا إخواننا الذين كانوا يصلون معنا، ويصومون معنا، ويعملون معنا، فيقول الله عزوجل: اذهبوا، فمن وجدتم في قلبه مثقال دينار من إيمان؛ فأخرجوه، ويحرم الله صورهم على النار، فيأتونهم، وبعضهم قد غاب في النار إلى قدمه، وإلى أنصاف ساقيه، فيُخْرِجون مَنْ عَرَفُوا، ثم يعودون، فيقول: اذهبوا؛ فمن وجدتم في قلبه مثقال نصف دينار؛ فأخرجوه، فيُخْرِجون مَنْ عَرَفُوا، ثم يعودون، فيقول: اذهبوا، فمن وجدتم في قلبه مثقال ذرة من إيمان؛ فأخرجوه، فيُخْرِجون مَنْ عَرَفُوا" قال أبوسعيد: فإن لم تصدقوني؛ فاقرأوا:
إن اللهَ لا يَظْلِمُ مِثْقَالَ ذَرَّةٍ وَإِنْ تَكُ حَسَنَةً يُضَاعِفْهَا،
قال رسول الله، صلى الله عليه وسلم: "فيشفع النبيون والملائكة والمؤمنون، فيقول الجبار: بقيت شفاعتي،فيقبض قبضة من النار، فيخرج أقوامًا قد امتحشوا، فيلقون في نهر بأفواه الجنة، يقال له: ماء الحياة، فينبتون في حافتيه، كما تنبت الحبة في حميل السيل، قد رأيتموها إلى جانب الصخرة، وإلى جانب الشجرة، فما كان إلى الشمس منها؛ كان أخضر، وما كان منها إلى الظل؛ كان أبيض، فيخرجون كأنهم اللؤلؤ، فيجعل في رقابهم الخواتيم، فيدخلون الجنة، فيقول أهل الجنة: هؤلاء عتقاء الرحمن، أدخلهم الله الجنة، بغير عمل عملوه، ولا خير قَدَّموه، فيقال لهم: لكم ما رأيتم، ومثله معه".

**“Siz, sizə aid olduğu aydın olan bir haqqınızı məndən tələb etməkdə şiddətlisiniz, lakin o gün (Qiyamət günü) möminlər, özlərinin xilas olduqlarını gördükdə öz qardaşlarının haqqları üçün əl-Cabbardan tələb etməkdə sizdən də şiddətli**

olacaqlar. Onlar deyəcəklər: “Rəbbimiz! Bizim qardaşlarımız bizimlə namaz qılırdılar, bizimlə oruc tuturdular və bizimlə birlikdə yaxşı əməllər edirdilər.” Allah Azzə və Cəllə deyəcək: “Gedin və qəlbində bir dinar ağırlığında iman gördüyünüz hər kəsi çıxarın!” və Allah onların üzlərini yandırmağı atəşə haram edib.” Onlar ora gələcəklər və onların bəzilərinin atəşdə ayaqlarına qədər batdığını və bəzilərinin də baldırlarının ortasına qədər batdığını görəcəklər. Onlar tanıdıqlarını ordan çıxaracaqlar və sonra qayıdacaqlar. Allah onlara deyəcək: “Gedin və qəlbində bir dinarın yarısı qədər iman gördüyünüz hər kəsi ordan çıxarın!” Onlar tanıdıqlarını ordan çıxaracaqlar və geri dönəcəklər. Allah onlara deyəcək: “Gedin və qəlbində zərrə qədər iman gördüyünüz hər kəsi ordan çıxarın!” Onlar tanıdıqlarını oradan çıxaracaqlar. Əbu Said dedi:

“Əgər kim bu hədisə inanmırsa bu ayəni oxusun: “Həqiqətən Allah zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə onu iki qat artırar və öz tərəfindən də böyük mükafat verər”

Peyğəmbər, *salləllahu aleyhi va səlləm*, dedi: “Sonra peyğəmbərlər, mələklər və möminlər şəfaət etdikdən sonra əl-Cabbar deyəcək: ‘İndi Mənim şəfaətim qalıb. Sonra O, atəşdən bir qəbz (əl dolusu) götürəcək və ordan bədənləri yanmış toplular çıxaracaq və onlar Cənnətin girişindəki çaya atılacaqlar. Bu çaya “Həyat suyu” deyilir. Selin gətirdiyi yabanı reyhan toxumunun bitdiyi kimi bu çayın sahillərində bitəcəklər. Siz onun bəzən bir daş və ya bir ağac dibində bitdiyini görmüsünüz, günəşə tərəf olan hissəsi yaşıl, kölgədə qalan hissəsi isə açıq olur. Onlar ordan sanki mirvarilər kimi çıxacaqlar və boyunlarında qızıl halqalar olacaq. Cənnətə daxil olacaqlar. Cənnət əhli onlara deyəcək: “Bunlar ər-Rahmənin azadlılarıdır. Heç bir əməl etmədiyi halda və heç bir xeyri tərceh etmədikləri halda Allah onları Cənnətə daxil

**etmişdir." Sonra onlara deyiləcək: "Gördükləriniz və yenə bir o qədər də sizindir."**[229]

Bunu əl-Buxari "Kitab ət-Təvhid"də təxric etmişdir və ləfz ona aiddir. Yenə əl-Buxari bunu müxtəsər olaraq (hədis: 4919) təxric etmişdir. Bunu eləcədə Muslim fərqli ləfz ilə rəvayət etmişdir və Hafs bin Meysərənin hədisinə aid etmişdir. Eləcədə əd-Daraqutni "ər-Ruyə" əsərində, Ibn Məndə isə "əl-Imən" əsərində, rəvayət etmişdir.

**B** – Yenə əl-Leysi, Yezib ibn Əbi Həbibdən, o da Said ibn Əbi Hiləldən, o da Zeyd ibn Əsləmdən, o da Ata bin Yəsardan, o isə Əbu Saiddən eyni hədisi rəvayət etmişdir. Bunu Ibn Hibban (7377) təxric etmişdir.

**C** – Bunu Hafs bin Meysərə, Yezid bin Əsləmdən, o da Ata bin Yəsardan, o da Əbu Saiddən rəvayət etmişdir. Bu hədisin ləfzi yuxarıdakı hədislərin ləfzlərinə yaxındır: **"...Sonra atəşdən bir qəbz (əl dolusu) götürəcək və ordan heç bir xeyr əməl etməmiş bir qövmü çıxaracaqdır..."** və sonra **"Çaydan mirvarilər kimi çıxacaqlar və boyunlarında qızıldan halqalar olacaqdır. Cənnət əhli onları tanıyacaq və (deyəcəklər): "Bunlar Allahın azadlılarıdır. Heç bir əməl etmədən və heç bir xeyri tərceh etmədən Allah onları Cənnətə daxil etmiþdir..."**[230]

Bunu Muslim bu ləfz ilə təxric etmişdir və eyni sənəd ilə əl-Buxari də müxtəsər şəkildə təxric etmişdir. Eləcədə Ibn Məndə uzun bir mətn ilə rəvayət etmişdir.

---

[229] əl-Buxari, (7439, 4939); Muslim, (183); əd-Daraqutni, (9, 10, 11); İbn Məndə, 2/800 (871)

[230] Muslim, (183); əl-Buxari, (4581) və İbn Məndə, 2/802 (818)

**Ç** – Hişam bin Said: Zeyd bin Əsləm bizə Ata bin Yəsardan, o da Əbu Saiddən, Hafs bin Meysərənin hədisinin bənzərini rəvayət etdi. Bunu Muslim, Əbu Avanə, Ibn Xuzeymə "ət-Təvhid"əsərində, əl-Hakim, əl-Mərvazi "əs-Salət"əsərində, əd-Dəraqutni "ər-Ruya" əsərində və Ibn Məndə "əl-Imən" əsərində rəvayət etmişdir.[231]

**D** – Mamər, Zeyd bin Əsləmdən, o da Ata bin Yəsardan, o isə Əbu Saiddən bənzərini rəvayət etmişdir. Bunu Abdurrazzaq "əl-Musənnəf" əsərində rəvayət etmişdir və eyni sənəd ilə Əhməd və əl-Mərvazi "əs-Salət" əsərində rəvayət etmişdir. Eləcədə ən-Nəsai, ət-Tirmizi bunu çox müxtəsər şəkildə rəvayət ediblər. Yenə Ibn Macə, Əbu Avanə və Ibn Xuzeymə "ət-Təvhid" əsərində və əl-Bəğavi "Şərh əs-Sunnə" əsərində və "Təfsir" əsərində rəvayət etmişdir.[232] Abu Avanə və Ibn Xuzeymə **"Tanıdıqlarınızı ordan çıxarın və üzlərinə baxıb tanıyacaqlar. Atəþ üzlərini yandırmayacaq..."** ləfzi ilə rəvayət edərək Abdurrazzaqa tabe olublar.

**E** – Abdurrahmən ibn İshaq dedi: Zeyd ibn Əsləm bizə Ata bin Yəsardan, o da Əbu Saiddən rəvayət etdi. Bənzər bir hədisi rəvayət edir.

Bunu Əhməd (11127) təxric etmişdir. Abdurrahmən ibn İshaq isə Əbu Abdullah əl-Mədənidir, onun haqqında bəzi zərərsiz sözlər deyilmişdir.

Bütün bu rəvayətlərin hamısı Zeyd ibn Əsləmin, Ata bin Yəsardan, onun da Əbu Said yolu ilə rəvayət etdikləridir.

---

231 Muslim, (183); Əbu Avanə, 1/181-183; İbn Xuzeymə, 2/729-730 (464); əl-Hakim, 4/582; əl-Mərvazi, (277); əd-Dəraqutni, (7, 8); İbn Məndə, 2/797 (816)

232 "**əl-Musənnəf**", 11/409-411 (20857); Əhməd (11898); əl-Mərvazi, (276); ən-Nəsai, (5010); ət-Tirmizi, (2598); İbn Macə, (60); İbn Xuzeymə, (430); əl-Bəğavi, "**Şərh əs-Sunnə**", 15/181 (43458) və "**ət-Təfsir**" 1/428; Əbu Avanə, 1/183

Ə – İbn İshaq: Abdullah bin Muğira bin Mueyqib bizə Süleyman bin Amr əl-Utvariyyədən rəvayət etdi (dedi): Leys bizə Əbu Saiddən rəvayət etdi: Allahın Elçisi, *salləllahu aleyhi va səlləm*, dedi: **"...Allah bəndələri arasında hökm verdikdən sonra, möminlər dünyada (onlarla birlikdə) namazlarını qılan, zəkatlarını ödəyən, oruclarını tutan, həcclərini və cihadlarını edən kəslərin yoxluğunu hiss edəcəklər və deyəcəklər: "Ey Rəbbimiz! Sənin qullarından bəzi qulların dünyada bizimlə birlikdə idi, bizim namazımızı qılardılar, zəkatımızdan ödəyərdilər, orucumuzdan tutardılar, həccimizdən edərdilər və ğazvələrimizə gedərdilər və biz onları görmürük." Dedi: " Allah deyəcək: "Gedin cəhənnəmə və kimdə xeyir varsa çıxarın!" Onları tapacaqlar və hər kəs öz əməlləri miqdarında atəşə batmış halda olacaq..."** hədisin davamında deyir: **"Sonra peyğəmbərlər, "lə iləhə illəllah" kəliməsini ixlasla demiş hər kəs üçün şəfaət edəcəklər və onlar ordan çıxarılacaqlar. Daha sonra Allah Öz rəhməti ilə ordakılara şəfqət edəcək və qəlbində zərrə qədər iman olan heç kəsi orada tərk etməyəcək və onları da ordan çıxaracaq..."**[233]

İbn Əbi Şeybənin rəvayətində **"qəlbində toxum ağırlığında iman olan"** ləfzi ilə gəlmişdir. Ət-Təbəri, *rahiməhullah*, bu hədisi Məryəm surəsinin təfsirində rəvayət etmişdir və bunun sənədində xəta vardır. əl-Xatibin rəvayətində isə "**sonra peyğəmbərlər şəfaət edəcəklər"** əvəzinə "**sonra mələklər şəfaət edəcəklər**" şəklindədir.

Bu sənəd həsən hökmündədir. İbn İshaq saduqdur və

[233] İbn Xuzeymə, "**ət-Təvhid**", 2/766 (493); İbn Mubarək, "**əz-Zuhd**", (1268); İbn Əbi Zəməneyn, "**Usul əs-Sunnə**", (103); əl-Hakim, 4/585-586; İbn Əbi Şeybə, 7/81 (34181); "**Təfsir ət-Tabari**", 9/113; əl-Xatib, "**Mudihu Əvham əl-Cəmi va ət-Təfriq**", 2/116-117; əl-Mərvazi, "**Zəvaid əz-Zuhd li İbn Mubarək**", səh: 448-449

eşitmə yolu ilə rəvayət etmişdir. Ubeydullah da saduqdur, lakin əl-Hakimdə "Abdullah" şəklində xəta olaraq keçmişdir. Süleyman isə siqa ravidir və Əbu Saiddən rəvayətləri vardır. Şeyx Muqbil bin Hadi əl-Vadi, *rahiməhullah*, hədisin həsən olduğuna hökm etmişdir.[234]

**F** – İsa bin Musa, Atiyyədən, o da Əbu Said əl-Xudridən rəvayət etmişdir ki, peyğəmbər, *salləllahu aleyhi va səlləm*, dedi: **"Allah atəşdən bir qövm çıxaracaqdır və onlarda üzlərindən başqa heç bir şey qalmayacaq. Onları Cənnətə daxil edəcək."** Bunu Abd bin Humeyd "əl-Muntəxab" əsərində (903) təxric etmişdir. Sənədi zəifdir. Lakin mənası sabitdir. Doğrusunu Allah bilir.

**G** – Amr bin Yəhya əl-Məzəni öz atasından, o da Əbu Saiddən peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, belə dediyini rəvayət edir:

يدخل أهل الجنة الجنة، وأهل النار النار، ثم يقول الله تعالى: أخرجوا من كان في قلبه مثقال حبة من خردل من إيمان، فيخرجون منها، قد اسودوا، -أو امتحشوا-، فيلقون في نهر الحيا أو -الحياة- فينبتون كما تنبت الحبة في جانب السيل، ألم تر أنها تخرج صفراء ملتوية

"**Cənnət əhli Cənnətə daxil olacaq və cəhənnəm əhli isə atəşə daxil olacaq. Sonra Allahu Təalə deyəcək: "Qəlbində xardal dənəsi ağırlığında iman olanı (cəhənnəmdən) çıxarın!" Onları ordan qaralmış halda – və ya yanmış halda – çıxaracaqlar və "həya" – və ya "həyat" – çayına atacaqlar. Selin kənarında bitən toxum kimi bitəcəklər. Məgər (bu toxumdan) qıvrılmış halda ot çıxdığını görməmisinizmi?...**"[235]

---

[234] "**əş-Şəfaə**", səh: 160 (95)

[235] əl-Buxari, (22); Muslim, (184); İbn Xuzeymə, "**ət-Təvhid**", 2/705 (449); İbn Hibban, (182,222); Əhməd, (11533); Əbu Yalə, (1219); İbn Əbi

İbn Xuzeymə, *rahiməhullah*, hədisin müxtəsər olduğunu qeyd edir.[236]

**H** – Xalid bin Daləc, Qatadədən, o da Uqbə bin Abdulğafurdan, o isə Əbu Said əl-Xudridən mərfu olaraq rəvayət edir:

"يخرج من النار، من قال: لا إله إلا الله، وكان في قلبه ما يزن شعيرة...

**"Lə iləhə illə Allah" deyən və qəlbində arpa dənəsi ağırlığında imanı olanı cəhənnəmdən çıxaracaq...."**

Sonra zərrə ağırlığında iman da zikr olunmuşdur. Hədisdə eləcədə gəlir:

وليس الله يترك في النار أحدًا فيه خير، إلا أخرجه منها

**"Xeyr sahibi olan elə bir kəs qalmayacaq ki, Allah onu atəşdən çıxarmasın..."**[237]

Əbu Nueym bu hədisi "əl-Hilyə"sində rəvayət etdikdən sonra deyir:

هذا حديث غريب من حديث قتادة عن عقبة،لم يروه عنه إلا خليد بن دعلج

**"Bu hədis, Qatadənin Uqbədən rəvayət etdiyi ğarib hədisdir, Xalid bin Daləcdən başqa heç kəs bunu ondan rəvayət etməmişdir."**

---

Asim, "**əs-Sunnə**", (842); ət-Tahavi, "**Muşkil əl-Əsər**", (5672); əl-Beyhəqi, "**Şuab əl-İmən**", 1/289; əl-Bəğavi, "**Şərh əs-Sunnə**", 15/190 (4357); Əbu Nueym, "**əl-Hilyə**", 6/350;

236 İbn Xuzeymə, "**ət-Təvhid**", 2/706-707

237 İbn Əbi Asim, (878); Əbu Nueym, "**əl-Hilyə**", 2/262

Xalid bin Daləc isə zəif ravidir və buna görə də hədisin sənədi zəifdir. Lakin Qatadədən rəvayət olunmuş məşhur hədis isə Ənəsin hədisidir və bu barədə məlumat gələcəkdir, inşə Allah!

**X** – İshaq bin Rahaveyh, Əbu Usamədən soruşdu: **" Əbu Rauq sizə belə rəvayət etdimi?: Saleh bin Əbi Tarif mənə dedi: Əbu Saiddən soruşdum: Peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, bu ayə haqqında sözlərini eşitmisənmi?:**
**"Kafirlər mütləq müsəlman olmalarını arzulayacaqlar."**[238]
Əbu Said dedi: "**Bəli!**" və daha sonra rəvayət etdi:

يخرج الله ناسًا من المؤمنين من النار، وبعد ما يأخذ نقمته منهم" وقال: "لما أدخلهم الله النار مع المشركين، قال لهم المشركون: تزعمون أنكم أولياء الله في الدنيا،فما بالكم معنا في النار؟ فإذا سمع الله ذلك منهم؛ أذن في الشفاعة لهم، فيشفع الملائكة والنبيون، ويشفع المؤمنون، حتى يخرجوا بإذن الله، فإذا رأى المشركون ذلك، قالوا: ليتنا كنا مثلهم، فتدركنا الشفاعة، فنخرج معهم، قال: فذلك قول الله عزوجل:
رُبَمَا يَوَدُّ الَّذِينَ كَفَرُوا لَوْ كَانُوا مُسْلِمِينَ
، فيُسمَّوْن في الجنة: الجهنميين، من أجل سواد في وجوههم، فيقولون: يارب؛ أذهب عنا هذا الاسم، فيأمرهم، فيغتسلون في نهر الجنة، فيذهب ذلك الاسم عنهم

**"Allah möminlərdən qəzəbini çıxdıqdan sonra (cəzadan sonra) onları atəşdən çıxaracaq" Dedi: "Allah onları müşriklər ilə birlikdə atəşə saldıqda müşriklər onlara dedilər: "Siz dünyada Allahın dostları olduğunuzu iddia edirdiniz! Sizə nə olur ki, bizimlə birlikdə cəhənnəmdəsiz?!" Allah bunu onlardan eşitdikdə, onlara şəfaət edilməsinə izn verəcək və mələklər, peyğəmbərlər şəfaət edəcəklər, möminlər şəfaət edəcəklər. Onlar Allahın izni ilə atəşdən çıxarıldıqda**

---

[238] əl-Hicr, 2

müşriklər **bunu görəcəklər və deyəcəklər**: “Kaş ki, biz də **onlar kimi olsaydıq və şəfaət bizlərə də çatsaydı da, biz də onlarla birlikdə çıxardıq!” Dedi: “Bu Allahın – Azzə və Cəllə - sözünün mənasıdır:**

**“Kafirlər mütləq müsəlman olmalarını arzulayacaqlar.”**

**“Onlara Cənnətdə üzlərindəki qaralıq səbəbi ilə “cəhənnəmiyyun” deyiləcək və onlar deyəcəklər: “Ya Rəbb! Bu adı bizim üzərimizdən götür!” Onlar Cənnət çayında yuyunacaqlar və bu ad onlardan götürüləcək.”**[239]

Əbu Usamə bu rəvayəti təsdiqləyir. İbn Hibban da bunu İshaq yolu ilə rəvayət etmişdir.

Əbu Rauqun əsl adı Atiyyə ibn əl-Harisdir və o, saduqdur. Lakin Saleh ibn Əbi Tarifə gəldikdə isə İbn Hibbandan başqa onu siqa sayan birini tanımıram.

**İ** – Əl-Cureyri, Əbu Nədradan, o da Əbu Saiddən: Peyğəmbər, *salləllahu aleyhi va səlləm*, dedi:

أما أهل النار، الذين هم أهل النار: لا يموتون فيها ولا يَحْيَوْن، وأما الذين يريد الله إخراجهم منها؛ فتميتهم النار إماتة، حتى يكونوا فحمًا، ثم يخرجون ضبائر، فيُلْقَوْن على أنهار الجنة، ويرش عليهم من مائها، فينبتون كما تنبت الحبة في حميل السيل، فيدخلون الجنة، فسيميهم أهل الجنة: الجهنميين، فيدعون الله، فيذهب ذلك الاسم عنهم

**“Atəş əhlinə gəldikdə, o kəslər ki, atəş əhlidir: orda nə ölməzlər, nə də** yaşamazlar! Lakin Allahın ordan **çıxarmaq istədiyi kəslərə gəldikdə isə, atəş** onları qap-qara olmuş **meyyid halına salacaq və sonra ordan topa-topa insanlar çıxacaq. Onları Cənnət çaylarına atacaqlar və onun suyundan üzərilərinə tökəcəklər. Selin gətirdiyi yabanı reyhanın bitdiyi kimi bitəcəklər və Cənnətə daxil olacaqlar. Cənnət əhli onlara**

---

[239] Tabərani, ”**əl-Əvsat**”, (8110); əl-Əsbəhani, ”**əl-Huccə**”, 2/472 (492)”

**“cəhənnəmiyyun” deyəcək. Onlar isə Allaha dua etdikdən sonra bu ad onların üzərindən götürüləcək.”**[240]

İbn Xuzeymə “ət-Təvhid” kitabında (436) bunu Saleh bin Nuh tariqi ilə əl-Cureyridən təxric etmişdir və sonrakı rəvayətdə isə (437) Abdullah əs-Saqafi, əl-Cureyridən, o da Əbu Nadradan rəvayət etmişdir. Bunların hər ikisi də əl-Cureyridən hafizəsi korlanmamışdan əvvəl rəvayət etmişdir. Yezid bin Harun isə onlara müxalif olaraq müxtəsər şəkildə rəvayət etmişdir və bunu İmam Əhməd təxric edib. Yezidin rəvayətində “cəhənnəmiyyun” ləfzi zikr olunmur. Yezid isə, əl-Cureyridən ixtilatından sonra rəvayət etmişdir. Lakin bununla belə əl-Cureyrinin özünə bunda birdən çox ravi müxalif olaraq Əbu Nədradan rəvayətdə bu ziyadəni zikr etməmişdir.[241]

**J** – Allahu Təalənin “**Ola bilsin ki, buna görə Rəbbin səni tərifəlayiq bir məqama yüksəltsin.**“[242] sözləri barədə Əbu Nueymin mərfu olaraq Əbu Saiddən rəvayət etdiyi hədis.[243] Yuxarıdakı hədislərə bənzər ləfzdə rəvayət olunmuşdur. Lakin sənədindəki Musab bin Xaricə, Əbu Hatimin dediyi kimi məchuldur. Lakin onun atası isə mətrukdur. Bu sənəd səhih deyildir.

## 2. Əbu Hureyrənin, *radiyallahu anhu*, hədisi:

---

240 İbn Xuzeymə, ”**ət-Təvhid**”, 2/689 (436); Əhməd, 3/20;

241 Bax: İbn Xuzeymə, (420, 421, 433, 434, 435); Muslim, (185); İbn Macə, (4309); İbn Hibban, (7379, 7485); Abd bin Humeyd, “**əl-Muntəxab**”, (865-868); əl-Acurri, “**əş-Şəriah**”, səh: 308; Abdullah ibn Mubarək, “**əz-Zuhd**”, (1269); əl-Beyhəqi, “**əl-İtiqad**”, səh: 254; əl-Laləkay, (2056)

242 əl-İsra, 79

243 “**əl-Hilyə**”, 7/254

**A** – Zuhri dedi: Said bin əl-Museyyib və Ata bin Yezid əl-Leysi mənə xəbər verdi ki, Əbu Hureyrə onlara dedi: **"İnsanlar dedilər: "Ey Allahın Elçisi! Qiyamət günü Rəbbimizi görəcəyikmi?"...**daha sonra hədisi zikr edir:

حتى إذا أراد الله رحمة من أراد من أهل النار؛ أمر الملائكة أن يُخرجوا من كان يعبد الله، فيخرجونهم، ويعرفونهم بآثار السجود، وحّرم الله على النار، أن تأكل أثر السجود، فيخرجون من النار، فكل ابن آدم تأكله النار إلا أثر السجود، فيخرجون من النار قد امتحشوا، فيُصَبُّ عليهم ماء الحياة، فينبتون كما تنبت الحبة في حميل السيل، ثم يفرغ الله من القضاء بين العباد، ويبقى رجل بين الجنة والنار، وهو آخر أهل النار دخولاً الجنة

**"Sonra Allah cəhənnəm əhlindən istədiyini rəhməti ilə atəşdən çıxaracaq. Allaha ibadət etmiş kəsləri çıxarmağı mələklərə əmr edəcək. Onları çıxaracaqlar və onları səcdə izlərindən tanıyacaqlar, çünki Allah atəşə səcdə izlərini yandırmağı haram etmişdir. Atəşdən çıxacaqlar və atəş səcdə izlərindən başqa adəm oğlunun bütün bədənini yandıracaq. Atəşdən tam yanmış halda çıxacaqlar və üzərilərinə "həyat" suyu tökəcəklər. Selin gətirdiyi yabanı rehyan toxumunun bitdiyi kimi bitəcəklər. Allah qulları arasında hökmünü bitirdikdən sonra, Cənnət ilə Cəhənnəm arasında yalnız bir nəfər qalacaq və o, cəhhənnəm əhlindən Cənnətə daxil olan sonuncu kəs olacaqdır..."**[244]

Hədis davam edir...Buxari təxric etmişdir və digər bir rəvayətində isə deyilir:

---

[244] əl-Buxari, (806, 6573); Muslim, (807); İbn Xuzeymə, "**ət-Təvhid**", (429); əd-Daraqutni, "**ər-Ruya**", (40, 42, 43, 44, 45); əl-Acurri, "**ət-Təsdiq bin-Nəzar ilə Allahi Təalə fil-Axirati**", (29); İbn Məndə, "**əl-İmən**", 2/789 (802); əl-Beyhəqi, "**əl-Əsma vas-Sifət**", 2/66 (641) və "**əl-Bas van-Nuşur**", (102);

حتى إذا فرغ الله من القضاء بين عباده، وأراد أن يخرج من النار، من أراد أن يخرج، ممن كان يشهد أن لا إله إلا الله، فيخرجونهم قد امتحشوا

“**Allah qulları arasında hökm verib qurtardıqdan sonra, atəşdən çıxmağı istəyən, “lə iləhə illəllah” deyərək şəhadət etmiş hər kəsi atəşdən çıxarmaq istəyəcək. Onları tam yanmış halda çıxaracaq...”**

əd-Daraqutni bunu müxtəsər şəkildə təxric etmişdir.

**B** - əz-Zuhri, Ata bin Yezid əl-Leysidən, o da Əbu Hureyrədən rəvayət edir və daha sonra peyğəmrəbə, salləllahu aleyhi va səlləm, verilmiş sualı zikr etdikdən sonra hədisi tam rəvayət edir. Bu hədisin mətnində deyilir:

حتى إذا فرغ الله من القضاء بين العباد، وأراد الله أن يخرج برحمته من أراد من أهل النار؛ أمر الملائكة أن يخرجوا من النار، من كان لا يشرك بالله شيئًا، ممن أراد الله أن يرحمه، ممن يشهد أن لا إله إلا الله، فيعرفونهم في النار بأثر السجود، تأكل النار ابن آدم إلا أثر السجود، فيخرجون من النار قد امتحشوا

**“Sonra Allah qulları arasında hökm verməyi qurtaracaq. Bundan sonra cəhənnəm əhlindən dilədiyi kəsləri rəhməti ilə çıxarmaq istəyəcək. Mələklərə, Allaha şərik qoşmamış və Allahın rəhm etmək istədiyi, “lə iləhə illə Allah” deyərək şəhadət edən hər kəsi çıxarmağı əmr edəcək. Onları səcdə izlərindən tanıyacaqlar, çünki atəş səcdə izindən başqa Adəm övladının bütün bədənini yandırar və onları tam yanmış halda çıxaracaqlar...”** və sonra Cənnətə daxil olacaq cəhənnəm əhlindən sonuncu olan bir kişinin hekayəsini zikr edir.[245]

---

[245] əl-Buxari, (7437, 7438); Muslim, (182); Abu Avanə, 1/159-160; ən-Nəsai, “**əl-Muctəbə**”, (1140) və “**əl-Kubra**”, (1148); Abdurrazzaq, 11/407-409 (20856); ət-Tayalisi, (2383); İbn Mubarək, “**əz-Zuhd**”, (284, 285); Əhməd, (7717, 7927, 10906); “**Təfsir ət-Tabəri**”, 13/155; əd-Dərimi,

İmam İbn Cərir ət-Tabəri, *rahiməhullah*, bunu əl-Casiyə surəsinin təfsirində zikr etmişdir. Bu hədisdə bir ziyadə vardır. Ata ibn Yezid zikr edir ki, Əbu Hureyrə bu hədisi zikr edərkən Əbu Said onun yanında idi. Əbu Hureyrə hədisi rəvayət edərkən Əbu Said heç bir sözünə etiraz etmədi, yalnız **“(Cənnətdə) Gördükləriniz və bir o qədər də sizindir..”** sözünü zikr edərkən Əbu Said “**on dəfə çox**” dedi. Əbu Hureyrə isə peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, bunu xatırlamadığını dedi.

**C** – İsmail bin Muhamməd bin Yezid, Muhamməd bin Kabdən, o da Əbu Hureyrədən mərfu olaraq uzun bir hədis rəvayət edir. Bunu Əbu əş-Şeyx “əl-Azmə” əsərində rəvayət edir.[246] Bu sənəd heç cür dəlil ola bilməz. Sənədində xəta vardır: İsmail bin Muhamməd bin Yezid, bu şəkildə doğru deyildir. Doğru olan isə budur ki, İsmail bin Rafi, Muhamməd bin Yeziddən rəvayət edir. Beləki, “əl-Azmə” əsərinin başqa nəşrində (3/228) (386) rəqəmi ilə keçən hədisin sənədində bu şəkildə zikr olunur. Eləcədə əl-Mərvazinin “əs-Salət” əsərində də bu şəkildə keçir.[247] Bununla belə sənədi zəifdir. Çünki Muhamməd bin Yezid məchuldur.[248]

Yenə eyni hədisi Muhamməd bin Əbi Ziyad, Muhamməd bin Kab əl-Qarzidən, o da ənsardan birindən, o isə Əbu Hureyrədən rəvayət edir.[249] Bu sənəd də zəifdir. Çünki İbn Əbi

---

“**ər-Radd alə əl-Cəhmiyyə**”, (138, 177, 178); İbn Nəhhas, “**Ruyətallah**”, (6); əl-Mərvazi, (275); İbn Məndə, “**əl-İmən**”, 2/784 (803, 804, 805); əd-Dəraqutni, “**ər-Ruya**”, (32, 33, 34); əl-Acurri, “**ət-Təsdiq bin-Nəzar**”, (28); əl-Beyhaqi, “**əl-Bas van-Nuşur**”, səh: 76-77 (102); əl-Bəğavi, “**Şərh əs-Sunnə**”, 15/173 (4346)

246 “**əl-Azmə**”, səh: 136-143 (388)

247 “**Tazim Qadr əs-Salət**”, (273)

248 ”**əl-Cərh vat-Tadil**”, 8/126

249 “**Tazim Qadr əs-Salət**”, (273); “**əl-Azmə**”, (389)

Ziyadın halı məchuldur (məchul əl-həl). Ənsardan olan ravinin isə səhabə, yoxsa tabiin olduğu bilinmir.

**Ç** – Yenə İbn Əbi Zəmaneyn "Usul əs-Sunnə" əsərində[250] fərqli bir tariq ilə rəvayət etmişdir. Bunun mətnində də Allahın öz rəhməti ilə çıxardığı kəslərin Cəhənnəmdən çıxan sonuncu kəslər olduğu bildirilir. Sənədində Əbu Umeyyə İsmail bin Yalə əs-Səqafi vardır və o, mətrukdur.[251]

**D** – İmam Əhmədin (9201) rəvayətində də heç bir xeyir əməl etməyənləri atəşdən çıxaracağına dair dəlil vardır. Bunu Abdurrahmən bin Əbi əz-Zinəd, Saleh ibn Nəbhəndən rəvayət edir və hər iki ravi məqbul deyildir.

### 3. **Ənəsin, *radiyallahu anhu*, hədisi:**

**A** – Həməd bin Zeyd dedi: Mabəd bin Hilal əl-Anzi bizə Ənəsdən mərfu olaraq rəvayət etdi: ...və sonra şəfaət üçün peyğəmbərlərə müraciət edildiyini zikr edir və daha sonra peyğəmbərimizin, *salləllahu aleyhi va səlləm*, yanına gəlirlər:

"فأقول أنا لها، فأستأذن على ربي، فيؤذن لي، ويلهمني محامد أحمده بها، لا يحضرني الآن، فأحمده بتلك المحامد، وأخر له ساجدًا، فيقال: يا محمد، ارفع، وقل يُسمع لك، وسل تعط، واشفع تشفّع، فأقول: يارب، أمتي أمتي، فيقول: فأخرج منها من كان في قلبه مثقال شعيرة من إيمان، فأنطلق، فأفعل، ثم أعود، فأحمده بتلك المحامد، ثم أخر له ساجدًا، فيقال: يا محمد، ارفع رأسك، وقل يُسمع لك، وسل تُعط، واشفع تشفّع، فأقول يا رب، أمتي، فيقول: انطلق،

[250] "**Usul əs-Sunnə**", (101)
[251] Bax: "**əl-Lisən**", 1/687-688

فأخرج منها من كان في قلبه مثقال ذرة أو خردلة من إيمان، فأنطلق، فأفعل، ثم أعود، فأحمده بتلك المحامد، ثم أخر له ساجدًا، فيقال: يا محمد، ارفع رأسك، وقل يُسمع لك، وسل تُعط، واشفع تشفّع، فأقول: يا رب، أمتي أمتي، فيقول: انطلق، فأخْرج من كان في قلبه أدنى أدنى مثقال حبة خردل من إيمان، فأخرجه من النار، من النار، من النار، فأنطلق فأفعل"
فلما خرجنا من عند أنس بن مالك، قلت لبعض أصحابنا: لو مررنا بالحسن، وهو متوارٍ في منـزل أبي خليفة، فحدَّثنا بما حدثنا أنس بن مالك، فأتيناه، فسلَّمْنا عليه، فأذن لنا، فقلنا له: يا أبا سعيد، جئناك من عند أخيك أنس بن مالك، فلم نر مثل ما حدثنا في الشفاعة، فقال: هيه، فحدَّثناه بالحديث، فانتهى إلى هذا الموضع، فقال: هيه، فقلنا: لم يزد لنا على هذا، فقال: لقد حدثني وهو جميع منذ عشرين سنة، فلا أدري أنسي، أم كره أن تتكلوا، فقلنا: يا أبا سعيد، فحدِّثناه، فضحك، وقال: خُلِقَ الإنسان عجولا، ما ذكرته إلا وأنا أريد أحدثكم، حدثني كما حدثكم به، قال: "ثم أعود الرابعة، فأحمده بتلك المحامد، ثم أخر له ساجدًا، فيقال: يا محمد، ارفع رأسك، وقل يُسمع، وسل تعط، واشفع تُشفَّع، فأقول: يا رب، ائذن لي فيمن قال: لا إله إلا الله، فيقول: وعزتي، وجلالي، وكبريائي، وعظمتي؛ لأخرجن منها من قال: لا إله إلا الله".

**"Mən deyəcəm: "Mən bunun üçünəm." Sonra Rəbbimdən izn istəyəcəm və mənə izn verəcək. İndi xatırlaya bilmədiyim mədh edici sözlərlə mənə ilham verəcək ki, Ona həm edim və Ona həmd edəcəm. Səcdəyə qapanmış şəkildə qalacam. Allah deyəcək: "Ey Muhamməd! Qalx və de! Sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq!" Mən deyəcəm: "Ya Rəbb! Ümmətim, ümmətim!" Allah deyəcək: "Qəlbində arpa dənəsi ağırlığında iman olan hər kəsi ordan çıxar! Mən gedib bunu yerinə yetirəcəm. Sonra yenə geri dönəcəm. Eyni mədhiyyələrlə Allaha həm edəcəm. Səcdəyə qapanmış şəkildə qalacam. Allah deyəcək: "Ey Muhamməd! Qalx və de! Sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq!" Mən deyəcəm: "Ya Rəbb! Ümmətim!" Allah deyəcək: "Get və qəlbində zərrə ağırlığında və xardal dənəsi ağırlığında iman olan hər kəsi çıxar!" Mən gedib bunu yerinə yetirəcəm. Sonra**

yenə geri dönəcəm. Eyni mədhiyyələrlə Allaha həm edəcəm. Səcdəyə qapanmış şəkildə qalacam. Allah deyəcək: "Ey Muhamməd! Qalx və de! Sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq!" Mən deyəcəm: "Ya Rəbb! Ümmətim, ümmətim!" Allah deyəcək: "Get və qəlbində xardal dənəsi ağırlığından da az iman olanları ordan çıxar! Onları atəşdən çıxar!" Mən də gedərək bunu yerinə yetirəcəm.

Biz Ənəs bin Malikin yanından çıxdıqda öz yoldaşlarımdan bəzilərinə dedim: "Gedək Əbu Xəlifənin evində gizlənən əl-Həsənin yanına və Ənəs bin Malikin bizə danışdığını bizə danışsın!" Onun yanına getdik və ona salam verdik. Exə daxil olmaq için izn verdi. Ona dedik: "Ey Əbu Said! Sənə biz qardaşın Ənəs bin Malikin yanından gəlirik. Bizə şəfaət barədə elə bir hədis danışıb ki, onu heç eşitməmişik." Dedi: "Nədir o?" Biz ona həmin hədisi danışdıq və "o, hədisi bu yerdə bitirdi." Dedi: "Sonra nə?" Dedik: "Bunun üzərinə heç bir şey əlavə etmədi!" Dedi: "(Ənəs) mənə bu hədisi iyirmi il bundan əvvəl rəvayət etmişdi. Bilmirəm, hədisi unutmuşdur yoxsa sizin danışdığından asılı qalmasından xoşlanmamışdır." Dedik: "Ey Əbu Said! Onu bizə danış!" Güldü və dedi: "İnsan tələskənlikdən yaradıldı. Bunu danışmazdım, yalnız onu sizə rəvayət etmək istəyirəm. Mənə də sizə rəvayət etdiyi kimi rəvayət etdi. Dedi:

"Sonra dördüncü dəfə qayıdacam. Eyni mədhiyyələrlə Allaha həm edəcəm. Səcdəyə qapanmış şəkildə qalacam. Allah deyəcək: "Ey Muhamməd! Qalx və de! Sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq!" Mən deyəcəm: "Ya Rəbb! "Lə iləhə illə Allah" deyən kəslər barəsində mənə izn ver!" Allah deyəcək: "İzzətimə, Cəlalıma, Böyüklüyümə və Əzəmətimə and olsun ki, "lə iləhə illə Allah" deyən hər kəsi ordan çıxaracam."[252]

---

[252] əl-Buxari, (7510); Muslim, (193); Əbu Nueym, "**əl-Mustəxrac**", (482); Əbu Avanə, 1/183; ən-Nəsai, "**əl-Kubra**", (11131); əl-Mərvazi,

Bunu əl-Buxari bu ləfz ilə rəvayət etmişdir və Muslimdə isə cüzi ləfz fərqi mövcuddur.

**B** – əl-Leysi dedi: Yezid bin Abdullah bin əl-Həd mənə Amr bin Əbi Amrdan, o da Ənəsdən mərfu olaraq rəvayət etdi:

إني لأول الناس تنشق الأرض عن جمجمتي...

**"İnsanlar içində torpağı yarıb qəbrimdən çıxan ilk kəs mən olacam..."**

Və daha sonra deyir:

"فأقول: أمتي أمتي، فيقول: اذهب إلى أمتك، فمن وجدت في قلبه مثقال حبة من شعير من الإيمان؛ فأدخله الجنة..."

**"Deyəcəm: "Ümmətim, ümmətim!" Allah deyəcək: "Ümmətinin yanına get və kimin qəlbində arpa dənəsi ağırlığında iman görsən, onu Cənnətə daxil edəcəm..."**

وفرغ من حساب الناس، وأدخل من بقي من أمتي في النار مع أهل النار، فيقول أهل النار: ما أغنى عنكم أنكم كنتم تعبدون الله، ولا تشركون به شيئًا.... فيعتقهم الله، وقد امتحشوا، فيدخلون في نهر الحياة...."

**"İnsanların hesablarını bitirdikdən sonra, ümmətimin atəşdə cəhənnəm əhli ilə birlikdə qalmış qalan hissəsini də (Cənnətə) daxil edər. Cəhənnəm əhli deyəcək: "Sizin Allaha ibadət etməyiniz və ona heç bir şeyi şərik qoşmamağınız sizləri qurtarmadı....Allah onları azad edəcək, lakin onlar tam yanmış halda olacaqlar və onları "Həyat" çaylarına daxil**

---

"**əs-Salət**", (274); Əbu Yalə, (4350, 4351); İbn Məndə, "**əl-İmən**", 2/841 (873); əl-Beyhəqi, 10/42; əl-Bəğavi, "**Şərh əs-Sunnə**", 15/157 (4333); əl-Mizzi, "**Təhzib əl-Kəməl**", 28/241

**edəcək.”**

Hədisdə eləcədə deyilir:

أنهم يقال لهم: الجهنميون، فيقول الله: بل هؤلاء عتقاء الجبار

**“Onlara “cəhənnəmiyyun” deyiləcək və Allah buyuracaq: “Xeyr, bunlar əl-Cabbarın azadlılarıdır.”**[253]

əl-Beyhəqi bunu müxtəsər olaraq təxric etmişdir. Bu sənəddəki ravilər siqadır. Şeyx əl-Albani, *rahiməhullah*, deyir:

أخرجه أحمد وغيره بسند صحيح وهو مخرج في ( الظلال ) تحت الحديث ( 844 ) وله فيه شواهد (842 - 843 ) وفي ( الفتح ) ( 11 / 455 ) شواهد أخرى

**“Bunu Əhməd və başqaları səhih sənədlə təxric ediblər. Eləcədə “əz-Ziləl”də 844-cü hədis altında təxric olunmuşdur. Bunun üçün orda şahidlər (842-843) vardır və “əl-Fəth”də (11/455) isə digər şahidləri vardır.”**[254]

İbn Məndə isə “əl-İmən” əsərində hədisi təxric etdikdən sonra deyir:

هذا حديث صحيح مشهور عن ابن الهاد

**“Bu, İbn əl-Həddən rəvayət olunmuş məşhur səhih hədisdir.”**[255]

---

[253] əd-Darimi, 1/27-28; İbn Xuzeymə, 2/710-713 (454,455); əd-Diya, “**əl-Muxtəra**”, 6/323-324 (2345); Əhməd, (12469); əl-Mərvazi, “**əs-Salət**”, (268); İbn Məndə, “**əl-İmən**”, 2/846 (877); əl-Beyhəqi, “**əd-Dələil**”, 5/479;

[254] “**Hukmu Tərik əs-Saləh**”, səh: 32

[255] ”**əl-İmən**”, 2/847

Bundan başqa eyni ləfzli hədis bir başqa sənəd ilə rəvayət olunmuşdur. Bunu əl-Mərvazi, *rahiməhullah*, kitabında təxric edir[256]: Muhammməd bin Yəhya bizə rəvayət etdi: İbn Əbi Uveys bizə rəvayət etdi: Qardaşım mənə Suleyman bin Bilaldan, o da Suheyl bin Əbi Salehdən, o da Ziyad bin ən-Numeyridən, o da Ənəsdən mərfu olaraq rəvayət etmişdir.

Ziyadın adı İbn Abdullah ən-Numeyridir və o, zəifdir. İbn Əbi Uveysin adı isə İsmayıldır və onun haqqında xəfif sözlər söylənimişdir. Onun qardaşının adı isə Abu Bəkr Abdulhəmiddir və o, siqa ravidir. Lakin bu sənəd şahidləri ilə güclənir. Hədisdə müşriklərin cəhənnəmdəki tövhid əhlinə tənə etməkləri haqqındakı ziyadə üçün də yuxarıda keçən Amr bin Əbi Amrın rəvayətinə şahidlik edir.

Başqa rəvayətdə isə Əbu Cənəb, Suheylə müxalif olaraq hədisi ən-Numeyridən çox qısa şəkildə rəvayət etmişdir və hədisi yalnız əvvəlini rəvayət edərək ixtisar etmişdir. Bunu Əbu Yalə rəvayət etmişdir.[257] Lakin Əbu Cənab heç cür dəlil sayıla biləcək bir ravi deyildir.

Lakin Ənəsin hədisində keçən peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, səcdə etməsi və şəfaət etməsi barədə digər səhabələr də rəvayət etmişdir. Lakin onlar müşriklərin atəşdəki tövhid əhlinə tənə etmələrini zikr etmirlər. O zaman hədisdəki bu ziyadə "şaz" qəbul edilməlidirmi?! Lakin bunu Amr bin Əbi Amr rəvayət etmişdir və o, siqadır. Bəs o zaman onun xəta etmə ehtimalı mümkündürmü?! Bəs zəif ravi olan ən-Numeyrinin də bu ziyadəni rəvayət etməsinə etibar etmək olarmı?!

Xüsusilə də əd-Diya "əl-Muxtarə" əsərində bu hədisi təxric etdikdən sonra belə deyir:

قد رُوِىَ حديث الشفاعة في "الصحيح" من حديث أنس، غير أن في هذا ألفاظًا ليست فيه، والله أعلم

[256] "**əs-Salət**", (269)
[257] Əbu Yalə, 7/281 (4305)

**”Şəfaət haqqındakı hədis ”əs-Səhih”də Ənəsin hədisindən rəvayət olunmuşdur, lakin bu ləfzlər orada yoxdur. Doğrusunu Allah bilir!”**

Bu sözlərlə də hədisdəki ziyadədə diqqətli olmağa işarə edilir.

Lakin eləcədə deyilə bilər ki, Ənəsdən gələn şəfaət hədisi həm uzun, həm də müxtəsər şəkildə rəvayət olunmuşdur və müxtəsər rəvayət olunan hədis siqa ravi tərəfindən daha uzun şəkildə rəvayət olunan hədisə zərər yetirməz. İbn Xuzeymə də bunu bir çox yerdə bu şəkildə ələ almışdır. Bundan əlavə Amr bin Əbi Amrın şahidi vardır. Əgər zəif bir ravi digər zəif ravinin rəvayəti üçün şahid olaraq qəbul olunursa, o zaman zəif olan ən-Numeyrinin siqa olan Amr bin Əbi Amr üçün şahid olması daha doğrudur. Xüsusilə də İbn Məndə və İbn Xuzeymə hədisi səhih saymışdır.

**C** – Kəsir bin Həbib əl-Leysi Əbi Said dedi: Sabit əl-Bənəni bizə Ənəsdən rəvayət etdi: Peyğəmbər, *salləllah aleyhi va səlləm*, dedi:

"إن لكل نبي يوم القيامة منبرًا من نور...."
"سجود النبي، صلى الله عليه وسلم لربه، وحمده بمحامد لم يحمد الله بها .. أحد قبله ولا بعده، ويشفع فيمن كان في قلبه مثقال شعيرة، ومثقال بُرَّة، ومثقال خردلة، ثم يرجع، فيخر ساجدًا، فيقال له: يا محمد، ارفع رأسك، تكلم يُسمع، واشفع تشقّع، وسل تعطه، فيقول: يارب، من قال: لا إله إلا الله، فيقال له: يا محمد، لست هناك، تلك لي، وأنا اليوم أجزي بها".

**“Qiyamət günü hər bir peyğəmbər üçün nurdan minbərlər olacaq...”**

**“Peyğəmbər, *salləllahu aleyhi va səlləm*, Rəbbinə səcdə edəcək və heç kəsin ondan əvvəl və sonra etmədiyi mədhiyyələr ilə həmd edəcək. Sonra qəlbində arpa dənəsi**

**ağırlığında, bir buğda dənəciyi ağırlığında və ya bir xardal ağırlığında iman olan hər kəsə şəafət edəcək, sonra geri dönəcək və səcdəyə qapanacaq. Ona deyiləcək: "Ey Muhamməd! Başını qaldır! Danış və sənin sözün eşidiləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq! İstə, sənə veriləcək!" (Peyğəmbər) deyəcək: "Ya Rəbb! "Lə iləhə illə Allah" deyənlər.." Ona deyiləcək: "Ey Muhamməd! Bu sənə aid deyildir. Bu, Mənə aiddir və mən bu gün bununla mükafatlandıracam."**[258]

Bu hədisin sənədi həsəndir. Kəsirdə heç bir eyib yoxdur. Bunu Əbu Hatim deyir və ondan bir qrup alim hədis rəvayət etmişdir.[259]

**Ç** – Muhamməd bin Kəsir əs-Səqafi dedi: Bizə Həməd bin Səlimə rəvayət etdi: Sabit bizə Ənəsdən mərfu olaraq rəvayət etdi. Hədisin ləfzi yuxarıda keçən hədislərin ləfzlərinə bənzərdir. Bunu İbn Xuzeymə "ət-Təvhid" əsərində 368 rəqəmi ilə təxric etmişdir, lakin sənədi əs-Səqafiyə görə zəifdir. Lakin Əhmədin rəvayətində isə[260] əl-Həsən bin Musa əl-Əşib ona tabe olmuşdur. Eləcədə əl-Mərvazinin "əs-Salət" kitabında Amr bin Asimin rəvayəti ilə şahidi vardır. Lakin bir çox yerdə şahidləri olduğu üçün hədis səhihdir. Doğrusunu Allah bilir.

**D** – Hərb bin Məymun Əbi əl-Xattab əl-Ənsari, Nadr bin Ənəsdən, o da Ənəsdən rəvayət etmişdir və Ənəs, *radiyallahu anhu,* peyğəmbərin, *salləllahu aleyhi va sələm,* ona danışdıqlarını nəql edir. Bu hədisdə Qiyamət günü bütün peyğəmbərlərin Muhammədin, *salləllahu aleyhi va sələm,* qarşısında toplanacağı və İsanın, *əleyhi əs-sələm*, ona müraciəti vəsf olunmuşdur. Daha sonra peyğəmbərimiz Allahdan ümməti üçün şəfaət diləyər.

---

[258] İbn Hibban, (6480)

[259] "**əl-Cərh va ət-Tadil**", 7/150

[260] Əhməd, 1/296

Hədisdə Allah Tabərakə va Təalə peyğəmbərinə deyir:

يا محمد، أدخل من أمتك من خلق الله، من شهد أنه لا إله إلا الله يومًا واحدًا مخلصًا، ومات على ذلك

**“Ey Muhamməd! Ümmətindən bir gün olsa belə ixlas ilə “lə iləhə illəllah” deyərək şəhadət etmiş və bu halı üzərində ölmüş hər bir Allah məxluqunu (Cənnətə) daxil edəcəm.”**[261]

Bu hədisin sənədi həsəndir. Hərb saduq bir ravidir. Şeyx Abu Abdurrahmən Muqbil bin Hadi əl-Vadi, rahiməhullah, hədisin həsən olduğuna hökm etmişdir.[262] Doğrusunu Allah bilir!

**E** – Qatadənin Ənəsdən rəvayəti: Allahın Elçisi, salləllahu aleyhi va səlləm, dedi:

يخرج من النار، من قال: لا إله إلا الله، وفي قلبه وزن شعيرة من خير، ويخرج من النار، من قال: لا إله إلا الله، وفي قلبه وزن برة من خير، ويخرج من النار، من قال: لا إله إلا الله، وفي قلبه وزن ذرة من خير

**“Lə iləhə illə Allah” deyən və qəlbində arpa dənəsi ağırlığında iman olan hər kəs atəşdən çıxarılacaq. “Lə iləhə illə Allah” deyən və qəlbində buğda dənəciyi ağırlığında iman olan hər kəs atəşdən çıxarılacaq. “Lə iləhə illə Allah” deyən və qəlbində zərrə ağırlığında ima olan hər kəs atəşdən çıxarılacaq.”**[263]

Bunu İmam əl-Buxari “İman” kitabında rəvayət etmişdir

[261] Əhməd, (12824); İbn Xuzeymə, “**ət-Təvhid**”, (359)
[262] “**əş-Şəfaəh**”, səh: 115, (68)
[263] əl-Buxari, Kitəb əl-İmən, (44);

və bundan da uzun şəklini “Tövhid” kitabında rəvayət edir. Hədisdə möminlər peyğəmbərlərə şəfaət üçün müraciət edəcəkləri vəsf olunur və hər bir peyğəmbər bu işi özündən sonrakı peyğəmbərə ötürəcək və sonunda bütün peyğəmbərlər, *aleyhim əs-sələm,* peyğəmbərimiz Muhammədin, *salləllahu aleyhi va səlləm*, yanına gələcəklər:

فيأتونني، فأنطلق، فأستأذن على ربي، فيؤذن لي عليه، فإذا رأيت ربي؛ وقعت له ساجدًا، فيدعني ما شاء الله أن يدعني، ثم يقال لي: ارفع محمد، قل يُسمع، وسل تعطه، واشفع تشفَّع، فأحمد ربي بمحامد علمنيها، ثم أشفع، فيحد لي حدًا، فأدخلهم الجنة، ثم أرجع، فإذا رأيت ربي؛ وقعت ساجدًا، فيدعني ما شاء الله أن يدعني، ثم يقال: ارفع محمد، وقل يسمع، وسل تعطه، واشفع تشفَّع، فأحمد ربي بمحامد علمنيها، ثم أشفع، فيحد لي حداً، فأدخلهم الجنة، ثم أرجع، فإذا رأيت ربي، وقعت ساجدًا، فيدعني، ثم يقال: ارفع محمد، وقل يسمع، وسل تعطه، واشفع تشفّع، فأحمد ربي بمحامد علمنيها، ثم أشفع، فيحدلي حدًا، فأدخلهم الجنة، ثم أرجع، فأقول: يارب، ما بقي في النار إلا من حبسه القرآن، ووجب عليه الخلود،

**“Onlar mənim yanıma gələcəklər və mən gedib Rəbbimdən izn istəyəcəm. Mənə Onun qarşısında izn veriləcək. Mən Rəbbimi gördükdə səcdəyə qapanacam və istədiyi qədər məni həmin halda (səcdədə) saxlayacaq və sonra mənə deyiləcək: “Qalx Muhamməd! Danış və sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq! Sonra mən Rəbbimi mənə öyrətdiyi həmdü-sənalar ilə həmd edəcəm. Sonra şəfaət edəcəm. Mənim (şəfaət edərək) Cənnətə daxil edəcəklərimə hədd qoyacaq. Sonra geri dönəcəm. Rəbbimi gördükdə səcdəyə qapanacam və istədiyi qədər məni həmin halda (səcdədə) saxlayacaq və sonra mənə deyiləcək: “Qalx Muhamməd! Danış və sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq! Sonra mən Rəbbimi mənə öyrətdiyi həmdü-sənalar ilə həmd edəcəm. Sonra şəfaət edəcəm. Mənim (şəfaət edərək) Cənnətə daxil edəcəklərimə hədd qoyacaq. Sonra geri dönəcəm.**

**Rəbbimi gördükdə səcdəyə qapanacam və istədiyi qədər məni həmin halda (səcdədə) saxlayacaq və sonra mənə deyiləcək: “Qalx Muhamməd! Danış və sözün eşidiləcək! İstə və istədiyin veriləcək! Şəfaət et və şəfaətin qəbul olunacaq! Sonra mən Rəbbimi mənə öyrətdiyi həmdü-sənalar ilə həmd edəcəm. Sonra şəfaət edəcəm. Mənim (şəfaət edərək) Cənnətə daxil edəcəklərimə hədd qoyacaq. Sonra geri dönəcəm və deyəcəm: “Ya Rəbb! Atəşdə Quranın həbs etdiklərindən və əbədi qalmağın üzərilərinə vacib olduğu kəslərdən başqa heç kəs qalmadı.”**

Sonra peyğəmbər, *salləllahu aleyhi va səlləm*, yuxarıda əl-Buxarinin “İman” kitabında nəql etdiyi sözləri deyir:

يخرج من النار من قال: لا إله إلا الله، وكان في قلبه من خير ما يزن شعيرة...

**“Lə iləhə illə Allah” deyən və qəlbində arpa dənəsi ağırlığında iman olan hər kəs atəşdən çıxarılacaq...”**[264]

---

[264] əl-Buxari, (6565, 7410); Muslim, (193); Əbu Nueym, "**əl-Mustəxrac**", (478-480) və müxtəsər şəkildə: (481); Əbu Avanə, “**əl-Mustəxrac**”, 1/178-179; ən-Nəsai, “**əl-Kubra**”, müxtəsər (10984) və tam şəkildə (11243, 11433); İbn Macə, (4312); İbn Hibban, müxtəsər (7484) və tam şəkildə (6464); ət-Tayalisi, müxtəsər (1966, 2010); Əhməd (12153) və müxtəsər (12772, 13928, 13929); Abd bin Humeyd, “**əl-Muntəxab**”, (1170) və (1184); İbn Əbi Asim, “**əs-Sunnə**”, (805, 810, 825, 831, 875, 877); İbn Əbi Şeybə, 6/312-313 (31668); Əbu Yalə, (2899, 2927, 2955, 2956, 2993, 3064, 3273) və müxtəsər (2977); əl-Xalləl, “**əs-Sunnə**”, müxtəsər 5/52 (1590); İbn Xuzeymə, “**ət-Təvhid**”, 2-ci cild/ (352) və müxtəsər (353, 354, 355); ət-Tahavi, “**əl-Muşkil**”, (5556); əl-Mərvazi, “**əs-Salət**”, (262, 263, 264); İbn Məndə, “**əl-İmən**”, 2/834 (864, 865) və müxtəsər (868, 869, 870, 871, 872); əl-Beyhəqi, “**əl-Əsma vas-Sifət**”, 1/487 (417) və 2/118 (684) və “**Şuab əl-İmən**”, 1/285 (308) və “**əl-İtiqad**”, səh: 249-250; əl-Bəğavi, “**Şərh əs-Sunnə**”, 15/160 (4334) və müxtəsər 15/191 (4358) və “**Təfsir əl-Bəğavi**”, 3/204; əl-Laləkay, (2061);

Yenə bir başqa ləfz ilə Ənəsdən rəvayət olunur. Hafs bin Ömər, Hişamdan, o da Qatadədən, oda Ənəsdən peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, belə dediyini rəvayət etmişdir:

ليصيبن أقوامًا سفع من النار، بذنوب أصابوها، عقوبة، ثم يدخلهم الله الجنة بفضل رحمته، يقال لهم: الجهنميون

**"Etdikləri günahlara görə bəzi qövmlər atəşdə qaralana qədər yanacaqlar. Daha sonra Allah rəhmətinin genişliyi ilə onları Cənnətə daxil edər. Onlara isə "cəhənnəmiyyun" deyiləcəkdir."**[265]

Ə - əl-Həsən, Ənəsdən mərfu olaraq rəvayət etmişdir. Bu hədisdə isə bu sözlər keçir:

حتى أقول: رب شفّعْني فيمن قال: لا إله إلا الله، قال: فيقول: ليست هذه لك يا محمد، إنما هي لي، أما وعزتي، وحلمي، ورحمتي؛ لا أدع في النار أحدًا -أو قال عبدًا- قال: لا إله إلا الله"

**"Deyəcəm: "Rəbbim! "lə iləhə illə Allah" deyənlərə şəfaət et!" Dedi: "Allah deyəcək: "Ey Muhamməd! Bu sənə aid deyil. Həqiqətən bu mənə aiddir. İzzətimə, Həlimliyimə və Rahmətimə and olsun ki, atəşdə "lə iləhə illə Allah" deyən heç kəsi – və ya heç bir qulu buraxmayacam."**[266]

İbn Xuzeymənin rəvayət etdiyi digər hədisdə isə buna yaxın ləfz ilə gəlmişdir. Sənədindəki əl-Həsən tədlis edir. Lakin

---

əl-İsbəhani, "**əl-Huccə**", 2/394 (401)

[265] əl-Buxari, (7450); Əhməd, (401, 402, 406, 416); ət-Tahavi, "**əl-Muşkil**", (5663, 5664); İbn Məndə, "**əl-İmən**", 2/867 (920); əl-Bəğavi, (4350)

[266] Əbu Yalə, (2786); İbn Əbi Asim, "**əs-Sunnə**", (828); İbn Xuzeymə, 2/610-611 (355)

bundan əvvəl buna bənzər hədis zikr olunmuşdu və hədis bununla həsəndir. Eləcədə Şeyx əl-Albani hədisin səhih olduğuna hökm etmişdir.

**F** – Mutamər bin Suleyman, öz atasından, o da Ənəsdən, Qatadənin hədisinə bənzər bir hədis rəvayət edir. Bu hədisdə də "cəhənnəmiyyun" zikr olunmuşdur.[267]

Eləcədə Mutamər bin Suleyman, Humeyddən və o da Ənəsdən rəvayət etmişdir. Bu hədisdə də zikr olunur ki, "**onlara "cəhənnəmiyyun" deyiləcək...**".[268]

Bunun sənədi həsəndir. Bunun həsən olduğunu Şeyx Muqbil bin Hadi əl-Vadi "əş-Şəfaəh" əsərində zikr edir.[269] Eləcədə Şeyx əl-Albani hədisin səhih olduğunu demişdir.

**G** – Tarif Əbu Sufyan əl-Ataradi, Abdullah bin əl-Harisdən, o da Ənəsdən mərfu olaraq rəvayət etmişdir.[270] Lakin Tarif mətruk bir ravidir.

**H** – İbn Əbi Asim dedi: Bizə əl-Miqdami rəvayət etdi: bizə Muslim bin İbrahim rəvayət etdi, Əbu əl-Xattab bizə Ənəsdən, o da peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, rəvayət etdi:

إذا أخرج الله أهل النار من النار، بشهادة أن لا إله إلا الله، تمنى آخرون لو كانوا مسلمين

---

[267] İbn Əbi Asim, (847); İbn Xuzeymə, (178); əl-Beyhəqi, "**əş-Şuab**", 1/286 (309)

[268] İbn Xuzeymə, 2/716-717 (458); İbn Məndə, "**əl-İmən**", 2/844 (874); İbn Əbi Asim, "**əs-Sunnə**", (716, 817)

[269] "**əş-Şəfaəh**", səh: 170 (104)

[270] ət-Tabərani, "**əl-Əvsat**", (3976) və "**əs-Sağir**", (875)

**“Cəhənnəm əhlindən olan, lakin “Lə iləhə illə Allah” deyərək şəhadət etmiş kəsləri Allah atəşdən çıxardıqda, orda olan digərləri arzu edəcəklər ki, kaş ki, müsəlman olardılar.”**[271]

Əbu əl-Xattabən adı Hərb bin Məymundur və o, əvvəl də söylədiyimiz kimi saduqdur. Lakin Ənəsdən hədis eşitməmişdir. Əvvəldə zikr etdiyimiz kimi o, Nadrdən, o da Ənəsdən rəvayət edir. Əl-Miqdəmi isə tədlis əhlindəndir. Doğrusunu Allah bilir!

**X** – Əbu Yalə dedi: bizə Abdulğaffər bin Abdullah rəvayət etdi: Əbu Şihəb bizə Aməşdən, o da Yezid ər-Raqqaşidən, o da Ənəsdən, o da peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, rəvayət edir:

أقرع باب الجنة، فيفتح باب من ذهب، وحلقة من فضة...

**“Cənnətin qapısını döyəcəm və qızıldan olan qapı açılacaq və halqası da gümüşdəndir...”**

...ثم أرفع رأسي، فأقول: أمتي، فيقال لي: لك من قال: لا إله إلا الله مخلصًا"

**“Sonra başımı qaldıracam və deyəcəm: “Ümmətim!” Mənə deyiləcək: “İxlas ilə “lə iləhə illə Allah” deyənlər sənindir...”**[272]

Abdulğaffər dəlil sayıla biləcək bir ravi deyildir və Yezid ər-Raqqaşi zəifdir.

[271] İbn Əbi Asim, (870)

[272] Əbu Yalə, (4130, 4137)

İ – Cusə bin Ubeyd, Ənəsdən mərfu olaraq rəvayət etmişdir. Bu hədisdə də insanların peyğəmbərlərin yanına getməsi, peyğəmbərimizin, salləllahu aleyhi va səlləm, Rəbbinə səcdə etməsi, bir neçə dəfə şəfaətdən sonra qəlbində zərrə qədər iman olan kəslərə də şəfaət etməsi və Cəhənnəmdə xeyir sahibi heç kəsin qalmadığı zikr olunmuşdur.[273]

Şeyx Muqbil bin Hədi əl-Vadi hədisin sənədinin gevşəkliyinə hökm etmişdir.[274] Əl-Hafiz ibn Kəsir isə "ən-Nihayə əl-Fitən əl-Məlahim" əsərində isə bunu Muhamməd bin Əclanın, Cusə bin Ubeyd əl-Mədinidən rəvayət yolu ilə əl-Bəzzara istinad etmişdir. Əl-Hafiz ibn Kəsir, rahiməhullah, deyir:

ثم قال: لم يرو عن جوثة بن عبيد إلا ابن عجلان

**"Sonra (əl-Bəzzar) dedi: "Bunu İbn Əclandan başqa heç kəs Cusə bin Ubeyddən rəvayət etməmişdir."**[275]

İbn Xuzeymədəki digər rəvayətdə isə (2/720-722) atəşdən çıxanlara "cəhənnəmiyyun" deyiləcəyi zikr olunur.

J – Yezid bin Əbi Saleh, Ənəs bin Maliki belə deyərkən eşitmişdir: Allahın Elçisi, *salləllahu aleyhi va səlləm*, dedi:

"يدخل أقوام من أمتي النار -أو قال: جهنم- حتى إذا كانوا حممًا؛ أُدْخِلوا الجنة، فيقول أهل الجنة: من هؤلاء؟ فيقول: هؤلاء الجهنميون

**"Ümmətimdən bir sıra qövmlər atəşə - və ya dedi: cəhənnəmə - daxil olacaqlar. Orada kömür kimi yandıqdan sonra Cənnətə**

---

[273] İbn Xuzeymə, "**ət-Təvhid**", (459)

[274] "**əş-Şəfaəh**", səh: 172 (104)

[275] "**ən-Nihayə əl-Fitən əl-Məlahim**", 2/319

**daxil olacaqlar və Cənnət əhli soruşacaq: "Bunlar kimdir?" Deyəcək: "Bunlar "cəhənnəmiyyun"dur."**[276]

Bu hədisin sənədi səhihdir. Yezid bin Əbi Salehin adı Əbu Həbib əd-Dəbağdır və o, siqa bir ravidir.[277]

**K** – Əl-Heysəm bin Cəmil dedi: bizə Huzeyl bin Biləl əl-Mədəini xəbər verdi: Said bin Abdurrahmən əz-Zubeydi bizə Ənəsdən rəvayət etdi...(və hədisin mətni)[278] Huzeyl gevşək bir ravidir.[279] İbn Abdurrahmən isə dəlil sayıla biləcək bir ravi deyildir. Onun adı Əbu Şeybə əl-Kufidir və o, Ənəs ilə görüşməmişdir.

## 4. İmran bin Huseynin, *radiyallahu anhu*, hədisi:

**A** - əl-Həsən bin Zəkvan dedi: bizə Əbu Rica rəvayət etdi: İmran bin Huseyn bizə peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, rəvayət etdi: **"Muhamməddin şəfaəti ilə bir qövm atəşdən çıxarılacaq və Cənnətə daxil olacaqlar və onlara "cəhənnəmiyyun" deyiləcək."**[280]

---

[276] Əhməd, (12897, 13678); İbn Mubarək, "**əz-Zuhd**", (1267); İbn Xuzeymə, (424)

[277] "**əl-Cərh va ət-Tadil**", 9/272

[278] İbn Mubarək, "**əz-Zuhd**", (1271);

[279] "**əl-Cərh va ət-Tadil**", 9/113

[280] əl-Buxari, (6566); Əbu Davud, (4740); ət-Tirmizi, (2600); İbn Macə, 2/1443 (4315); Əhməd, (19897); əl-Bəzzar, "**əl-Bəhr əz-Zəxxar**", (3585, 3586); əl-Acurri, "**əş-Şəriah**", (800); əl-Beyhəqi, "**əl-İtiqad**", səh: 251; əl-Bəğavi, "**Şərh əs-Sunnə**", (4351)

## 5. **Abdullah ibn Məsudun, *radiyallahu anhu*, hədisi:**

**A** – İbrahim bin Ubeydə, Abdullah ibn Məsuddan, o da peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, rəvayət edir:

إنِّي لأعلم آخر أهل النار خروجًا منها، وآخر أهل الجنة دخولاً: رجل يخرج من النار حبوًا، فيقول الله: اذهب، فادخل الجنة، فيأتيها، فيخيل إليه أنها ملأى، فيرجع، فيقول: يارب، وجدتها ملأى، فيقول: اذهب، فادخل الجنة، فيأتيها، فيُخَيَّل إليه أنها ملأى، فيرجع فيقول: وجدتها ملأى، فيقول: اذهب، فادخل الجنة، فإن لك مثل الدنيا، وعشرة أمثالها -أو إن لك مثل عشرة أمثال الدنيا- فيقول: تسخر مني -أو تضحك مني- وأنت الملك؟" فلقد رأيت رسول الله ضحك، حتى بدت نواجذه، وكان يقول: "ذلك أدنى أهل الجنة منْزلةً".

“ **Mən Cəhənnəmdən çıxacaq cəhənnəm əhlinin sonuncusunu və cənnət əhlindən Cənnətə daxil olacaq sonuncu insanı tanıyıram. Bir kişi atəşdən sürünərək çıxacaq və Allah ona deyəcək: “Get və Cənnətə daxil ol!” Ora gedəcək, lakin ona elə gələcək ki, ora doludur. Geri dönəcək və deyəcək: “Oranın dolu olduğunu gördüm.” Allah deyəcək: “Get və Cənnətə daxil ol!” Ora gedəcək, lakin ona elə gələcək ki, ora doludur. Geri dönəcək və deyəcək: “Oranın dolu olduğunu gördüm.” Allah deyəcək: “Get və Cənnətə daxil ol! Dünya qədəri və on dəfə ondan çoxu sənə aiddir – və ya sənə on dünya qədəri aiddir.” O kəs deyəcək: ”Sən, əl-Malik olduğun halda məni ələ salırsanmı?” (İbn Məsud deyir: ) Allahın Elçisinin gülümsəyərkən gördüm, hətta dişləri görünürdü və dedi: “Bu, Cənnət əhlinin ən aşağı dərəcəsidir.”**[281]

**B** – Həməd dedi: Sabit bizə Ənəsdən, o da İbn Məsuddan mərfu olaraq rəvayət etdi: “**Cənnətə daxil olacaq axırıncı kəs....**” və bu hədisdə artıq aldığından çox istəməyəcəyinə dair

[281] əl-Buxari, (6571); Muslim, (186); İbn Hibban, 16/448 (7427);

Allahla əhd kəsən və Cəhənnəmdən sonuncu çıxan və Cənnətə sonuncu daxil olan kəs zikr olunmuşdur.[282]

**C** – İbn Əbi Zəmaneynin İbn Məsuddan rəvayət etdiyi digər hədisdə isə cəhənnəm əhlinin atəşə düşmüş tövhid əhlinə tənə etmələri zikr olunmuşdur. Daha sonra Allah onları atəşdən çıxarar və Cənnətə daxil edər və atəş əhli isə müsəlman olmaqlarını arzu edərlər.[283] İsnadında Osman bin Abdurrahmən bin Ömər bin Said bin Əbi Vaqqas vardır və İbn Main onun mətruk və yalançı olduğunu demişdir.

**Ç** – İbn Xuzeymə, İmam Əhməd, İbn Əbi Asim və İmam əl-Laləkay, İbn Məsuddan mərfu olaraq başqa bir hədisi təxric ediblər:

يكون في النار قوم ما شاء الله أن يكونوا، ثم يرحمهم الله، فيخرجهم، فيكونون في أدنى الجنة، فيُغْسَلون في نهر يقال له: الحيوان، يسميهم أهل الجنة: الجهنميين،

**“Allah dilədiyi kəsləri atəşə salacaq və sonra Allah onlardan (bir hissəsinə) rəhm edəcək və onları ordan çıxaracaq. Onlar Cənnətin ən alt yerində olacaqlar və “əl-Həyvan” adı verilən çayda yuyunacaqlar. Cənnət əhli onlara “cəhənnəmiyyun” deyəcək.”**[284]

Həməd bin Səlimə bunu Ata bin əs-Səibdən rəvayət edir və onun Atadan rəvayətlərinin salimliyi sabit deyildir. Doğrusunu Allah bilir.

---

282 Muslim, (187)

283 İbn Əbi Zəmaneyn, “**Usul əs-Sunnə**”, (102)

284 İbn Xuzeymə, 2/757 (486); Əhməd, 1/454; İbn Əbi Asim, 2/402; əl-Laləkay, (2070)

**D** – Digər bir rəvayət yolu ilə Əbu Hənifə, Səlimə bin Kuheyldən, o da İbn Məsudun əshabından olan Əbu Zahradan peyğəmbərin, *salləllahu aleyhi va səlləm*, belə dediyini rəvaət edir:[285] **"İman əhli mənim şəfaətim ilə atəşdən çıxacaqlar, ta ki, orada bu ayənin əhlindən başqa heç kəs qalmayacaq..."** və daha sonra bu ayələri oxuyur:

**Sizi Səqərə salan nədir?**
**Onlar deyəcəklər: "Biz namaz qılanlardan deyildik.**
**Kasıbı da yedizdirməzdik.**
**Batil sözlər danışanlarla birlikdə biz də danışardıq,**
**və ölüm yəqinliyi bizə gələnə qədər Haqq-hesab gününü yalan hesab edərdik ."**[286]

Lakin bu hədis zəifdir. Əbu Hənifə görkəmli bir alim olsa da, hafizəsində zəiflik vardır. Əbu Zəhraya gəldikdə isə əl-Acli və İbn Said kimi alimlər onu siqa saydıqları halda, əl-Buxari demişdir: **"Onun hədisinə tabe olunmaz..."** əl-Buxari isə bu elmdə əl-Aclidən və İbn Saiddən daha etibarlı bir alimdir. İbn əl-Mədəni isə deyir: **"Səlimədən başqa ondan heç kəs rəvayət etmir, onun kimisi dəlil hesab edilməz."**

Eləcədə əl-Vahidi bunu Xalid əl-Həzaidən, o da Səlimədən, o da Əbu Zəhradan və o isə İbn Məsuddun yuxarıdakına bənzər bir hədisi rəvayət etmişdir. Lakin burada Cəbrayılın və sonra İbrahimin, Musanın və İsanın və sonra peyğəmbərimizin və daha sonra isə sıddıqların və şəhidlərin şəfaəti zikr olunmuşdur. Sonunda isə yuxarıda zikr etdiyimiz mübarək ayələrin həbs etdiyi kəslərdən başqa heç kəsin atəşdə qalmadığı söylənilməkdədir.[287] Əbu Zəhra haqqında sözümüzü dedik və eləcədə hədisdəki tərtib şazdır. Çünki məşhur olan budur ki, ilk

---

[285] "**Musnəd Əbi Hənifə**", 1/166
[286] əl-Muddəssir, 42-47
[287] əl-Vahidi, "**əl-Vasit**", 4/387

olaraq möminlər və daha sonra peyğəmbərlər şəfaət edəcəklər.

### 6. **Cabir ibn Abdullahın, *radiyallahu anhu*, hədisi:**

**A** – Zuheyr bin Muaviyyə, Əbu Zubeyrdən, o da Cabir dən, o isə peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, rəvayət edir:

إذا مُيِّز أهل الجنة وأهل النار، دخل أهل الجنة الجنة، وأهل النار النار؛ قامت الرسل، فشفعوا، فيقال: اذهبوا، فمن عرفتم في قلبه مثقال قيراط من إيمان؛ فأخرجوه، فيخرجون بشرًا كثيرًا، ثم يقال: اذهبوا، فمن عرفتم في قلبه مثقال خردلة من إيمان؛ فأخرجوه، فيخرجون بشرًا كثيرًا، فيقول جل وعلا: أنا الآن أخرج بنعمتي ورحمتي -وفي رواية: بعلمي ورحمتي-، فيخرج أضعاف ما أخرجوا وأضعافهم، قد امتحشوا ..."

**“Cənnət əhli ilə Cəhənnəm əhli ayrıldıqdan sonra, Cənnət əhli Cənnətə və Cəhənnəm əhli isə Cəhənnəmə daxil olacaqlar. Sonra peyğəmbərlər durub şəfaət edəcəklər və onlara deyiləcək: “Gedin, qəlbində bir barmaq ucu ağırlığında iman olduğunu bildiyiniz hər kəsi ordan çıxarın və çoxlu insan çıxarırlar. Sonra yenə deyiləcək: Qəlbində xardal ağırlığında iman olduğunu bildiyiniz kəsləri ordan çıxarın və yenə çoxlu insan çıxaracaqlar. Sonra Allah Cəllə və Alə deyəcək: “İndi Mən Nemətim və Rahmətim ilə - bir başqa rəvayətdə Elmim və Rahmətim ilə - indiyə qədər çıxarılanlardan da çox çıxaracağam.” Onlardan çoxu yanmış halda olacaqlar...”**[288]

İşarə etdiyimiz digər rəvayəti isə əl-Bəğavi nəql edir. İmam Əhməddə isə iki rəvayətdən biri müxtəsər şəkildə rəvayət edilmişdir və burda Allahın Öz Rahməti ilə atəşdən çıxarması

---

[288] İbn Hibban, (183); əl-Bəğavi, "**Musnəd Əli ibn əl-Cad**", (2639, 2643, 2654); Əhməd, (14491) və müxtəsər (15048)

zikr olunmur.

Bu ləfz ilə gələn hədisi Əbu Zubeyr, Cabirdən ananə ilə rəvayət etmişdir və Əbu Zubeyr mudəllisdir[289]. Lakin əl-Hafiz ibn Hacər və Siddiq Xan, "**Mən Öz Elmim və Rahmətim ilə çıxaracam...**" ləfzi ilə gələn rəvayəti Muslimə istinad etmişlər.[290] Muslimdə bu ləfz ilə rəvayətə rast gəlmədim. Doğrusunu Allah bilir!

Digər tərəfdən Əbu Zubeyrdən gələn başqa rəvayətdə o, deyir: Cabirdən soruşdum: ..." və daha sonra hər bir ümmətin öz ibadət etdiklərinə tabe olması, münafiqlərin nurunun sönməsi və sonra şəfaət və atəşdən "lə iləhə illə Allah" deyən və qəlbində arpa dənəsi ağırlığında iman olan hər kəsin çıxarılacağı zikr olunur.[291]

**B** – Əbu Asim Muhamməd bin Əbi Əyyub dedi: Yezid əl-Faqir bizə rəvayət etdi:

كنت قد شغفني رأى الخوارج، فخرجنا عصابة ذوى عدد، نريد أن نحج، ثم نخرج على الناس، قال: فمررنا على المدينة، فإذا جابر بن عبدالله يحدث القوم، -جالس إلى سارية- عن رسول الله، صلى الله عليه وسلم ، فإذا هو قد ذكر الجهنميين...

**"Xəvaricin rəyi məni çox təsirləndirmişdi və çox sayda bir qrup ilə həcc etmək üçün çıxdıq, daha sonra insanlara (bu**

---

[289] Mudəllis: Rəvayətlərində tədlis edən, yəni rəvayət etdiyi zəif ravinin adını zikr etməz və bununla hədisin sənədinin güclü olması təsəvvürü yaradır. Beləki, bununla sanki öz şeyxindən rəvayət etdiyi təəssüratı oyanır.

[290] İbn Hacər, "**Fəth əl-Bəri**", 11/456; Siddiq Xan, "**Aun əl-Məbud**", 5/744

[291] Muslim, 1/177 (191); Əhməd, (14721, 15115); "**Təfsir ət-Tabəri**", 9/113; əd-Darimi, "**Radd aləl-Cəhmiyyə**", (185); əd-Dəraqutni, "**əs-Sifət**", (32) və "**ər-Ruya**", (59, 60)

**əqidəmizə dəvət etmək üçün) getdik. Dedi: “Mədinə şəhərindən keçməli olduq və Cabir bin Abdullah sütuna söykənmiş halda bir qrup insana Allahın Elçisindən, *salləllahu aleyhi va səlləm*, rəvayət edirdi və o, cəhənnəm əhlini zikr etdikdə....”**[292]

əl-Laləkay bunu Yezid bin Suheyb qıssası ilə rəvayət edir və Yezid bin Suheyb, əl-Fəqirdir. Lakin burada müşriklərin atəşdəki tövhid əhlinə qarşı tənə etmələri zikr olunur və bunu ət-Tabərani “əl-Əvsat”da 5146 rəqəmi altında təxric etmişdir və bunun sənədi dəlil sayılmaz. Muslimin rəvayətində isə bu ziyadə yoxdur.

**C** – Muhamməd bin Məzahim, Amr bin Dinardan, o da Cabirdən mərfu olaraq rəvayət etmişdir.[293] Muhamməd bin Məzahim, İbn Mucahid əl-Mərvazidir və bir şey deyildir.

**Ç** - əl-Aməş, Əbu Sufyandan, o da Cabirdən Allahın Elçisinin, *salləllahu aleyhi va səlləm*, belə dediyini rəvayət edir:

يُعذب ناس من أهل التوحيد في النار، حتى يكونوا فيها حممًا، ثم تدركهم الرحمة، فيخرجون، فيطرحون على أبواب الجنة، فَيَرُشُّ عليهم أهلُ الجنة الماءَ، فينبتون، كما تنبت الغُثاء في حمالة السيل، يدخلون الجنة".

**“Tövhid əhlindən bir qrup insan atəşdə əzaba düçar olacaqlar, yanaraq kömür olacaqlar. Sonra onlara Allahın rahməti yetişəcək və onlar ordan çıxacaqlar. Onları Cənnət qapılarına gətirəcəklər və cənnət əhli onların üzərinə su tökəcək. Sel yatağında otların bitdiyi kimi bitəcəklər və Cənnətə daxil**

---

[292] Muslim, (191); əl-Laləkay, (2052)
[293] əl-Laləkay, (2049)

**olacaqlar.”**[294]

Bu hədisin sənədindəki ravilər siqadır.

### 7. **Əbu Bəkr əs-Siddiqin, *radiyallahu anhu*, hədisi:**

A – Əbu Niamə əl-Adəvi dedi: Əbu Huneydə əl-Bəra bin Nəufəl bizə Valən əl-Adəvidən, o da Huzeyfədən, o da Əbu Bəkrdən peyğəmbərin, salləllahu aleyhi va səlləm, sözlərini rəvayət etdi. Hədisdə insanların peyğəmbərlər getməsi, onlardan şəfaət diləməsi, peyğəmbərin səcdə etməsi zikr olunur və eləcədə deyilir:

ثم يُقال: ادع الصديقين، فيشفعون، ثم يقال: ادع الأنبياء، فيجئ النبي معه العصابة، والنبي معه الخمسة والستة، والنبي ليس معه أحد، ثم يقال: ادع الشهداء، فيشفعون لمن أرادوا، فإذا فعلت الشهداء ذلك؛ يقول الله جل وعلا: أنا أرحم الراحمين، أدخلوا جنتي من كان لا يشرك بي شيئًا، فيدخلون الجنة، ثم يقول الله تعالى: انظروا في النار، هل فيها من أحد عمل خيرًا قط؟ فيجدون في النار رجلاً، فيقال له: هل عملت خيرًا قط؟ فيقول: لا، غير أني كنت أسامح الناس في البيع، فيقول الله: اسمحوا لعبدي، كإسماحه إلى عبيدي، ثم يخرج من النار آخر، يقال له: هل عملت خيرًا قط؟، فيقول: لا، غير أني كنت أمرت ولدي إذا مت، فأحرقوني بالنار، ثم اطحنوني، حتى إذا كنت مثل الكحل؛ فاذهبوا بي إلى البحر، فذروني في الريح، فقال الله: لم فعلتَ ذلك؟ قال: مِنْ مخافتك، فيقول: انظروا إلى مُلْكِ أعظم مَلِكٍ، فإن لك مثله، وعشرة أمثاله، فيقول: لم تسخر بي، وأنت الملك؟

**“Sonra deyiləcək: “Sıddıqları çağırın ki, şəfaət etsinlər!” Sonra deyiləcək: “Peyğəmbərləri çağırın!” Bir peyğəmbər gələcək və yanında bir qrup insan olacaq və bir başqa peyğəmbər isə beş-altı nəfər ilə gələcək. Elə peyğəmbər**

---

[294] Hunəd, "**əz-Zuhd**", (206); Tirmizi, 4/713 (2600); əl-Bəğavi, "**Şərh əs-Sunnə**", 5/191 (4359)

olacaq ki, yanında heç bir nəfər belə olmayacaq. Sonra deyiləcək: "Şəhidləri çağırın ki, istədiklərinə şəfaət etsinlər!" Şəhidlər də bunu etdikdən sonra Allah Cəllə va Alə deyəcək: "Mənin rəhimlilərin Ən Rəhimlisiyəm! Mənə heç bir şeyi şərik qoşmayanları Cənnətə daxil edəcəm" və onlar Cənnətə daxil olurlar və sonra Allahu Təalə deyəcək: "Cəhənnəmə baxın və görün orda xeyir bir əməl etmiş biri varmı?" Orda bir nəfər tapacaqlar və ondan soruşulacaq: "Xeyir bir əməl etdinmi?" Həmin adam deyəcək: "Xeyr! Lakin mən alış-veriş zamanı insanlara çox bağışlayardım (göz yumardım)! Allah deyəcək: Qullarıma bağışladığı kimi, Mən də quluma bağışlayıram!" Sonra cəhənnəmdən bir başqası çıxarılacaq və ona deyiləcək: "Xeyir bir əməl etmisənmi?" Adam deyəcək: "Xeyr, lakin mən öz övladıma əmr etmişdim ki, mən öldükdən sonra məni atəşdə yandırsın və sonra ovaraq kül etsinlər, sonra məni bir çaya aparsınlar və məni küləyə səpsinlər!" Allah deyəcək: "Bunu nə üçün etdin?" Adam deyəcək: "Sənin qorxundan!" Ona deyəcək: "Ən Əzəmətli Mülk Sahibinin mülkünə bax və gördüyün qədər və onun on misli sənindir." Adam deyəcək: "Mülk Sahibi olduğun halda mənimlə nə üçün əylənirsən?!"[295]

Əbu Niamənin adı Amr bin İsa bin Suveyd bin Hubeyrə əl-Basridir. Əhməd dedi: "**Siqadır, lakin ölümündən əvvəl ixtilata düşmüşdür.**" İbn Main və ən-Nəsai də onu siqa saymışlar. Əbu Hatim dedi: "**Onda heç bir bəis yoxdur.**" İbn Said dedi: "**Zəif olmuşdur**." Əl-Acli və İbn Hibban isə siqa olduğuna hökm etdilər. Əl-Hafiz İbn Hacər isə onun

---

[295] İbn Xuzeymə, "ət-Təvhid", (468); İbn Hibban, "**əs-Sahih**", (6476); Əbu Avanə, 1/175-178; əd-Darimi, "**ər-Radd aləl-Cəhmiyyə**", (181); Əhməd, (15); İbn Əbi Asim, "**əs-Sunnə**", (769, 833); əl-Bəzzar, "**əl-Bəhr əz-Zəxxar**", 1/149-151 (76); əl-Mərvazi, "**Müsnəd Əbi Bəkr**", (15, 16); Əbu yalə, (56,57); əd-Dəvləbi, "**əl-Kunyə**", 2/155-156; İbn əl-Cəvzi, "**əl-İləl əl-Mutənəhiyyə**", 2/920 (1539);

tərcüməsində dedi: “**Saduqdur, hafizəsi korlanmışdı.**”[296] Belə olduqda bu ravinin tək rəvayətlərinə etibar edilməz.

Əbu Huneydənin isə “ət-Tacil əl-Mənfəah” əsərindəki tərcüməsi dəlalət edir ki, onunla dəlil gətirilməz.

Valən əl-Adavi isə İbn Buheysdir və İbn Qurfə olduğu da deyilmişdir. Onun üzərində ixtilaf edilmişdir. İbn Main siqa olduğunu söyləmiş[297], əd-Dəraqutni isə demişdir:

ووالان غير مشهور، إلا في هذا الحديث، والحديث غير ثابت

**“Valən isə məşhur deyildir, yalnız bu hədis istisnadır və bu hədis də sabit deyildir.”**[298]

İbn Mainin ravinin halından cahil olması mümkündür. İbn Hibban isə bu barədə deyir:

هذا من أشرف الحديث، وقد روى هذا الحديث عدة عن النبي ، صلى الله عليه وسلم، نحو هذا، منهم حذيفة وابن مسعود وأبوهريرة وغيرهم

**“Bu ən şərəfli hədislərdəndir, çünki buna bənzər hədisləri peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, bir çoxu rəvayət etmişdir. Onların içində Huzeyfə, İbn Məsud, Əbu Hureyrə və digərləri vardır...”**[299]

İbn Hibbanın sözlərində problem vardır. Şəfaət barədə hədislər şahid kimi görünə bilər, lakin həqiqətdə bu hədisin mətni şazdır. Çünki səhih tərtib üzərində zikr olunmamışdır. İbn Hacər, *rahiməhullah*, “əs-Səhih”in şərhində “Kitəb ər-Rəqaiq” fəslində deyir:

---

[296] ”**Təhzib ət-Təhzib**”, 8/87
[297] ”**əl-Cərh va ət-Tadil**”, 9/43
[298] “**əl-İləl**”, 1/190-191 (sual: 14)
[299] ”**Səhih İbni Hibban**”, 14/396

وسيأتي التنبيه عليه في الشفاعة -إن شاء الله تعالى-، ويتبين شذوذ هذه الرواية من حيث المتن، كما ظهر شذوذها من حديث السند

**“Şəfaət mövzusunda – inşə Allahu Təalə - bu barədə xəbərdarlıq gələcək və bu rəvayətin mətn tərəfdən şaz olduğu izah olunacaqdır, necəki bunun şaz olması sənədindən görünür.”**[300]

Bununla hədisdəki problemin nə olduğu aydınlaşır.

## 8. İbn Abbasın, *radiyallahu anhu*, hədisi:

Həməd bin Səlimə, Ali bin Zeyd bin Cədandan, o da Əbu Nadradan rəvayət etdi: Dedi: “İbn Abbas bizə xütbə verdi...” Burda insanların peyğəmbərlərə yönəlməsi və Muhamməd, salləllahu aleyhi va səlləm, qəlbində fulan və fulan ağırlığında iman olan kəsləri atəşdən çıxarması zikr olunmuşdur.[301]

İbn Cədan zəifdir. Lakin Həməd bin Səlimənin ondan rəvayətinin qəbul olunduğu da söylənilmişdir. Hər bir halda hədisin mənası səhihdir.

İbn Abbasdan yenə başqa yerdə həm sənəd, həm də ləfz ilə İmran bin Huseynin hədisi rəvayət olunmuşdur.[302]

## 9. Salmanın, *radiyallahu anhu*, məvquf olaraq rəvayəti:

---

300 “**Fəth əl-Bari**”, (bab xauf min Allah), 11/313

301 ət-Tayalisi, (2711); Əhməd, (2546, 2692); İbn Əbi Şeybə, ”**Kitəb əl-Arş**”, (46); Əbu Yalə, (2328); əl-Beyhəqi, “**əd-Dələil**”, 5/481;

302 İbn Xuzeymə, ”**ət-Təvhid**”, (408)

Əbu Muaviyyə dedi: Asim əl-Əhval bizə Əbu Osman ən-Nəhdidən, o da Salmandan rəvayət etdi və rəvayətdə günəşin yerə yaxınlaşması, insanların peyğəmbərlərə yönəlmələri və peyğəmbərimizin, *salləllahu aleyhi va səlləm*, şəfaət etməsi və məqami mahmud zikr olunur.[303]

Bu sənədin raviləri siqadır və İbn Hacər hədisin məvquf səhih olduğunu deyir.[304]

Bu mövzu haqqında şəxsi fikir bildirmək caiz deyildir və bunun Salmanın öz şəxsi fikri olması doğru deyildir. Əgər bunu israiliyyatdan nəql edibsə, bunun doğru olması barədə yuxarıda çoxlu dəlillər zikr olunmuşdur.

## 10. **Əbu Bəkrənin, *radiyallahu anhu*, hədisi:**

Said bin Zeyd dedi: Əbu Süleyman əl-Asrini dinlədim: Uqbə bin Səhman mənə rəvayət etdi: Əbu Bəkrənin peyğəmbərdən, *salləllahu aleyhi va səlləm*, rəvayət etdiyini eşitdim:

...قال: فيتحنن الله برحمته على من يشاء، قال: ثم يؤذن للملائكة والنبيين والشهداء أن يشفعوا، فيشفعون، ويُخرجون، ويشفعون، ويخرجون من كان في قلبه ما يزن ذرة من إيمان"

**“...Dedi: Allah dilədiyi kəsə şəfqət göstərəcək. Dedi: Sonra mələklərə, peyğəmbərlərə və şəhidlərə şəfaət etməyə izn verəcək. Onlar şəfaət edəcəklər və (atəşdən) çıxaracaqlar və şəfaət edəcəklər və qəlbində zərrə ağırlığında iman olan hər**

---

303 İbn Xuzeymə, 2/706-707 (450); İbn Əbi Şeybə, 6/312 (31666); Abdurrazzaq, (20850); İbn Əbi Asim, (834); ət-Tabərani, “**əl-Kəbir**”, (6117)

304 “**Mətalib əl-Aliyyə**”, 4/388

**kəsi çıxaracaqlar."**[305]

Əl-Bəzzarın ikinci rəvayətində "**Allah dilədiyi kəsi xilas edəcək...**" şəklində gəlmişdir. Əl-Bəzzar ilk rəvayəti təxric etdikdən sonra deyir:

لا نعلم أحدًا يرويه عن رسول الله صلى الله عليه وسلم غير أبي بكرة بهذا اللفظ :

**"Əbu Bəkrədən başqa Allahın Elçisindən, *salləllahu aleyhi va səlləm*, bu ləfz ilə rəvayət edən birini tanımırıq."**

Said bin Zeyd saduqdur, lakin xətaları çoxdur. Əbu Süleymanı isə İbn Main siqa saymışdır.[306] Beləliklər hədisin sənədin gevşəklik olduğu ortaya çıxır.

Eləcədə mətni sabit deyildir, çünki sabit olan əvvəlki rəvayətlərdən də gördüyümüz kimi sonuncu atəşdən çıxarılanlar məxluqatın şəfaətindən sonra atəşdə qalanlar olacaqlar və onları Allah Öz Rahməti ilə çıxaracaq. Lakin bu hədis də isə sonuncu çıxarılanların məxluqatın şəfaəti ilə çıxacağı zikr olunur və bu, şaz bir mətndir.

## 11. Əbu Musanın, *radiyallahu anhu*, hədisi:

Xalid bin Nafi əl-Əşari, Said bin Əbi Bərdadən, o da Əbu Bərdadən, o da Əbu Musadan rəvayət edir:[307] Dedi: Allahın Elçisi, *salləllahu aleyhi va səlləm*, dedi:

---

[305] Əhməd, (20440); İbn Əbi Şeybə, 7/82 (34182); əl-Buxari, "**əl-Kunyə**", səh: 37; əl-Bəzzar, "**əl-Bərh əz-Zəxxar**", 4/122-123 (3671, 3697); əl-Xalləl, "**əs-Sunnə**", 5/47-48 (1581), 5/51 (1589); ət-Tabərani, "**əs-Sağir**", (929); əl-Xatib əl-Bağdadi, "**ət-Tarix**", 3/422

[306] "**əl-Cərh va ət-Tadil**", 9/380

[307] İbn Əbi Asim, "**əs-Sunnə**", (843); "**Təfsir ət-Tabəri**", 8/2;

إذا اجتمع أهل النار في النار، ومعهم من شاء الله من أهل القبلة، قال: الكفار: ألم تكونوا مسلمين؟ قالوا: بلى، قالوا: فما أغنى عنكم إسلامكم، وقد صرتم معنا في النار؟! قالوا: كانت لنا ذنوب، فأُخِذْنا بها، فيسمع الله عزوجل ما قالوا، فأمر بمن كان من أهل القبلة، فأُخْرِجوا، فلما رأى ذلك أهل النار، قالوا: ياليتنا كنا مسلمين، فنخرج كما خرجوا، قالوا: وقرأ رسول الله، صلى الله عليه وسلم:

الر تِلْكَ ءَايَاتُ الْكِتَابِ وَقُرْءَانٍ مُبِينٍ رُبَمَا يَوَدُّ الَّذِينَ كَفَرُوا لَوْ كَانُوا مُسْلِمِينَ

**“Cəhənnəm əhli Cəhənnəmdə toplandığı zaman, onlarla birlikdə qiblə əhlindən Allahın dilədiyi bəzi kəslər olacaq. Kafirlər deyəcəklər: “Məgər siz müsəlman deyilsiniz?” Deyəcəklər: “Bəli!” Kafirlər deyəcəklər: “Bəs sizi İslamınız nə üçün qurtarmadı? Bizimlə birlikdə atəşə düşmüsünüz! (Müsəlmanlar) deyəcəklər: “Günahlarımız var idi və bizi də özləri ilə götürdülər.” Allah Azzə və Cəllə onların sözünü eşidəcək və qiblə əhlindən olanları ordan çıxarmağı əmr edəcək. Cəhənnəm əhli bunu gördükdə deyəcəklər: “Kaş ki, biz də müsəlman olardıq və onların çıxdıqları kimi biz də çıxardıq!” Deyəcəklər: Bu yerdə Allahın Elçisi, salləllahu aleyhi va səlləm, bu ayəni oxuyacaq:**

**“Əlif. Ləm. Ra. Bunlar Kitabın və açıq-aydın Quranın ayələridir.**

**Kafirlər mütləq müsəlman olmalarını arzulayacaqlar.”**[308]

Bunu bu ləfz ilə İbn Əbi Asim təxric etmişdir. Lakin Xalid bin Nafi dəlil sayıla biləcək bir ravi deyildir.

Bununla belə Ənəsdən və Əbu Said əl-Xudridən də bənzər ləfzlər rəvayət olunmuşdur. Eləcədə ət-Təbəri və İbn Mubarək və əl-Acurri, Əbu Musanın hədisinə bənzər İbrahimdən, Mucahiddən və digərlərindən gələn əsəri də rəvayət ediblər.[309]

---

308 əl-Hicr, 1-2

309 İbn Mubarək, ”**əz-Zuhd**”, (1270); əl-Acurri, ”**əş-Şəriah**”, (775, 776)

Bütün bunlar hədisi qüvvətləndirir.

### 12. İbn Ömərin, *radiyallahu anhu*, hədisi:

İshaq ibn Abdullah, Said ibn Əbi Saiddən, o da İbn Ömərdən rəvayət etmişdir.[310] İshaq ibn Abdullah, İbn Əbi Fərqa adı ilə tanınır və o, mətrukdur.

### 13. Abdullah ibn Amrın, *radiyallahu anhu*, hədisi:

Osman bin Ömər dedi: Xaricə bin Musab bizə öz atasından, o da Abdullah bin Amrdan rəvayət edir.[311] Xaricə bin Musab isə mətruk ravidir.

### 14. Huzeyfənin, *radiyallahu anhu*, hədisi:

Abdurrahmən bin Mehdi, Hamməd bin Əbi Süleymandan, o da Rabidən, o da Huzeyfədən rəvayət edir:

ليدخلن الجنة قوم محشتهم النار، يدخلونها برحمة الله، وبشفاعة الشافعين

**"Atəşdə yanmış bir qövm Cənnətə daxil olacaqlar və onlar Allahın Rahməti və şəfaətçilərin şəfaəti ilə daxil olacaqlar."**[312]

Hamməd bin Əbi Süleyman dəlil sayılacaq bir ravi deyildir. Lakin bu hədisin üzərində ixtilaf edilmişdir. Şubə və

---

[310] əl-Acurri, "**əş-Şəriah**", (806)

[311] İbn Xuzeymə, (409)

[312] Əhməd, (23430, 23530, 23531) və "**əz-Zuhd**", (1266); İbn Əbi Şeybə, "**əl-Mətalib**", 5/116 (4554); İbn Əbi Asim, (835,836); əl-Acurri, "**əş-Şəriah**", (805); İbn Xuzeymə, (407); əl-Laləkay, (2080)

Hişam əd-Dəstəvai, Hamməddən və o da, Rabidən həm mərfu, həm də məvquf olaraq “**Allahın Rahməti**” sözünü zikr etmədən rəvayət edirlər. Hamməd bin Səlimənin isə Hamməddən rəvayətində həm “**Allahın Rahməti**”, həm də “**şəfaətçilərin şəfaəti**” sözü zikr olunmamışdır. İbn Mehdi isə bu sözləri zikr edərək rəvayət etmişdir. Bunların hamısı Hamməd bin Süleymandan rəvayət etmişdir və onun hafizəsində gevşəklik vardır. Lakin ət-Tayalisinin rəvayətində isə Həmmədi digər bir ravi Əbu Malik əl-Əşcai əvəz etmişdir.[313] Şeyx əl-Albani də bunun səhih olduğunu qeyd edir.[314]

Allahdan günahlarımıza görə məğfirət diləyirik!

Əbu İbrahim

[313] ət-Tayalisi, (419)

[314] ”**Ziləl əl-Cənnə fi Təxric əs-Sunnə**”, (836)